**Abdullayeva Güllü Bayram qızı**
Bakı Slavyan Universiteti
gullu.abdullayev.83@mail.ru

# BƏDİİ MƏTN TƏRCÜMƏÇİSİNİN YARADICILIQ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *tərcümə prosesi, sənətkar tərcüməçi, peşəkar tərcüməçi*
***Key words:*** *the translation process , artistic translator, professional translator*
***Ключевые слова:*** *переводческий процесс, заслуженный перевод профессиональный переводчик*

Tərcümə prosesinin mədəni kontekstlərin birləşdirilməsi kimi dərk edilməsi xüsusən bədii mətnin tərcüməsi baxımından aktualdır. Digər mətn növlərindən fərqli olaraq, bədii mətn hər şeydən əvvəl milli mədəniyyətin, yalnız sonra dilin fenomenidir. Bədii ədəbiyyat tərcüməçisinin fəaliyyəti, beləliklə, bədii nümunələri meydana gətirən və onları mənimsəyən mədəniyyətin təsirindən asılıdır.

Əvvəllər bədii tərcümə proses kimi nəzərdən keçirilərkən tərcüməçinin yaradıcılıq fəaliyyətinə diqqət yetirilirdi. Məhz onun istedadı, yaradıcı potensialı bədii tərcümə prosesində müvəffəqiyyətin əsası və təminatı hesab olunurdu. “Bədii tərcümə prosesi sənət deyil, yaradıcılıqdır” tezisi onu nəzərdə tuturdu ki, tərcüməçi olmurlar, tərcüməçi doğulurlar. Bədii tərcümə sahəsində aparılan araşdırmalar daha çox təcrübi və tətbiqi mahiyyət daşıyır və nəzəri əsaslara malik deyildi. Bu məqamda prof. Ağamusa Axundovun fikirləri maraqlı olar. O, tərcüməçiləri iki qismə ayırmışdı – *sənətkar tərcüməçilər* və *peşəkar tərcüməçilər*: “Sənətkar tərcüməçi deyəndə xüsusi bədii yaradıcılıq istedadı, yüksək yazıçılıq-şairlik qabiliyyəti olanları, peşəkar tərcüməçi deyəndə isə, ümumiyyətlə, dilləri bilən, lakin özləri bədii əsər yazmaqla az məşğul olan, yaxud heç məşğul olmayan mütəxəssisləri” nəzərdə tutur [1, Цит. по: Nəbiyev B. səh. 75].

Yeni “mədəni” yanaşma mövqeyinə görə, bədii tərcümə prosesi “ictimai və mədəni təcrübələrin” mürəkkəb qarşılıqlı təsirindən ibarətdir [2,Robinson Douglas.], bununla belə, onun mərkəzində tərcüməçinin yaradıcılığı durur.

Bir tərəfdən, R.Novruzov qeyd etdiyi kimi, “tərcüməçinin əsas vəzifəsi tərcümə mətnində orijinalın ayrı-ayrı vahidlərinin məzmununu, onların bütövlüklə mənasını və bu vahidlər arasındakı əlaqənin xüsusiyyətini tam şəkildə əks etdirməkdir” [3, Novruzov R.M. s. 89-90]. Başqa tərəfdən isə, tərcüməçi iş prosesində mətnin bir mədəniyyətdən digərinə “tərcüməsi” ilə bağlı yaranan problemləri müstəqil surətdə elə həll edir ki, mətnin tərcüməsi onu qəbul edən mədəniyyətə və onun hal-hazırki inkişaf mərhələsində formalaşan “tərcümə ədəbiyyatının” formatına uyğun olsun.

Tərcüməçinin mədəni-dil dairəsi, milli psixologiya və mentalitet bədii tərcümə işində mühüm amillərdən biri olub, onun fəaliyyətinə nəzərə çarpacaq qədər təsir göstərir. “Milli psixologiya və mentalitetin bədii ədəbiyyat tərcüməçisinin fəaliyyətinə təsiri problemi tərcümə nəzəriyyəsinin ən az öyrənilən problemlərindən biridir” [4, Рзаев Ф.Чс. 18].

Prof. F.Ç. Rzayev L. Tolstoyun nəsr əsərlərinin Azərbaycan dilinə tərcümələrini təhlil edərkən qeyd edir ki, “milli psixologiya və mentalitet tərcüməçinin fəaliyyətinə müəyyən təsir göstərir” <…> Əksər hallarda milli psixologiya və mentalitetin üzə çıxması faktları poetik təsvir vasitələrinin (epitet, müqayisə, metafora) verilməsində, dini ayinlərin, nitq və mədəni etiket elementlərinin təsvirində, şifahi xalq yaradıcılığı elementlərinin, şeir parçaları və onların düzülüşünün əks etdirilməsində özünü göstərir” [5, Рзаев Ф.Ч. с. 21]. L.Tolstoyun tərcümə olunmuş əsərlərindən çoxlu sayda elə nümunələr göstərə bilərik ki, burada Tolstoy poetikasının üsul və vasitələri ustalıqla bərpa edilmiş, eyni zamanda milli mentalitetdən, mədəniyyətdən, bu və ya digər sözün üslub çalarından asılı olaraq dəyişikliklər edilmişdir. Məsələn, “Hacı Murad” povestində «как зверь, косится» [6, Толстой Л.Н. с. 47] ifadəsi “canavar kimi baxırdı” [7, Tolstoy L.N. c. 39] şəklində tərcümə olunmuşdur. Tərcüməçi “heyvan” sözünü “canavar” sözü ilə əvəz etmişdir, belə ki, kontekstdə işlənən “heyvan” sözü yazıçının burada nəzərdə tutduğu mənanı ötürə bilmir, həmçinin azərbaycanlıların şüurunda “canavar” mifləşdirilmiş simvol, arxetip olub, cəsarət, güc və əzmkarlıq ifadə edir.

Beləliklə, bütövlükdə bədii əsərin quruluşunda aşkara çıxan milli xarakterin əlamətlərini bərpa etmək – “xarakterin təkrarolunmaz milli xüsusiyyətini, hər bir milli incəsənətin bənzərsiz rəngini, ətrini yaradan xalqın psixoloji, emosional xüsusiyyətlərini” qoruyub saxlamaq deməkdir. [8, Фадеев А. с. 256]. Lakin təcrübə göstərir ki, tərcüməçilər “orijinalın milli spesifikasını digər dildə heç də həmişə mükəmməl şəkildə bərpa edə bilmirlər: əldə edilmiş ayrı-ayrı uğurlar uğursuzluqlarla növbələşir, bununla yanaşı, əsərin orijinalı nə qədər zəngindirsə, itkilər bir o qədər də nəzərə çarpır” [9, Гулузаде Я. М. с. 11].

Ş.Ələkbərovanın qeyd etdiyi kimi, “milli təfəkkürün səciyyəvi xüsusiyyətləri bilavasitə əsərin nitqinin bədiiliyində – dil qanunlarının diktə etdiyi, əsəri özünəməxsus və bənzərsiz edən, onun estetik təsirini artıran

metafora, epitet və digər obrazlı ifadələrdə meydana çıxır" [10, Алекперова Ш. с. 102]. Buna görə də tərcümə sənətinin birinci tələbi məzmunun qorunub saxlanılmasıdırsa, ikinci tələbi müəllifə məxsus ifadə vasitələrinin mümkün qədər mühafizə edilməsidir, yəni əsəri tərcümə edilən yazıçının fərdi dilini çatdırmaq bacarığıdır. Başqa sözlə, tərcüməçi əsərini tərcümə etdiyi yazıçının nəinki milli dilini, həmçinin onun bədii dilinin bütün xüsusiyyətlərini və incəliklərini mükəmməl bilməlidir, əks təqdirdə Puşkin ilə Qoqol, Dostoyevski ilə Tolstoy, Çexov ilə Qorki arasındakı fərq tərcümə zamanı itəcək və tərcüməçi başqa dildə orijinala tam uyğun bədii əsər yaratmayacaq" [11, Шариф А. с. 43]. Əsəri tərcümə edilən yazıçının fərdi dili ilə dünyanın dil mənzərəsinin meydana gəlməsi problemi əlaqəlidir.

Belə ki, prof. A.Məmmədli ivritcə Əhdi-cədiddə Tövratın idealogiyasını araşdırarkən qeyd edir ki, "tərcümənin dili dünyanın dil mənzərəsi adlandırdığımız reallıqdan xilas ola bilmir. İki ideologiya üz-üzə gəlir: dini mahiyyətdə olan mətnin ideologiyası və hər hansı çevrilmiş forma kimi tərcümə dilinin ideologiyası" [ 12, Мамедли А.М. с. 7]. A.Məmmədlinin sözlərini başqa şəkildə ifadə etsək, təsdiq etmək olar ki, bədii mətnin tərcüməsində həm orijinal mətnin dil mənzərəsini, həm də tərcümənin icra edildiyi dilin dil mənzərəsini nəzərə almaq lazımdır. Bu, tərcümə zamanı milli koloritin çatdırılması və əks olunması problemi ilə bilavasitə əlaqəlidir. F.Ç.Rzayevin fikrincə, elə milli psixologiya və mentalitet amili tərcümədə səhvlərə gətirib çıxarır. Məsələn, Koroğlunun xarici görünüşünün təsvirinin qeyri-dəqiq tərcümə edilməsini belə səhvlərdən biri hesab etmək olar. Əsərin orijinalında aşıq Koroğlunun boynunu öküzün boynu ilə müqayisə edir: "Süysünü ülədiki, kəl süysünü kimi". Rus dilinə edilmiş tərcümədə: «…грудь у него, как у быка». Tərcümə zamanı mentalitetin tərcüməçiyə mane olduğu digər nümunə M.Y.Lermontovun "Maskarad" dramının Rəsul Rza tərəfindən Azərbaycan dilinə tərcüməsi hesab edilə bilər. M.Lermontov yazır:

«И вдруг во мне забытый звук проснулся:
Я в душу мертвую свою
Взглянул… и увидал, что я люблю;
И стыдно молвить… ужаснулся!..
Опять мечты, опять любовь
В пустой груди бушуют на просторе;
Изломанный челнок, я снова брошен в море:
Вернусь ли к пристани я вновь?».

Rəsul Rzanın tərcüməsində:

«Yenə şirin xəyal, şirin arzular...
Yenə boş sinəmdə möhnət, intizar.
Yenidən taleylə durdum üz-üzə
Bir sınıq qayıqtək çıxdım dənizə
Görək tufanları yenəcəyəmmi,
Doğma sahillərə dönəcəyəmmi ?!".

Q.Sultanova hesab edir ki, R. Rza bu yerdə orijinalda olmayan sözlərdən istifadə edərək tərcüməni dəqiq deyil, təsviri şəkildə etmişdir. Lakin biz tənqidçinin fikri ilə tam razı deyilik. Tərcüməçi əsərin bu yerində sərbəst tərcüməyə müraciət etməyib, o öz mentalitetindən ayrıla bilməmişdi: Şərqdə qıza birbaşa sevgi etiraf etmək qəbul edilmir. Bununla əlaqədar olaraq qeyd etmək istəyirik ki, orijinal mətnlərin və tərcüməçi mentalitetindən ibarət tərcümələrin linqvokulturoloji xüsusiyyətlərinin araşdırılması əhəmiyyət kəsb edir.

Yəqin təsadüfi deyil ki, XX əsrin sonlarından etibarən tərcümə fəaliyyəti sadəcə dil və yaradıcılıq hadisəsi kimi deyil, daha çox sosial, siyasi, hətta ideoloji hadisə kimi müzakirəyə qoyulmağa başladı. Tərcümə "bu fəaliyyət növünə, tərcüməçi və onun fəaliyyət məhsuluna cəmiyyətin həvalə etdiyi" ictimai vəzifə daşımağa başlayır və bu vəzifəni cəmiyyətin tələblərinə müvafiq şəkildə yerinə yetirir [13, p. 83-100].

Beləliklə, müasir tərcüməşünaslıqda bədii mətnlərin tərcüməsində 3 problem dayanır. Bu problemlər bir-birinə o qədər qarışıb ki, biri digərindən irəli gəlir və bunlar tərcüməşünaslıqda yeni mədəni-sentrik yanaşma ilə əlaqəlidir.

## Ədəbiyyat:

1. Цит. по: Nəbiyev B. Axtarışlar, tapıntılar və itkilər (Azərbaycan dilində bədii tərcümələrin vəziyyəti və vəzifələri)// Tərcümə sənəti. Məqalələr məcmuəsi. Bakı: Elm, 1990, 344 səh., səh. 66-101, səh. 75

2. Robinson Douglas. Literary translation practices. Encyclopedia of Translation Studies, London and New York. Baker, M. (ed.): Routeledge, 1998, 2001

3. Novruzov R.M. Bədii tərcümənin nəzəriyyəsi və təcrübəsi. Bakı: Mütərcim, 2011, 256 səh., s. 89-90

4. Рзаев Ф.Ч. Национальная психология и менталитет переводчика художественного перевода// Русский язык и литература в Азербайджане,№ 3-4-, 2016, с. 18-21, с. 18

5. Рзаев Ф.Ч. Национальная психология и менталитет переводчика художественного перевода// Русский язык и литература в Азербайджане, № 3-4-, 2016, с. 18-21

6. Толстой Л.Н. Собр. соч. в 22-х тт. М.: Художественная литература, 1978-1985, т.14, с. 47

7. Tolstoy L.N. Əsərləri. 12 cilddə., Bakı: Yazıçı, 1975-1984, т. 10, с. 39

8. Фадеев А. Собр.соч. в семи томах. Т. 5. М.: Художественная литература, 1970, с. 256

9. Гулузаде Я. М. Художественный перевод и литературные связи. Баку: Мутарджим, 1999, 148 с., с. 11

10. Алекперова Ш. Проблема воссоздания на русском языке художественно-выразительных средств эпоса «Кероглу» // Искусство перевода. Баку: Элм, 1990, 344 стр., с. 102-117, с. 102

11. Шариф А. Актуальные проблемы теории художественного перевода// Искусство перевода. Баку: Элм, 1990, 344 с., стр. 40-48, с. 43

12. Мамедли А.М. Идеология Торы в Новом Завете на иврите. Языковая картина мира и перевод// Русский язык и литература в Азербайджане, 2014, № 2, с. 7-12, с. 7]

13. Toury, Gideon. 'The Nature and Role of Norms in Literary Translation'. J.S. Holmes, J. Lambert and R. van den Broeck, eds. Literature and Translation, New Perspectives in Literary Studies. Leuven: Acco, 1978, p. 83-100, c. 83 Toury, Gideon. 'The Nature and Role of Norms in Literary Translation'. J.S. Holmes, J. Lambert and R. van den Broeck, eds. Literature and Translation, New Perspectives in Literary Studies. Leuven: Acco, 1978, p. 83-100, c. 83

**The creative f eatures of Artistic Text Translator**

**Summary**

The cultural-linguistic circle of the translator, national psychology and mentality as one of the important factors in the artistic translation has a considerable impact on its activities. "The problem of the influence of national psychology and mentality on the work of the literary translator is one of the least studied problems of translation theory". If the first requirement of the translation art is the maintaining the content, the second requirement is to preserve the author's expression means as much as possible, that is, the ability to convey the writer's whose work is translated individual language. In other words, the interpreter must have a perfect understanding of not only national language, but also all the features and subtleties of the artistic language of the write whose work translates.

**Творческие особенности переводчика художественного текста**

**Резюме**

Культурно-языковой круг, национальная психология и менталитет переводчика в процессе перевода является одним из важным фактором и заметно сказывается на его деятельности. "Национальная психологии и место (tesir) менталитета теории перевода изученная деятельность художественной литературы является одним из наименее проблемой. Если первое требование профессии перевода сохранить содержание перевода, то второе требование умение сохранить средств выражение присущий (свойственные) переводчику. Т.е. учение довести до читателя индивидуальный язык писателя. Иными словами, переводчик переводя произведение должен в совершенстве знать тонкости и все особенности языка писателя.

**Rəyçi: prof. R.M.Novruzov**

**Talıbova Şəbnəm Azər qızı**
Bakı Slavyan Universiteti

## SUFFİKSLƏRİN SXEMİ VƏ MODELİ

***Açar sözlər:*** *sözdüzəltmə, suffiks, sxem, model*
***Key words:*** *word formation, suffix, scheme, model*
***Ключевые слова:*** *словообразование, суффикс, схема, модель*

Müasir ingilis dilində sözdüzəltmənin izahatına başlamazdan əvvəl sözdüzəltmənin dilçilikdə yeri məsələsi üzərində ətraflı şəkildə dayanmaq lazımdır. Sözdüzəltmənin dilçiliyin hansı bəhsinə-qrammatikaya (morfologiyaya), yoxsa leksikologiyaya aid edilməsi məsələsini ətraflı şəkildə nəzərdən keçirmək lazımdır. Ona görə də bu sahədə mövcud olan fikirləri təhlil edilib və nəticədə alimlərin son qərarına istinad edilib ki, sözdüzəltmə dilçiliyin yeni və müstəqil bir sahəsi hesab edilir. Sözdüzəldici və sözdəyişdirici şəkilçilərin nitq hissələrinə görə təsnifinin özünəməxsus səviyyəsini optimallaşdırmaq məqsədilə dilçilik elminin son nailiyyətlərindən istifadə edərək sözdüzəldici şəkilçilər nitq hissələrinə görə belə qruplaşdırılır:

1) İsim düzəldən suffikslər
2) Sifət düzəldən suffikslər
3) Fel düzəldən suffikslər
4) Zərf düzəldən suffikslər

İstər azərbaycan dilində, istərsə də ingilis dilində suffikslər (sözün sonuna əlavə edilən şəkilçilər) məhsuldar və qeyri-məhsuldar olmaqla iki yerə bölünür. Məhsuldar suffikslər bir-birinin ardınca saysız-hesabsız yeni sözlər yaratmaq imkanına malikdir, qeyri-məhsuldar şəkilçilər isə məhdud sözlərə artırılaraq az miqdarda sözlər əmələ gətirir. Bu söz yaradıcığı prinsipinə əsaslanır və dilin leksik qatını zənginləşdirir. İngilis dilində isimlərin sonuna əlavə edilən fəal suffikslərdən aşağıdakıları misal göstərmək olar.

-er şəkilçisi: bu isimlərin əksəriyyəti ixtisas adları bildirir. Məsələn, teacher (müəllim), oiler (neftçi), fighter (döyüşçü), jumper (idm, tullanan), farmer (fermer), invader (ixtiraçı), carpenter (dülgər), joiner (xarrat), jeweler (zərgər), hunter (ovçu), builder (bənna), driver (sürücü), swimmer (üzgüçü), gardener (bağban), painter/artist (rəssam), manager (müdir), driller (qazmaçı) və s.

Qeyd etmək lazımdır ki, -er şəkilçisi çox məhsuldar olub saysız-hesabsız ixtisas adları düzəltməkdə mahirdir.

-or şəkilçi: bu şəkilçi də əsasən ixtisas, sənət-peşə adları bildirərək –er suffiksi ilə allomorfluq təşkil edir. Məsələn navigator (gəmiçi), sailor (dənizçi), doctor (həkim), actor (aktyor), incistor (inkasator), corrector (korrektor), lector (lektor/mühazirəçi), executor (məhkəmə), ambassodor (səfir) və s.

-er//or allomorfları bir morfem kimi qəbul olunur, lakin onların fərqli və oxşaq cəhətləri vardır. Oxşar cəhətləri odur ki, hər iki morfemin tələffüzü [ə]-dir və hər ikisinin yaradıcılıq qabiliyyətləri eynidir. Belə ki, hər ikisi də isim düzəltmək qabiliyyətinə malikdirlər.

Fərqli cəhətləri isə onların müxtəlif qrafikə malik olmasıdır (-er, -or), -or şəkilçisi –er şəkilçisını nisbətən az məhsuldardır və qismən az ixtisas adları düzəldir: -er şəkilçisi isim və felin sonuna artırılaraq istisas adları düzəldir, -or şəkilçisi isə ancaq felin sonuna artırılıb ixtisas adı düzəldir. Məsələn aşağıdakı modellərə nəzər salaq:

Verb+er= Noun worker, fighter, invader, joiner və s
Noun+er= Noun oiler, jeweler, gardener, boxer, milker və s
Verb+or= Noun sailor, actor, translator, director, interrogator və s

-eer suffiksi. Bu morfem də -er morfemi kimi məhsuldar deyil. –eer morfemi ilə düzələn isimlərə aşağıdakıları missal göstərmək olar: mountaineer "alpinist", ballader "ballada oynayan", auctioneer "auksionu idarə edən", musketeer "kukla teatrının aktyoru", pamphleteer "pampfletçi, pamphlet" həcv yazan", marketer "kommersant, satıcı", buccaneer "pirate", racketeer "raket rexnikası ilə məşğul olan mütəxəssis" və s.

-an, -ian suffisi. Alınma şəkilçilər olan –an, -ian isim düzəldən suffikslərin fəallığı ilə seçilən morfemlər sırasındadırlar. Məsələn, musician "musiqiçi", historian "tarixçi", phonetician "fonetist", technician "texnik" və s.

-ist suffiksi. Bu morfem Azərbaycan dilində fəal olduğu kimi, ingilis dilində də fəaldır. Məsələn, communist "kommunist", typist "naşir", receptionist "resepsionist", dramatist "dramma ilə məşğul olan şəxs, dramaturq", botanist "botanik", chemist "kimyaçı", anecdotist "anikdot yazan", artist "incəsənət adamı", tourist "səyahətçi, turist", violonist "skripkaçı", paleontologist "paleontoloq", logist "məntiqçi", physicist

"fizikaçı", motorist "sürücü", dentist "diş həkimi", novelist "hekayə yazan", socialist "sosioloq, machinist "maşinist, maşınqayırma mütəxəssisi" və s.

-ant/ent suffiksi: İngilis dilində -ant/ent suffiksləri ilə yaranan isimlər, əsasən şəxs, sənət-peşə və bəzi ixtisas adları yaradır. Məsələn, servant "qulluqçu", merchant "tacir", accountant "mühasib", student "tələbə", defendant "müdafiəçi" və s.

-ing suffiksi. Bu morfem vasitəsilə də yaranan isimlər aşağıdakılardır: meeting "iclas", building "bina", driving "sürücülük", gardening "bağçılıq", accounting "mühasibat, hesabdar işi", babysitting "dayəlik", computer programming "kompüter proqramçılığı", drawing "rəssamlıq", painting "rəssamlıq", engineering "mühəndislik", wrestling "güləş", fishing "balıqçılıq" və s.

-ster suffiksi. Bu suffiks ilə yaranan isimlər: məsələn, punster "kalamburçu", songster "xanəndə" və s.

-ier suffiksi. İngilis dilində çox da məhsuldar olmayan isimlər yaradır. Məsələn, financier "iqtisadçı", warrior "döyüşçü" və s.

-ate suffiksi ilə yaranan isimlər az da olsa, ingilid dilində mövcuddur. Məsələn: advocate "vəkil" və s.

-ary suffiksi ilə yaranan isimlər. Məsələn, missionary "missioner", secretary "katibə".

-ness suffiksi ilə yaranan isimlər: Məsələn, brightness (parlaqlıq, şəffaflıq), kindness (mərhəmətlilik) və s.

-ee şəkilçisi: holdee (əsgər), artificiee (çilingər), mercee (ipək, məxmər alveri edən tacir), consignee (yükqəbul edən fəhlə) və s.

-ees şəkilçisi: poetress (şairə), instructress (müəllimə// təlimçi), actress (aktrisa), waitress (xidmətçi qadın), directoress (müdirə), songstress (müğənni qadın) və s.

-ic şəkilçisi: critic (tənqitçi).

İngilis dilində əsas sifətdüzəldici suffikslər bunlardır:

- Ful – careful, doubtful (isim)
- Less – hopeless, useless (isim)
- Ous – dangerous, famous (isim)
- Able – countable, eatable (fel)
  Comfortable (isim)
- Ible – responsible (isim)
- Ish – childish (isim)
- Ent/-ant – different, important (fel)
- Al – cultural (isim)
- Some – (handsome)

Aşağıdakı modellərdə sifət düzəldən suffiklərdən geniş bəhs edilir.

Verb + able → adjective = readable, catchable, changeable
Noun + acceous → adjective = acanthaceous, ampulaceous
Noun + al → adjective = accidental, ornamental
Noun + an (ean, ian) → adjective = Europan, African, Panamian
Noun + ate → adjective = collegiate
Noun + ed → adjective = toothed, talanted, big-headed, long-legged
Noun + en → adjective = silken, wooden
Noun + ful → adjective, = hateful, shameful, healthful, manful
Verb + ful → adjective masterful, forgetful
Noun + ic → adjective = atomic
Noun + ish →adjective = tigerish
Adjective + ish → adjective = dumpish, modish, reddish, tallish
Noun + less → adjective = branchless, windowless, smokeless, hairless, brainless
Verb + less → adjective = cureless, imagineless
Noun + like → adjective = manlike, deathlike, lamblike
Noun + ly → adjective = fatherly, neighbourly, earthly
Adjective + ly → adjective = sickly, kindly
Noun + ous → adjective = adventurous, disastreous
Noun + some → adjective = troublesome
Adjective + some → adjective = lomesome, longsome
Noun + y → adjective = bony, plumpy
Verb + y → adjective = sleepy, catty
Adjective + y → adjective = yellowy, blacky, greeny

-en, -fy, -ize, -ate, -ish ən çox yayılmış fel düzəldən suffikslərdən hesab edilir. Aşağıdakı sxem və modellərdən istifadə edərək fellər düzəltmək olar.

Noun + en → verb = threaten
Noun + ate → verb = eventuate
Noun + ify → verb = beautify
Noun + ize → verb = winterize
Adjective + en → verb = thichken
Adjective + ate → verb =pacificate
Adjective + ify → verb = intensify
Adjective + ize → verb = finalize

Suffikslərdən başqa prefikslərdən də fel düzəlməsində geniş istifadə edilir.

- re: recognize, reprint
- dis: disappear, dissapprove
- un: unbuild, uncover
- mis: misunderstand
- en: enlarge, encircle

Ön şəkilçilərdən danışarkən qeyd etmək lazımdır ki, suffikslərdən fərqli olaraq prefikslər bir nitq hissəsindən digərinə dəyişmək qabiliyyətinə malik deyildir və yalnız sözün leksik mənasını dəyişməyə xidmət edir.

Yəni, fel əmələ gətirən ön şəkilçilərdə sözdüzəldici ünsürlər daha çox nəzərə çarpır.

-de, -under, -over, -up, -re kimi ön şəkilçiləri də yuxarıda qeyd edilənlərə əlavə ola bilər: decade, defrost; undergo, underclose, underwork; overbid, overdrink, overdo; uphold, uprise, uproot; re-establish, re-educate və s.

Zərf düzəldən şəkilçilərə əsasən –ly, -ward, -wards, -ways, -wise və s. aid etmək olar.

Zərf düzəldən modellər əsasən aşağıdakılardır:

Noun + wise → adverb = clockwise, prestigewise
Noun + ward → adverb = seaward, southward
Noun + ways → adverb = endways
Adjective + ly → adverb = briefly, shortly, nearly
Adjective + wise → adverb = broadwise, longwise
Numeral + ly → adverb = secondly
Pronoun + wise → adverb = anywise
Participle II + ly → adverb = hurriedly, fixedly
Adverb + ward → adverb = downward
Adverb + wards → adverb = ownwards

Ingilis dilində zərflərin əksəriyyətinin yaranmasında iştirak edən və zərf düzəldən suffikslərin içərisində -ly suffiksini ən məhsuldar hesab etmək olar.

## Ədəbiyyat:

1. О.Д.Мешков Словообразование современного английского языка,М, 1986, стр. 187.
2. N.Rəcəbova. Qrammatik səviyyədə dilin struktur modelləri.Bakı, 2009,səh. 196
3. N.Hüseynova.Azərbaycan dilində termin yaradiciliği prosesi.Bakı, 2008,səh 139.
4. П.М. Карашук. Аффиксальное словообразование в английском языке.М.1977,стр.187
5. A.Bayramova. Leksik alınmaların dilin zənginləşdirilməsində rolu. Bakı-2009, səh. 206

## The Scheme and model of suffixes

**Summary**

Scientist consider word-meaning to be a new and independent field of linguistcs. This article is about word forming suffixes, which play a very important role in the enriching the lexical minimum. Scheme and models of suffixes making up nouns, adjectives, verbs and adverbs are also shown in this article. –er, -or, -eer, -less, -ible, -al, -some, -like, -y, -ify, -ize, -ly, and so on are the main suffixes enlarging the lexical minimum of the English language.

## Схема и модель суффиксов

**Резюме**

Ученые считают словообразание новой и свободной областью языкознания. В статье речь идеть и словообразовательных суффиксах, которые играют важную роль в обогащении лексического минимума. Схема и модели суффиксов, образующие существительное, прилагательное, глагол и наречие также показаны в статье.-Er,or,eer,an,ian,ist,ant,ent,ing,ster,ier,ate,ary,ness,ee,ess ize и другие считаются основными суффиксами в обогащении лексического минимума английского языка.

**Rəyçi: b.m.A.Rəcəbli**

**Əhmədova Səidə Məhiyəddin qızı**
N.H.Cəbiyev adına tam orta məktəb
seide-86@mail.ru

# DİLLƏRİN ARAŞDIRILMASINDA MÜQAYİSƏLİ-TARİXİ DİLÇİLİYİN ROLU

***Açar sözlər:*** *dilçilik, müqayisə, tarix, araşdırma, metod*
***Key words:*** *linguistics, compare, history, research, method*
***Ключевые слова:*** *лингвистика, сравнение, история, исследование, метод*

İntibah dövrü həm ümumi tarixin, həm də digər elmlərin tarixində müasir dövrün başlanğıcı hesab edilsə də, XIX əsrin əvvəllərində dünya elmləri üçün daha kəskin bir dönüş idi. Lakin buna baxmayaraq o dövrün tarixi şəxsləri və onların işi barədə daha az məlumat əldə edilirdi. Müasir dövrün millətləri arasında Avropa ölkələri, Almaniya və İtaliya öz müstəqilliklərini əldə edib, Antik dövrün təsirindən çıxmağı bacarırlar. Avropada yeni universitetlərin yaranması, Avropa və Amerika alimlərinin müştərək rolu təhsil sistemini canlandırır. Universitetlərin kitabxanaları XIX əsrdən başlayaraq daha geniş məqalə və fikir mübadilələrinə yer verirlər.

XIX əsrdə bir çox işlər görmüş dilçi alimlər ilk olaraq öz tələbələri arasında tanınmağabaşladı. Qrimm, Uitney, Meyer-Lübke, Maks Müller, Bruqman və Svit və s.

Bugünki dilçilik elminin ayrıayrı sahələrində, xüsusən HindAvropa dillərinin tədqiqində böyük rol oyn amış alimlərin sadəcə bir qismidir. Əlbəttə demək olmaz ki, XIX əsrə qədər müqayisəli-taixi dilçiliklə bağlı heç bir iş görülməyib. Sadəcə XIX əsr müqayisəli və tarixi dilçiliyin nəzəri və metodoloj i cəhətdən daha çox inkişaf etmiş dövrü sayılır.

**Müqayisəli tarixi araşdırma metodu:**1922ci ildə sinxronik və təsviri dilçilik haqqında fikirlər söyləy ən O.Jesperson dil quruluşunun tarixi aspektdən öyrənilməsinəvə dilə tarixi bir sahə kimi baxılmasına diqqət yetirir[1,s.190].

Tarixi aspektdən araşdırmalara baxsaq, dillərin tarixi cəhətdən bir-birilə münasibəti hələ XII əsrdən İsland və İngilis dillərinin əlaqəsi ilə olmuş. Buna baxmayaraq, dilə tarixi yanaşma "ilk qrammatik"-Dante ilə başlayır. O, dillərin coğrafi yerləşməsindən qaynaqlanan, eyni mənbəyə aid olan müxtəlif dialektlərin keçdiyi dövrü və tanıdığı üç dil ailəsini göstərmişdir. Bunlar şimalda german, cənubda latın, Asiya və Avropanın qovuşağında isə yunan dili idi. Onun fikrincə latın sözləri daha geniş yayılmış və qrammatiklər tərəfindən qorunub. Dante Hind-Avropa dillərində (sonralar J.J.Skaligerin də müraciət etdiyi) ikili bölgü metodundan istifadə etmişdir. O, bir söz seçərək, onun müxtəlif dillərdə ifadə formalarını qeyd etmişdir. Belə ki, German dillərində təsdiq cavabı bildirən 'iə-'(ja-bəli), İtaliyanca (Latın mənşəli) si", cənubi Fransada "oc" və şimali Fransada işlənən"oil" (latınca hoc ille-he does) buna misal olaraq göstərilə bilər. Nəticədə bu bölgüdən qaynaqlanaraq Fransada dillə bağlı cənubda Langue d'oc (Provençal), şimalda isə Langue d'oil kimi yer adları yaranmışdır. Beləliklə də XIX əsrdə İtaliyan yarımadasında italiyan dialektlərinin araşdırılması bu dilin inkişafına böyük təkan verdi. Roman dillərinin kökü sayılan latın dili daha dərindən öyrənilməyə başlandı. Latın dili intibah dövrünən əvvəl yazılı dildə qorunub saxlanırdı, şifahi dildə isə Roma katolik kilsəsinin və bəzi təhsilli, savadlı insanların dilində yaşayırdı [2,s.11].

Dillərin tarixi əlaqələri Dante dövründən (XIII-XIV əsr) erkən intibah dövrünə qədər heç bir problem yaşamamışdır. Latın dilinin sıradan çıxmasına səbəb onun müasirləri J.J.Skaliger və oğlu J.C.Skaliger kimi dilçilər tərəfindən inkişaf etdirilməməsi oldu. Belə ki, onlar latın dilinə yunan dilinin dialekti kimi yanaşmışlar, bununla da yunan və latın dilləri arasındakı tarixi inkişaf bağı qopmuşdur. Ümumi dillər arasından əsasən Hind-Avropa və Fin-Uqor dillərinin araşdırılmasına üstünlük verilirdi. J.Skaliger Hind-Avropa dillərindəki roman, yunan, german və slavyan dillərini leksikadakı oxşar sözlər ilə qruplaşdıraraq Deus, Theos, Godt, Boge dilləri adlandıraraq Allah sözünün misalında dillərdəki sözlərin oxşarlığını da vurğulamışdır. Bu barədə "Avropa dilləri haqqında mühakimə" əsərində də qeyd etmişdir. [3,s.6].

Dünya dillərinin təsnifatı Avropaya məlum idi və XVII əsrdən dünya dillərinin tarixi əlaqəsini iki İsveç alimi G.Stiernhelm və A.Jeqer bəzi yalnış fikirlər olsa da öz əsərlərində göstərməyə çalışmışlar. O, (G.Stiernhelm) latın dilindəki "habere" və qot dilindəki "haban" (to have-malik olmaq) feilinin sonluğundakı oxşarlığa görə bu dillərin eyni kökdən gəlməsini iddia etməyə çalışmışdır və təəssüf ki, bu iki dilin əlaqəsi olmadığından xəbərsiz idi. A.Jeger isə coğrafi yerləşməyə görə dillərin qohumluq əlaqəsinin olduğunu sübut etməyə çalışmışdır. Bu araşdırmalardan yalnız bir əsr sonra J.J.Skaliger və Leybnis dillərə tarixi aspektdən

yanaşmanı ön plana çəkirlər. Lakin onlar dillərin mənşəyini ciddi cəhdlə axtarmırlar. Leybnis ilk dəfə fin və macar dilləri arasında tarixi əlaqənin olduğunu söyləyir, lakin o, daha irəliyə gedir və dilləri "Bibliya"dakı Nuh peyğəmbərin oğlanlarının hekayəsi ilə əlaqələndirir. O, eyni zamanda yer və çay adlarını tədqiq edərkən Fransa-İspaniya sərhədlərinə qədər araşdırmalar aparır, bu da öz növbəsində dilçilik elmində etimoloji yanaşmanın inkişafına təkan idi. Leybnisin elmi tədqiqatı dünya dillərinin qrammatika və lüğətlərinin ərsəyə gəlməsində, bir sıra dilçilik atlaslarının yaranmasında və roman dili əsaslı əlifbanın hazırlanmasında böyük rol oynamışdır. Leybnis eyni zamanda dillərin tarixi əlaqələrinin araşdırılmasında morfoloji və leksik dəlillərin də vacibliyini vurğulayır.

Müqayisəli dilçiliyin inkişafına xidmət edən sistemli material toplanması Avropanın dünyaya tanındığı intibah dövründə daha da sürətlə artırdı.

Bu dövrdə lüğət tərtibi, kilsə mətnləri,sözlərin siyahısı və dil araşdırılması daha da labüd olur və bütün bu materiallar XVI əsrdə "Mitridatlar" (Mithridates) adı altında çap edilir.

XVIII əsrdə II Katerinanın rus dilinin təsiri ilə dilçiliyə olan marağı 200 dilə aid müqayisəli sözlərdən ibarət siyahı hazırlanmasına səbəb olur. Bu iş əsasən Alman dilçisi P.S.Pallasın əməyi idi və əsər "Bütün dünya dillərinin müqayisəli lüğəti" adı altında nəşr edilir. Bu əsərin təsirilə C.J.Kraus 1787-ci ildə müqayisəli dilçiliyin vacibliyini, dillərin semantik, qrammatik quruluşunu və coğrafi yerləşməsini və dillərin paylaşmasını ön plana çəkmək üçün öz məqaləsini yazır. Bu cür tarixi araşdırmalar dillərin mənşəyinin etimoloji cəhətdən araşdırılmasında, lüğət, qrammatika və tipologiyasının sistemli tədqiiq olunmasında, eləcə də Fransız ensklopediyasının yaranmasında böyük rol oynamışdır. Lakin kitabın müəllifləri fransız və latın dilinin ümumi qrammatik quruluşunun fərqli olduğunu və bu dillərin birbaşa əlaqəsinin olmadığını xüsusi vurğulamışlar [4,s.193-196].

Ümumiyyətlə, dildən dilə keçən bir sıra sözlər var ki, onların qohumluq əlaqəsinin olduğunu sübut etməyə çalışmışlar və bu da bəzən yalnış nətcəyə gətirib çıxarıb. Çünki bəzi coğrafi yerləşmə və müəyyən etimoloji təhlillər fikirləri səhv yönləndirib. Bu isə dilçilərin araşdırma prosesində vaxt itkisinə, qeyri məhsuldar işlərə də səbəb olurdu. Düzgün etimoloji təhlil bəzən bir sözün başqa bir dilə keçib qismən dəyişdiyini göstərə bilir. Məsələn, aqqlütinativ dile aid olan azərbaycan dili və flektiv dil qrupuna xas olan ingilis dilinə aid çoxlu sayda ortaq sözlər mövcuddur, lakin bu, həmin dillərin qohum olmasını göstərən fakt ola bilməz. Bu sözlər təbii ki, dövrün siyasi, iqtisadi, mədəni, elmi və s.kimi əlaqələri ilə bağlıdır. Yuxarıda da göstərildiyi kimi araşdırmaları nəzərə alsaq, zəngin materialların toplanması daha çox XVIII əsrə təsadüf edir, çünki bu dövrdə dillərin araşdırılması üçün akademik şərait yarandı. Təbii ki, bunun üçün intibah dövrünün də danılmaz rolu var. Materialların toplanmasından bir əsr sonra-XIX əsrdə dilçilərin əksəriyyəti Hind-Avropa dilləri üzərində müəyyən araşdırmalar aparmış və nəzəriyyələr söyləmişlər. Bu dilçilər başqa ölkələrdə fəaliyyət göstərsələr də belə, doğma dilləri olan german dillərinin qorunmasına daha çox xidmet edirdilər. Məsələn alman əsilli mütəxəssis Maks Müllerin Oksford universitetindəki fəaliyyətini buna misal göstərmək olar. Avropa dilçilərinin əksəriyyəti o dövrdə Hind-Avropa dillərinin ulu dili hesab etdikləri sanskrit dilinin tədqiqinə yönəldikləri üçün həmin dövrün Şlegel qardaşları, F.Bopp və F.Pott kimi məhşur alimləri öz əsərlərini və tarixi araşdırmalarını da bu istiqamətdə aparmışlar. F.Şlegel 1808-ci ildə "Hind-dillərinin öyrənilməsi və dilə dair" əsərində dillərin daxili quruluşunun öyrənilməsinin vacibliyini də xüsusi vurğulamışdır. Onun "Müqayisəli qrammatika"sı indiki dövr üçün də vacib materiallardan hesab olunur. F.Boppun 1816-cı ildə nəşr etdirdiyi "Sanskrit dilinin sistem əlaqəsi yunan, latın, fars və alman dillərinin mqayisəsində" əsəri də bu sıraya daxildir [5,s.8,21].

XIX əsr dilçilik tarixində üç alim -danimarkalı R.Rask və Alman alimləri Y.Qrimm və F.Bopp müqayisəli-tarixi dilçiliyin baniləri hesab olunurlar. Belə ki, R.Rask və Qrimm Hind-Avropa dillərinin tədqiqində Hind- German (Indogermanic) terminini ilk dəfə 1823-cü ildə işlətmişlər və sonralar Pott tərəfindən daha geniş istifadə olundu, bundan sonra isə Hind-Avropa termini (Indo-European) ingilis dilində yayılmağa başladı. R.Rask ilk dəfə qədim norveç və qədim ingilis dilinin sistemli qrammatikasını yazmışdır [6,s.37]. Y.Qrimmin "Alman dilinin qrammatikası" isə german dilçiliyinin başlanğıcı hesab olunur. Məhz indi hamı tərəfindən tanınan alman dilinə xas şəkilçilər "güclü" və "zəif", ablaut(sait dəyişməsi) və umlaut (saitlərin əvvəlki şəraitə görə dəyişməsi) kimi texniki terminlər Qrimm tərəfindən ixtira olunmuşdur. R.Raskın etimoloji cəhətdən sistemli müqayisəli təhlil və araşdırmaları da dilçilik elminin yeniliklərindən sayılır. Rask qeyd edirdi ki, əgər iki dil arasında hərf dəyişikliyi baş veribsə, bu, həmin dillərin əlaqəsini göstərir və bu qaydanı da məhz Rask ilk dəfə "Qrimm qanunu" adı altında tanıtmışdır. Qrimmin səs qanunları Hind-Avropa dillərinin quruluşunun anlaşılmasında böyük rol oynamışdır. Getdikcə dillərin asanlıqla öyrənilməsi Pottun digər bir əsəri olan " Hind-German" dilləri sahəsində etimoloji təhlil" əsərinin yaranmasına səbəb oldu. "Qrimm qanununda" əslində "qanun" sözü öz terminoloji menasın-

da işlədilməmişdir.Qrimm səs dəyişikliyinin ümumi bir tendensiya olduğunu və bunun heç də hər zaman baş vermədiyini xüsusi olaraq qeyd etmişdir.

Bundan sonra XIX əsrin ortalarında dilçilik tarixində daha böyük işlər görmüş dilçilərdən biri məhz A.Şleyxer idi. Belə ki, o, qısa ömür yolunda dilçilik tarixi və dil nəzəriyyəsi üzrə bir çox töhvələr vermişdir. Onun ən məhşur əsəri isə "Hind-German dillərinin müqayisəli qrammatikasının kompediumu" əsəridir. Digər əsəri isə "Hind-German qohum dillərinin fonetik və morfoloji təsviri" Bu əsər məhz XIX əsrdə qohum dillərin əlaqəsinin araşdırılmasında böyük nailiyyət idi. Şleyxer diqqəti təbiət və hipotetik (fərziyyəvi) əcdad əlaqəsinə yönləndirir. O, gəncliyində bir sıra Avropa dillərini öyrənmişdir. Onun "Litva dilinə dair əlyazması" dilçilik elmi üçün böyük nailiyyət idi. Şleyxerin "Şəcərə nəzəriyyəsi" (Stammbaumtheorie) Hind-Avropa dillərinin tarixi dilçiliyində böyük inkişafa səbəb olur. Belə ki, o, dil budaqlarının bir zaman çərçivəsində birdən-birə ayrılmadığını iddia etmişdir. Dillərin ayrılmasında dialektlərin xüsusi rolunun olmasını və yalnız bir qədim dil deyil, bir neçə ulu dilin rolunun olduğunu və hətta sanskrit dilinin özünün de hər hansı bir dilin dəyişmiş forması olduğunu iddia etmişdir. Əslində onun bu cür yanaşması uzun illər boyu bir istiqamətdə gedən fikirləri alt-üst etmişdir. Heç kimin keçə bilmədiyi sərhədi Şleyxer öz iddiaları ilə keçmişdir. Dilçi alimin bu uğurlu işi J.Şmidt kimi tələbələri tərəfindən qiymətləndirilmiş və inkişaf etdirilmişdir. Belə ki, daha sonra J.Şmidt öz fərqli yanaşmaları ilə daha da irəliyə gedərək "Dalğalar nəzəriyyəsi"-Wellentheorie yazmışdır. Belə ki, o,səslərin dəyişməsinin məhz dialekt dəyişikliyinə, dialektin də dil dəyişməsinə səbəb olduğunu söyləmişdir.

Artıq XIX əsrin əvvəllərində "Darvin nəzəriyyəsi" təsirilə dilçilik elminin də xüsusi quruluş və ardıcıllıqla inkişafına dair fikirlər yaranır.V.Humboldt özünü tarixi dilçiliyin nümayəndəsi hesab etməsə də, onun məhz dilçiliyin bu sahəsinə dair maraqlı fikirləri XIX əsrin sonları ortaya çıxır Humboldt vurğulayır ki, hər bir dil danışanın təfəkküründə yaşayır. Onun bir dil quruluşu kimi möhkəmlənməsi isə dilçilərin yazdığı qanunlarla mövcuddur. Onun fikrincə dil yaşayan, canlı orqanizmlə müqayisə edilir. Bununla da o, tez-tez "təkamül" terminini və "inkişaf" sözünü işlədir. Şleyxerin fikrincə V.Humboldtun nəzəriyyəsi məhz Hegel fəlsəfəsinə çox söykənirdi. Belə ki, o, özünü təbiət alimi hesab edirdi. Dilə təbii və canlı orqanizm kimi baxan Humboldt onu bioloji bir varlıq kimi hesab edirdi [7, s.200-205]. Beləliklə, Hind-Avropa dillərinin müqayisəli və tarixi tədqiqinə dair bir sıra uğurlar əldə edilmişdir. Bununla da, növbəti nəsillər araşdırmalarında daha dərinə gedə bilmişlər. Hər öyrənilən məlumat yeni nəsilə yol açı rdı. XIX əsrin son dövrləri "yeni qrammatiklər" və ya Gənc qrammatiklər"(Junggrammatiker) doktrinası yar andı.

Bu gün müasir dilçiliyin qazandığı bir çox uğurlarməhz gənc qrammatiklərin adı ilə bağlıdır. Şleyxerd en fərqli olaraq onlar dilə bioloji deyil, fiziki hərəkətin nəticəsi kimi baxırdılar. Gənc qrammatiklərin dilçilik elminin təsirinə nəzər salaq.

Gənc qrammatiklərin əsas müdafiəçilərindən olan H.Osthoff və K.Bruqmann belə bir fikir iddia edirdilər ki, bütün səslər mexaniki proses kimi dəyişir və eyni bir dialekt daxilində və verilmiş eyni zaman çərçivəsində istisnasız qanuna tabedir və bu, həmişə eyni tərzdə, eyni şəraitlə baş verəcək, lakin dildə olan qrammatik və leksik komponent dəyişikliyi isə bütün tarix boyu baş verir və müxtəlif islahatlara məruz qalır. Osthof və Bruqmanın fikirlərini tənqid edənlərin əksəriyyəti sonralar onların fikirlərinin davamçısı oldu. Onlara istehza ilə verilən "Gənc qrammatiklər" adı bu cərəyanın adına çevrildi. Əslində onlar müqayisəli dilçiliyin tələblərini aydın görə bilirdilər, belə ki, bu dövrə qədər dilçilik tarixi özü çox yol qət etmişdir.

Nəzərə alsaq ki, Qrimm və onun müasirləri romantik cərəyanın təsirində idi, Şleyxer Darvin nəzəriyyəsi təsirilə dilə bioloji varlıq kimi baxırdı, yeni qrammatiklər dilçiliyə daha ciddi və müstəqil bir elm kimi yanaşılmasını irəli sürürdü. Yeni qrammatiklər fonetikadakı dəyişikliyi fizioloji, səslərin tələffüzünü isə psixoloji proses kimi dəyərləndirmişlər. Humboldtun dil quruluşu ilə bağlı fikirləri onların konsepsiyasında yer almırdı, onlar dilə tarixi nöqteyi nəzərdən yanaşırdılar. H.Paulun "Dil tarixinin prinsipləri" əsəri də məhz tarixi dilçilik üçün ən gözəl nümunədir. Məhz bu da onların dilçiliyə bir tərəfli təsiri idi. Bu səbəbdən də strukturalist və deskriptiv (təsviri) dilçiliyin nümayəndələri heç vaxt fikirlərini yeni qrammatiklərin "kök" və "atomizm" prinsipinə istinadən əlaqələndirməmişlər. Buna baxmayaraq yeni qrammatiklər fonetika və dialektologiya sahəsinin geniş şəkildə öyrənilməsinə diqqət yetirmişlər. Dialektoloqlar məhz "canlı"dillərin araşdırılmasına maraq göstərirdilər. Yeni qrammatiklərin isə dialektologiya sahəsinin tarixi araşdırılması, dialekt atlaslarının nəşrində böyük rolu var. Təbii ki, o dövr dialektoloqların çoxu onların fikirlərinə qarşı idilər. Lakin tarixi yanaşma yeni sahələrin araşdırılmasına təkan verdi. Belə ki, bir çox antik dillərdən keçən alınma sözlər, qədim yunan dilinin sinxronik qrammatika nəzəriyyəsi, analogiya, qrammatik paradiqmanın formaları da ön plana çəkildi və dilçilər arasında yeni tendensiya başladı. Bundan sonra tənqidçilər bir çox fərqli fikirlər də söyləyirlər. Bəzilərinin fikrincə gənc qrammat-

iklər müqayisəli dilçiliyə aid heç bir yenilik gətirməyib. Lakin bu cür yanaşma ədalətli olmazdı. Belə ki, onlar dilçiliyin ayrı-ayrı sahələrini ön plana çəkərək, araşdırmalarında bir çox uğurlara yol açmışlar. Lakin onlar dilə bütöv şəkildə yanaşmamışdılar. Coğrafi yerləşmənin və dialekt bölgüsünün səs dəyişikliyində böyük rolu var. Məhz dialektoloqlar dialektologiyanı dilçilik coğrafiyası adlandıraraq yeni qrammatikləri tənqid edirdilər.Məsələn H.Şuxardt özünün "səs qanunları" ilə yeni qrammatiklərin əleyhinə idi. J.Gilleron isə Fransanın dilçilik atlasını yaradaraq Fransız dilinin etimologiyasının da tədqiqini "Arı sözlərinin şəcərəsi" (Genealogy of the words for the bee) əsərində göstərmişdir. Yeni qrammatiklərin əksinə olaraq Gilleronun fikrincə hər bir sözün özünə aid tarixi var. Sözlərin tələffüzü isə iki yolla dilimizdə fəaliyyət göstərir. Birinci qrupa daxil olanlar uşaqlıq vərdişi ilə formalaşan səs dəyişikliyidir, ikinci qrupa isə dilə keçən çox saylı hazır sözlər daxildir. Sözlərdə səs dəyişikliyi isə ömür boyu fərdin nitqi sayəsində baş verir. Gillerona görə sözün semantika, qrammatika və tələffüzündə fərdi bir tarix var. Onları araşdırarkən etimoloji təhlilin vacibliyi ön plana çəkilməlidir [8,s.197-209].

**Nəticə**

Əslində dilçiliklə bağlı deyilənlər; yeni qrammatiklərin dilə tarixi aspektdən baxışı, Şleyxerin dilə bioloji varliq kimi baxması, Humboldtun təbii və təkamül nəzəriyyəsi ilə ideyalar irəli sürməsi kimi fikirlər hər biri özü=özlüyüdə tarixi yanaşma idi. Onlar yeni qrammatiklərlə razılaşmasalar belə bunlard ilə tarixi yanaşmanın sübutu idi. Gilleronun etimoloji təhlili, eyni zamanda dialektoloji araşdırmaların da arxasında mütləq tarixi faktlara söykənmək dayanırdı. Dil əslində hər bir şəxs üçün özünü ifadə vasitəsidir. Məhz bu yolla insan öz hiss və emosiyalarını, dünya görüşünü ifadə edə bilir. Hər bir şəxs öz millətini dili vasitəsilə təmsil edir. Dilin köməyi ilə hər bir millətə xas adət-ənənə, hər bir şəxsin sosial vəziyyəti və s.ifadə oluna bilir. Məhz tarixi dəyişiklik, insanın etik və estetik baxışları dilə öz təsirini göstərir. Fərd birləşərək cəmiyyəti yaradır və cəmiyyət də öz növbəsində kütləvi təsirləri formalaşdıra bilir. Məhz ölkə tarixində baş verən hər hansı bir kütləvi dəyişiklik dildə də təsirsiz ötüşmür.Belə ki, XIX əsrin sonu artıq dilçiliyin digər sahələrinin də məhsuldar inkişafı başlayır. Dilin müxtəlif sahələri məhz fərqli metodların və araşdırma üsullarının da yaranmasıma səbəb oldu. Beləliklə, dünya elmləri arasında inteqrasiya, siyasi və iqtisadi əlaqələr dillərin də öyrənilməsinə, müqayisəli dilçiliyin inkişafına təkan verdi. Bir sözlə, dilçilik elmi ən vacib sahələrdən hətta digər elmlərin öyrəniləməsi, alimlərin ixtirası və daha geniş dünyəvi biıiyə sahib olmaları üçün açar rolunu oynadı.

**Ədəbiyyat:**

1. Robert R.H.,A short history of linguistics, (Longman linguistics library, IVed), Addison Wesley Longman limited, 1997
2. R.R.Henry, The history of language classification, ed. T.A.Sebeok, 1973
3. Ə.Rəcəbli, Müqayisəli-tarixi dilçilik, Elm və Təhsil, Bakı 2017
4. Book 1.
5. Über die Sprache und Weisheit der Indier, Heidelberg, An English translation of parts of the text in Lehmann, pr/ed. E.F.K. Koerner, Amsterdam, 1977
6. A grammar of the Anglo-Saxon tongue, (B.Thorpe), Copenhagen, 1977
7. Book 1.
8. H.Osthoff and K.Brugmann, Morphologische Untersuchungen, English translation, Lehmann, 1967

**The role of comparative and historical linguistics in the researching of languages**

**Summary**

The comparative-historical linguistics has great role in the progress of general linguistics. So, different approaches on the historical points of view have been shown in the article. As well as the historical period of comparative linguistics has been described there. The roles of historical approaches in the different fields of linguistics like etymology, dialectology as well as in the researching of antique languages are shown in the article. One can get acquainted with the investigation on comparative linguistics by F Bopp, R. Rask, J. Grimm and F. Pott. The "voice law" by Grimm, "genealogy theory" by Shlaykher, " evolution principles" by V.Humboldt, "wave theory" by J.Shmidt and the main roles of "young grammarians" as well as the geographical location principles of languages influence on the progress of the language researching process. In the result, we can see the principle role of linguistics in the integration of different science fields, traditions and self-expression of different nations.

**Роль сравнительно-исторического языкознания в исследовании языков**

**Резюме**

Сравнительно-историческая лингвистика играет большую роль в развитии общего языкознания. Итак, в статье показаны разные подходы с исторической точки зрения.А также исторической период сравнительного языкознания был описан там. В статье показана роль исторических подходов в различных областях лингвистики,таких как этимология, диалектология, а также в исследивании античных языков. Можно ознакомиться с исследованиями по сравнительной лингвистике Ф.Боппа, Р.Раска, Дж.Гримма и Ф.Потта. "Закон голоса" Гримма,"теория генеалогии" Шлайхера," принципы эволюции" В.Гумбольдта, "теория волн" Дж.Шмидта, и основные роли "молодых грамматиков", а также принципы географического расположения языков влияние на ход процесса изучения языка. В результате мы можем увидеть принципиальную роль лингвистики в интеграции различных областей науки, традиций и самовыражения разных народов.

**Rəyçi: f.f.d. Ş.Dadaşova**

**Quliyev İbrahim Nəsir oğlu**
Bakı Slavyan Universiteti
Ibrahimquliyev27@ gmail.com

# "CAHANQOŞAYİ-NADİRİ"DƏ İŞLƏNƏN TÜRK SÖZLƏRİNİN SPESİFİK XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *Əfşar, Nadir şah, Astrabadi, lüğət, türk dili, leksika, qrammatika*
***Key words:*** *Afshar, Nadir Shah, Astrabad, Dictionary, Turkish language, vocabulary, grammar*
***Ключевые слова:*** *Афшар, Надир шах, Астрабади, словарь, тургский язык, лексика, грамматика*

Şah İsmayıl Xətaidən sonrakı Səfəvilər, Əfşarlar və Qacarlar dövründə adıçəklən dövlətlərdə fars dili üstün mövqeyə yiyələnsə də, o türk dilindən ayrı mövcud deyildi. Bu dövrdə türk dil vahidlərinin fars dilinə nüfuz etməsi nəticəsində fars dili inkişaf edir, zənginləşir və kamilləşirdi. Doğrudur, Azərbaycan dilində işlənən fars və ərəb sözləri kifayət qədər ətraflı tədqiq olunsa da, fars dilində türk sözləri az araşdırılmışdır. Baxmayaraq ki, fars dili qrammatik struktur baxımından fərqli linqivistik xüsusiyyətləri özündə əks etdirsə də, soz ehtiyatı onu daha çox türk dilinə yaxınlaşdırmışdır. Ümumiyyətlə, orta çağ Yaxın Şərq dillərini leksik baxımdan bir-birindən ayırmaq çox çətindir, demək olar ki, elə bir mətn yoxdur, o, linqivistik baxımdan sinkretik xüsusiyyət daşımasın. Türk dilinin fars dilinə təsirinin araşdırılması baxımından Nadir şah Əfşarın katibi, tarixçisi və Əfşariyyə dövlətinin xarici işlər naziri olmuş Mirzə Mehdi xan Astrabadinin əsərlərini (doğum ili məlum deyil, vəfat tarixi 1761-1766 (h.q.1175-1180-ci illər arası güman edilir))araşdırmaq çoxlu faktlar verir.. Bəri başdan qeyd edək ki, Mirzə Mehdi xan zəmanəsinin çox görkəmli şəxsiyyəti olmuş və fars dili ilə yanaşı, türk və ərəb dillərini mükəmməl bilmişdir. Tanınmış İran alimi, Mirzə Mehdi xan Astrabadinin həyat və yaradıcılığını tədqiq etmiş Seyid Əhməd Ənvar haqlı olaraq yazır: "Mirzə Mehdi xan ərəb və türk dillərinin çox dərin bilicisi olan alimlərdən biri olmuşdur və buna heç bir şəkk və şübhə yoxdur. "Dürreyi-Nadiri"də ərəb dilindən heyrətamiz istifadə və "lüğəti-Sənglax" kitabının türk dilində yazılması bu müddəanın ən yaxşı sübutudur" (1, 9)

Ümumiyyətlə, təzkirələrdə, kitabxana kataloqlarında Mirzə Mehdi xanın aşağıdakı beş kitabı qeyd edilmişdir: "Dorreyi Nadere", "Sənglax", "Məban il-lüğət", "Münşəat", "Cahanqoşayi-Nadiri". Bu kitabların hər biri dil və sənətkarlıq baxımından xüsusi önəm daşıyır. Nadir şahın ölümündən sonra münşilər və icmalçılar arasında xüsusi şöhrət qazanan "Dorreyi-Naderi"yə görə Mirzə Mehdi xanın adı dillər əzbəri olmuş və əsəri isə "mənası ləfzə qurban verilmiş, ləfzi isə sənətkarlıq yolunda şəhid olmuş" kitablardan biri kimi tarixə daxil olmuşdur. (1, s. 9)

"Sənglax" cığatay türkcəsi və farsca lüğətdir. Mirzə Mehdi xan onun müqəddiməsində qeyd edir ki, kitab Əmir Əlişir Nəvainin şeir və nəsr divanının müşkülatlarını həll etmək ***(başa düşülməsini asanlaşdırmaq-İ.Quliyev)*** üçün yazılmışdır: "Sonsuz bəlağət ölkəsinin əmirnafiz ül-əmiri Əmir Əlişir Nəvainin söz bəzəyi olan şeirlərini oxumağa əvvəldən xüsusi şövqüm (vardı)... Bu sırada tədqiqat hasil olandan sonra ürəkdən keçdi ki, oradakı çətin sözlər toplansın və o sözlərin mənalarını izah edən bir kitaba başlanılsın" (2, s.1). Müəllif bu əsərdə mahiyyətcə həzrət Nəvainin mənzum və mənsur kitabının lüğət məsələsini həll etdiyini, üstəlik, bəzi "moğoliyyə və Rumiyyə" (monqol və türk) sözlərinin kökünü də araşdırdığını bildirir. Mirzə Mehdi xan "ən mühüm əsərlərindən olan bu "Sənglax" adlı türkcə-farsca lüğətin tərtibinə Nadirlə ilk tanışlıqdan başlayıb, h.q. 1173-cü ilə qədər (1760) davam etmişdir.

Mirzə Mehdi xan Astrabadi cığatay türkcəsi və fars dili lüğəti ilə bərabər, yazdığı "Məbani il-lüğət" əsərində türk dilinin qrammatik qurluşunu araşdırmış, onu qədim şeir nümunələri ilə izah etməyə çalışmışdır.

Bu kitab əslində "Sənglax"ın bir hissəsi, daha doğrusu, onun fəsillərindən biri kimi diqqəti cəlb edir. Lakin "Sənglax" sırf lüğətdən, "Məbani l-lüğət" isə türk dilinin qrammatik qaydalarından bəhs etdiyi üçün onlar ayrı-ayrı kitablar kimi qəbul olunurlar. Müəllif "Sənglax"ın müqəddiməsində türk dili barədə deyilənləri ötəri nəzərdən keçirərək, "Məbani l-lüğət"də qarşısına qoyduğu məqsədi aşağıdakı kimi izah etmişdir: "Fəraqi öz əsərində qeyd edir ki, türk sözləri mizan (ölçü) və məsdər baxımından ari olduğu üçün, öz kitabımın bünövrəsini qədim şeirin (gətirilən nümunələrin) şahidliyi ilə qoydum. Amma onun sözü tədqiqat və təhqiqata əsaslanmırdı və heç bir vəchlə axtarış və təhqiqata layiq deyildi, həqiqətdə türk dilində müəyyən və müqərrər olan qanun və qaydalar nə fars dilində var, nə ərəb dilində və onun bütün qrammatik formaları ədəb elminin qanununa müvafiqdir. Onları bilmək tələbələrə lazım olduğundan, o qanun və qaydaları bir qrupda və altı əsasda yazıb, aydın dəlil və arqumentlə məlum edib, onu "Məbani l-lüğət" adlandırdıq (2.s.4)

Göründüyü kimi, Mirzə Mehdi xan Astrabadi türk dilinin öz zəmanəsində mükəmməl, inkişaf etmiş bir dil olduğunu ciddi elmi əsaslarla sübut etmiş, yeri gəldikcə onun üstünlüyündən bəhrələnməyə çalışmışdır. Onun əsərlərindən aydın olur ki, o türk dillərinin, demək olar ki, əksər dialekt və şivələrinə bələd olmuşdur.

Tarixşünaslığımız üçün xüsusi önəm daşıyan "Cahanqoşayi-Nadiri" farsca yazılmasına baxmayaraq, türk dilinin tarixi köklərinin araşdırılması, Azərbaycan dilinin qrammatikasının tarixi-müqayisəli metodla öyrənilməsi, leksik dil vahidlərinin fonetik dəyişməsinin izlənilməsi və s. baxımından, fikrimizcə, olduqca əhəmiyyətlidir. Çünki əsər Nadir şah Əfşarın son dərəcə böyük arealda yürüşlərinin, hərbi səfərlərinin təsvirinə həsr olunduğundan, burada çoxsaylı türk toponimləri, hidronimləri, etnonimləri, antroponimləri, hərbi, siyasi, diplomatik terminlər öz əksini tapmış və üstəlik, bədii fikrin qüdrətləndirilməsi məqsədi ilə çoxsaylı türk bədii ifadə və təsvir vasitələri işlənmişdir. Bütün bunları nəzərə alan kitabın İranda tərtibçisi və çapa hazrlayanı Seyid Abdullah Ənvar "Cahanqoşayi-Nadiri" üzərində tədqiqatın iki ayrı-ayrı faktor - dil və məzmun istiqamətində aparılmasının vacibliyini qeyd etmişdir. O, yazır: "Cahanqoşayi-Nadiri"yə daxil olan sözlər "Dürrə"nin atılmış (məhcur) və yabançı (namunis) sözləri deyil, (oradakı sözlər) fars və ərəb sözləridir, lüğətlərdə mövcuddurlar, xalq dilində işlənirlər. Ancaq bu iki növ sözlərdən başqa saray münşilərinin terminləri və bir neçə gürcü kəlməsi və türk sözü işlənmişdir" (1, 13)

Müəllif türk sözlərinə nümunə olaraq "qul", "sursat", yaylamışı", "yorğa mal", "eşik ağası", "minbaşı" və s. misal gətirir. Seyid Abdullah Ənvar buna səbəb kimi o dövrdə türk dilinin nüfuzunun yüksək olmasını göstərir. <u>Həqiqətən də həmin dövrdə Şah İsmayılın xüsusi dil siyasəti nəticəsində</u> türk ədəbi-bədii dili ilə yanaşı, mükəmməl siyasi, diplomatik, hərbi və s. dil formalaşmışdı. Görkəmli ədəbiyyatşünas alim Rəhim Əliyev bunu əvvəldən türk dilinin qoşununun, ordununun dili olması ilə əlaqələndirir. Onun fikrincə, ordunun dili İran elitasının dili demək idi, çünki o zaman İran elitası hərbçilərdən formalaşırdı (3.)

Zənnimizcə, yüksək bədii sənətkarlıq nümunsi kimi son dərəcə bəlağətli epitet və poetik fiqurlarla zəngin olan "Cahanqoşayi-Nadiri"də işlənən türk sözləri əsərin bədii üslubuna uyğun olaraq leksik – qrammatik məna ilə yanaşı, bədii təsvir və ifadə vasitələri kimi də geniş funksiya daşımışlar. Buna nümunə olaraq aşağıdakı mətnin tərcüməsinə diqqət yetirmək kifayətdir: "Cahanın ***Turan*** torpağı boy atan qüvvələrin qoşununun ***hücumu ilə (türktazi)*** gülün ***qızılbaş*** işğalına (məruz qaldı) daxil oldu. ***Çəmən*** səhnəsinin qarətçiləri və gülşən dar ül-mülkünün ***yağma***çıları olan dünənki ***xarəzmlilər*** baş(lar)ını adsızlıq kürkünə çəkdilər. Və şükufə və çiçəyin qıyıqgöz ***özbəkləri*** nökərçiliyə səy etdilər. Nafərman (hakimiyyəti olmayan) güllər fərman vermək ixtiyarına yiyələndilər, reyhanların səhranişin (səhrada yaşayan) ***türkləri*** dəstə-dəstə bahar sultanın sarayına itaətə üz tutdular" (1,s.343)

Məqalə müəllifinin sözbəsöz tərcümə etməyə çalışdığı bu parçada baharın gəlişinin bədii təsvirini və Nadir qoşununun Xarəzm türkləri hesabına zənginləşməsini göstərmək üçün Mirzə Mehdi xan Astrabadi türk dilinə məxsus söz və ifadələrin, etnonimlərin həqiqi mənasını bir kənara qoyub, onlardan təşbih, istiarə, mübaliğə kimi çox ustalıqla istifadə etmişdir. Əsərin demək olar ki, bütün fəsillərində məharətlə işlənmiş belə poetik lövhələrə rast gəlmək olur ki, Mirzə Mehdi xan bunu yaratmaq üçün türk dilinin şəhdi-şirəsindən, bədii zənginliyindən məharətlə istifadə etmişdir. Amma yuxarıda qeyd etdiyimiz kimi, "Cahanqoşayi-Nadiri" ilk növbədə türk dilinin qrammatik-leksik xüsusiyyətlərinin inkişaf yolunu izləmək baxımımından əvəzsiz mənbədir. Burada sırf türk dilinə məxsus çaxsaylı **hidronimlərə:** Kür (1, s.180, 182, 405, 406, 637), Zəngi çay (1,s.253, 258), Ətrək (1, s.85, 137, 184), Arpa çay (1, s.3, 252, 254, 257, 273, 403, 404, 409), Qızılüzən (1,s.126, 135); Qazan çay- Qars çay (1,s.249), Qərənfel- çeşmə (1,s.160), Samur (1,s.237, 366), Qar qar- Qar qabər (1, s. 48), Zəngi çayı -Zəngiçay (1, s.253, 258) və s.;

**toponimlərə**: Soğanluğ-Sukanlu-Soğanlı (1,s.260), Sulağ (1, s.247, 260, 261), Xınalıq (1,s.263), Qazma (1,s.48), Çiçəktu (1, s.153, 279, 348), Ordubad (1, s.152-153), Üç kilsə (1, s.251, 255), Aladağ (1, s.137, 248), Altı ağac (1,s.263), Ağzı bir – (əsərdə səhvən "Ağzı por" kimi getmişdir) (1, s. 364, 365), Ətək (1,s.317, 334, 335, 336, 338, 352, 353, 361, 400), İlci- kənd adı (1, s.233), Qarabağ (Əfqanıstanda, Arazın o tayında və Gəraylu məhəlləsində) (1,s.138, 141, 308, 310, 347, 348, 382), Qaratəpə (İraqda) (1, s.193, 216, 217, 219, 387); Qaraçəmən (1, s. 276, 382), Qarac(ç)adağ (1, s.207, 367, 430), Qaraqum (1, s.49), Qaraqıytağ (1,s. 368, 369, 370, 377), Qarakul (1, s. 350), Qərəçulan (1,s.192); Qəleyi-Yüzbaşı (rota komandiri) (1,s. 83), Qızlar (Dağıstanda indi Kizlər adlanır), (1,s.17), Körpi (1, s.255), Daş körpi (1,s.193), Kəlisay kəndi (1,s. 239), Kögcə (1,s. 252, 406, 407), Gögcə Dinkər (1,s.403), Murad təpə (1, s.255, 257, 407,410) , Nəxcəvan (1,s.131, 129, 222, 306, 383, 387), Yam təpə (1,s. 56, 62) və s.;

**etnonimlərə**: avar (1, s.237, 263, 264, 265, 368, 377, 380, 396), qırxlu (1,s.26), gəraylu (1,s.64, 183, 364), qaraçorlu (Nadir zamanında piyada əsgərlər də belə adlanırdı) (1,s.64), irlu (Əfşar qoluna məxsus tayfalardan biri) (1,s.35), yəmirili (türk tirələrindən birinin adı, Dərəgəz və Quçanda məskunlaşıblar) (1,s.39), ziranlu-zidanlu (1,s.34), qəmuğ- kumık (bunun Qazi qəmuk variantı daha çox işlənmişdir) (1,s.230,

234, 235, 236, 237, 265), qıpçaq (1,s.8, 75, 136, 179, 379, 464), axısğa (1,s.257, 402, 403, 404), bayat (Əsli İraqda Bağdad Süleymaniyyə yolunun üstündə olan bir eldir) (1,s. 43), tikkə-tikə (Mərv ətrafında yaşayan türkman tayfası, əslində "təkalu") (1,s.82), salur (bu türkman tayfası da Mərv ətrafında yaşayır) (1, s.82) və s. rast gəlmək olur. Yeri gəlmişkən, Qutqaşen sözünün kitabda bir neçə yazılış formasına rast gəlirik: Qulqaşin - Qutqaşin, Kut gəşən.

Kitabda rast gəldiyimiz türk sözlərinin əksəriyyəti quruluş və leksik məna baxımından daha çox maraq doğurur, belə ki, əksər halda onlar ya leksik şəkilçi ilə (saruq, tuğçi, colga, olga, ilci, ulcə, sığnağ yürüş, yaylaq, gizlik, yəsaq, arpalıq və s.), ya söz birləşmələrinin tərkibində (Bilxan dağı, Bilxan dağı kəndi, dəmur qapi, doqquz para, doqquz yolum, dəvə boynu, Səran təpə, dərə kəndi, təpeyi-Toxmaq xan, eşik ağası, tüfəngçi ağasi gəri, daş körpü, dəmir körpü, pol körpü (sonuncu birləşmə əslində biri farsca, digəri azərbaycanca olan iki eynimənalı sözdən ibarətdir )), ya da mürəkkəb quruluşda (qaraçəmən, savçıbulağ, yüzbaşı, minbaşı, qaraçorlu, qarabağ, qaratəpə, qarakul, qaracabağ, qorçibaşı (şah qvardiyasının başçısı), qızılbaş, aladağ) çıxış edirlər.

"Cahanqoşayi-Nadiri"də işlənən sadə sözlərin əksəriyyəti bu gün öz tarixi mənasını saxlasa da, bəziləri ya artıq dilin passiv fonduna düşmüş, ya da yeni məna kəsb etmişdir. Məs. əsərdə işlənən "kurniş" (1,s. 256) sözü vaxtilə türk cığatay dilində "salam etmək", "itaət etmək", "baş əymək" mənasında geniş işlənsə də, hazırda öz işləkliyini itirib. O cümlədən "böyük təbil" mənasında işlənən "kurka" (1,s.263), ordunun ardınca dəstə-dəstə gələn və ordunu arxadan qoruyan piyada mühafizə "çəndavəl", eləcə də "ailə", "qəbilə", "tayfa" mənasında işlənən "aruğ" (başqa variantı "uruğ") sözü də belə bir tale ilə üzləşmişdir. Sonuncu söz ilkin varintda dildən tam çıxsa da, xalq arasında "aruğ-uruğ" kimi q1almaqdadır. Daha çox "aramgah", "mənzil", "məskən", "dayanacaq" mənasında işlənmiş "yurt" (bu günkü dilimizdə "yurd") (1,s.49) isə öz məna dairəsini genişləndirmişdir. "Kitabi-Dədə Qorqud"da "yurd" sözünü araşdıran prof. A.Hacıyev yazır: "Abidənin dilində "yurd" sözü bir neçə mənada, o cümlədən, geniş mənada vətən, dar mənada isə yaşayış yeri, dayanacaq, ev mənasında işlənmişdir" (4,s.94) Tarixən köçəri həyat tərzi ilə bağlı "çadır", "müvəqqəti yaşayış yeri" kimi işlənən və "Cahanqoşayi-Nadiri"də də bu mənanı daşıyan "yurt" (ruslar "yurta" deyirlər) sözü müasir Azərbaycan dilində daha çox "vətən", "diyar" mənasında işlənir. Yaxud "ilğar" (1, s. 49) sözü. Bu söz bu gün dilimizdə "əhd-peyman" mənası bildirən "ilqar"la omonim olsa da, "Cahanqoşayi-Nadiri"də o, tamam başqa mənada işlənmişdir. Kitabın "Təliqə"sində bu sözlə bağlı deyilir: "İlğar" türk sözüdür, "şəbgir" və "şəbxun" mənasında işlənir. "Gecə sürətlə və cəld əncam olunan müsafirət" "ilğar" adlanır" (1.s.49) Yeri gəlmişkən, Nazim Əttəba da belə yazır. Əsərdə işlənən "gizlik" sözü də bu gün dilimizdə işlənmir. "Gizlik" (1, s. 71) dəstəyi uzun balaca bıçağa deyirlər. Bürhani-Qatidə qələmyonanın da bir növünün belə adlandırıldığı bildirilir və əlavə edilir ki, onun başı qatlanmış, arxası nazik olurdu.

Leksik şəkilçili sözlərə diqqət yetirdikdə onların əksəriyyətinin "çi"- qorçi (1, s.454), "uğ"- ağruğ (1, s.83), oyuğ (1, s.667), uk - tuzuk (1, s.172) (səliqə, bəzəmə, nizam, tərtib; ("Yeni tarama sözlügü"ndə "tüzmek" içine sinmek, işlemek kimi işlənmişdir (4,s.215); "ağ" – sığnağ (1, s. 276), yərağ (1, s.122, 595), "lıq"- arpalıq (1, s.174), lik - iydəlik (1, s.179), "ş" (yüreş) (1, s.137, 276), "un"- qoşun (1, s. 276, 469); "lağ" (yəylağ), "ğu"-"bəsğu" və s. vasitəsilə yarandığını görürük ki, bu da XVIII əsrdə qeyd edilən şəkilçilərin xeyli məhsuldar olduğunu göstərir. Bu əsərdə işlənən "uğ" şəkilçisi müasir dilimizdə daha geniş şəkildə işlənən (lıq) şəkilçisi ilə eyni mənalıdır. Məs. ciddi fonetik dəyişməyə məruz qaldığından əslindən çox uzaqlaşmış "ağruğ" (1, s.83) sözü təliqədə "daşınan" və "yük" kimi izah edilmişdir. Əslində o, müasir dilimizdəki mücərrəd "ağırlıq" isimidir və kitabın ətək yazısında qeyd edilir ki, bu söz bəzən mətnin içərisində "ağırrıq" kimi də getmişdir. (1, s.565)

Ümumiyyətlə, əsərdə "lıq", "lik" şəkilçisinin türk mənşəli sözlərə əlavə edildiyi kimi (məs. tiyul, iqta vergisi mənasında işlənən "arpalıq", "iydəlik" sözü), bəzən də fars mənşəli sözlərə əlavə edilmişdir: yer adı bildirən "abkədəlik" kimi.

Türkdilli sözlərə artırılan yuxarıdakı leksik şəkilçilərdən yalnız ( məs. ol-ga (ka), cul- ka və ya "ga" (diyar, düz yer, çöl) (1, s.463)), sonradan öz məhsuldarlığını nisbətən itirmiş və fonetik dəyişikliyə məruz qalaraq "kə", "gə" şəklinə düşmüşdür (Bürhani Qatedə ulka, ya ulga kimi işlənən bu söz "mülk", "vətən", "torpaq" kimi izah edilsə də, onun arta-dan təhrif olunduğu bildirirlir. (1, s.536)) Məsələn, o, "il", yaxud "el" sözünə əlavə olunmaqla bu gün dilimizdə geniş işlənən "ölkə", bölmək feilinin kökünə artırılmaqla isə "bölgə" sözünün yaranması buna misal ola bilər. Çox ehtimal ki, 235-ci səhifədə getmiş ul-cə də (əsir, qarət, qənimət) düzəltmə sözdür.

Bundan əlavə. XVIII əsrdə işlənən şkilçiərdən biri də "qu", "ğu" olmuşdur. Məsələn, "busğu" bu sözün birinci hərfinin b-p əvəzlənməsinə məruz qalmış forması bu gün dilimizdə çox aktiv işlənir. Fəqət "Cahanqoşayi-Nadiri"nin elmi-tənqidi mətnini tərtib edən müəllif onun izahında çətinliklə üzləşdiyini

bildirir: "Bu söz ***(busğu –İ.Q.)*** müraciət olunan lüğətlərə tapılmadı. "Aləmarayi-Nadiri"də ondan və "busğuqah"dan bir neçə yerdə söhbət açılmışdır. "Aləmara"nın mahiyyətindən belə çıxırdı ki, "busğu" o yerə deyilir ki, orada bir dəstə gözətçilik edir və sonra onlardan da bir dəstə ayrılıb, düşmənlə döyüşə girir və düşməni qovur, sonra yenidən öz busğusuna çəkilir. Xəbərsiz düşmən qəfildən busğudakılarla qarşılaşır və səmtini itirib ya məğlub, ya da fərari olurdu". (1. 534). Əslində bu bizim bu gün də dilimizdə çox geniş işlənən "pusmaq" feilindən yaranmış "pusqu" isimidir ki, türk sözlüyündə onun feil forması aşağıdakı kimi izah edilmişdir: **"pusmak, puşmak-sinmək, saklanmak, siper içine girip gizlenmek"** (5, s.174) Məlum olduğu kimi, s/ş eyni fonem olsa da, müasir Azərbaycan dilində bu sözün "puşmak" fonetik variantına rast gəlmirik.

Beləliklə yuxarıda qeyd etdiyimiz sözdüzəldici şəkilçilər içərisində ən məhsuldarı isə "çi" şəkilçisidir: "topçi", qorçi", tuğçi" ("Tuğ" sözü türk dilində bir neçə mənada - I. bayraq, muncuq; II. Maneə; III. əlamət və s.- işlənmişdir. "Tuğçi" isə "bayraqdar" və "barabançı" (məs. qədim türklər "bayraqdar bayrağı sancıb" ifadəsini belə : "tuğuğ örü tikip") işlənib) (8, 584-585), "cəzairçi"(Sonuncu söz İranda məşhur piyada hərbi dəstəni bildirir, Nadir dövründə tüfənglə silahlanmış bu dəstənin üzvlərinin sayı 20 minə çatırdı), "elçi". Çox ehtimal ki, "çi" şəkilçisi "çinitmək", "çın qılmaq" feilindən formalaşmışdır. Türk Dil Kurumu Yayınları seriyasında olan "Yeni Tarama Sözlügü"ndə "çin" sözü belə izah edilir: "gerçək", "doğru", "halis". "Çin eytmək" - doğru söyləmək; Çin itmek, [-kılmak] doğrultmaq, düzəltmək, gerçəkləşdirmək" (5, s.56). Hazırda Aərbaycan dilində "yuxunun çin olması", "çin-çin düzmək" kimi birləşmələrin tərkibində qalan və daha çox düz etmək, düzəltmək mənasında işlənən "çin" sözü, fikrimizcə, sonrakı mərhələlərdə səsdüşümünə məruz qalmaqla həm də leksik şəkilçiyə çevrilmişdir.

"Cahanqoşayi-Nadiri"də bu gün Azərbaycan dilində işlənməyən və artıq arxaikləşmiş sözlərə də rast gəlirik. Bunlardan biri də "Səbih" (1, s. 11) sözüdür. Anəndrac bunu belə izah edir: "Çala və xəndək mənasında işlənən türk sözüdür, Müharibə zamanı ona sığınıb döyüşürlər. Məcməüt-təvarixin haşiyəsində isə bu söz belə şərh edilmişdir: "Sibih", ya "siba" türk sözüdür səngər və ordunu qorumaq üçün onun qarşısında toplanan torpaqdır" (6 s.8). Müasir türk lüğətində də bu sözün isim variantına deyil, mürəkkəb zərf variantına rast gəlirik: "[sebe sebe] yürümek – salına-salına yürümek, seke-seke yürümek" (5, s.183).

"Cahanqoşayi-Nadiri"də fars-türk sözlərinin və yaxud fərqli leksik şəkilçilərin mürəkkəb sözlərlə paralel şəkildə işlənməsi xüsusiyyətləri daha çox diqqəti cəlb edir. Məsələn. yaylamışı kərdən (1, 27), eşik ağasıgəri, tüfəngçi ağasıgəri (gəri-başı) (1, s.543), qorçibaşıgəri (1, s. 639), bəzən isə eyni mənanı bildirən fars və türk sözləri birləşərək bir mürəkkəb söz kimi işlənir: Polkörpü (1, s.16, 118) toponimi. Yeri gəlmişkən qeyd edək ki, bəzi yerdə körpü sözünün daha qədim variantı olan "köprü" işlənmişdir. Əsərdə bəzi söz birləşmələri Azərbaycan dilinə məxsus (təyini söz birləşmələri) ardıcıllıq üzrə işləndiyi halda (məs. yürüş meydan (1, s.137), Əli bulağı (1, s.185), altı para (1, s.263), doqquz para (1, s.263, 264, 266), doqquz yolum (1, s.171) bir başqaları izafət tərkibinə daxil edilmişdir: təpeye-Toxmaq xan, qəleyi-yüzbaşı və s.

Bəzən isə mürəkkəb söz və birləşmələrdə türk sözləri yanlış formada verilmiş və nəticədə tam anlaşılmazlıq yaranmışdır: məs. kitabda əksər yerlərdə Dəvə boynu (1, s.767) kimi işlənən birləşmə bəzi yerlərdə "dəh boynu kimi" (1, s.355) getmişdir ki, bu, heç bir məna vermir. Çox ehtimal ki, bu, katiblərin səhvi üzündən baş vermişdir.

"Cahanqoşayi-Nadiri"də "qara" təyini ilə işlənən toponimlər xüsusilə çoxdur: Qaraçəmən (1, s. 276), Qarabağ (1, s.616), Qaratəpə (1, s.654), Qaracadağ (1, s. 665), Qarakul (1, s.765), Qaraqorum (Xorasanın şimalında olan və türklər yaşayan bölgə) (1, s.49), Qaraçulan (1, s. 192) (Süleymaniyyənin şimal-şərqində yer adı), Qaracəngəl (Əfqanıstan) və s. Bizcə, bu mürəkkəb sözlərdə "qara" təyini rəng bildirməklə bərabər, böyüklük, əzəmət mənası da bildirir. Ümumiyyətlə, "qara sözü qoşulduğu sözlərdə müxtəlif mənalar ifadə edir. Misal üçün, təkcə qədim adlarda (Qaraxan, Qaragünə, Qarabudaq, Qaraca Çoban, Qaraçəkur və b.), istərsə də müasir adlarda (Qarakişi, Qarakazım, Qaravəli və b.) işlənmiş "qara" çoxanlamlıdır. Bir fikrə görə, adlardakı "qara" qədim xaqanlıqda xanların titulunu bildirirdi. Başqa bir fikrə görə isə, "qara" "başçı, böyük" mənasında da işlənmişdir" (7**).**

Fikrimizcə, yuxarıda sadaladığımız sözlərin əksəriyyətindəki "qara" məhz böyük və əzəmətli mənasında işlənmişdir. Çünki dağın rənginin qarası olması mümkünsə də, çəmənin qarasını təsəvvür etmək mümkün deyil.

"Cahanqoşayi-Nadiri" qarammatik şəkilçilərin də yeri tam müəyyənləşməyib, belə ki, türk sözlərinə çox vaxt fars dilində cəm bildirən "an" şəkilçisi əlavə edilmişdir: elçiyan (1, s. 728), çavuşan, qorçibaşiyan və s. Bəzən isə mətnin farsca olmasına baxmayaraq, söz cəm formasında "lər" şəkilçisi ilə işlənmişdir. 179-cu səhifədəki "haci-lər" sözünü buna misal göstərmək olar.

"Cahanqoşayi-Nadiri" də illərin hicri qəməri tarixinə müvafiq olaraq qədim türk təqvimi ilə verilməsi bəzi türk sözlərinin qədim variantlarının araşdırılması baxımından maraq doğura bilər. Məlum olduğu kimi,

on iki illik dövrə üzrə olan türk təqvimindəki illərin adları heyvanların adı ilə bağlı olmuşdur: Sıçğan (siçan), od (inək), bars (pələng), tuşğan (dovşan), luy (nəhəng), ilan (il), yunt (at), qoy (qoyun), piçi (meymun), təxaquy (quş), it, tonquz (donuz) ili. Onu bildirək ki, bu sözlərin bir neçəsi, ümumiyyətlə, müasir türk dilində işlənmir. Həmin sözlər yalnız təqvimdə qalmışdır: məs. "Yunt" qədim türk dilində "jund" kimi tələffüz olunmuş və "at" bildirmişdir (8, s.281); "Od", yaxud "ud" kimi tələffüz olunan il "inək"lə (8, s.605s.); lu, lun, lunq (qədim Çin dilindən türk dilinə keçib) 1. əjdaha və ya 2. ilanlla bağlı olmuşdur. Digər sözlərin isə, tarixi fonetik prosesini belə vermək olar: təxaqu - taqağu- toyuq (8, s.536), Qoy- qoj- qoç (8, s..453). "Piçi"-nin mənası isə heç bir lüğətdə izah edilməyib (Qədim türk lüğətində onun "çi" siz şəkli ilə qarşılaşdıq) (8, s. 397), onun ancaq ilin 4-cü ayı bildirməsi göstərilib. Diqqətlə fikir verdikdə, bu sözlərin bir çoxunun fonetik baxımdan tanınmaz dərəcədə dəyişdiyi aydın olur.

Bir sözlə, "Cahanqoşayi-Nadiri" farsca yazılmış mətn olmasına baxmayaraq, XVIII əsrin ortalarında türk (Azərbaycan) dilinin leksik-fonetik, morfoloji-sintaktik baxımdan öyrənilməsində əhəmiyyətli mənbədir. İranda XII əsrdən bəri sarayda farsca, orduda türkcə danışırdılar və bu İranda türk-fars qoşadilliyini yaradıb. Bunu öyrənmək dillərin və sözlərin tarixii anlamaq üçün mühüm bir yoldur. Ümumiyyətlə, müxtəlif dövrlərə aid fars mətnlərində türk-Azərbaycan sözlərinin öyrənilməsi və bu sahədəki boşluğun aradan qaldırılması dilimizin tarixi inkişaf yolunu izləmək, az işlək sözləri bərpa etmək üçün çox vacibdir (9).

## Ədəbiyyat:

1. Astrabadi Məhəmməd Mehdi bin Məhəmməd Nəsir, "Cahanqoşayi Naderi"yə. Seyid Abdullah Ənvarın müqəddiməsi, Tehran, Əncoməni Asar və məfaxeri-fərhəngi, 1377
2. Astrabadi Mirzə Mehdi xan Astrabadi, "Sənglax" kitabının müqəddiməsi, İran Milli Kitabxanasında qorunan 1141 saylı əlyazma nüsxəsi
3. Rəhim Əliyev, "Top" romanı haqqında", "Ədəbiyyat qəzeti", 13 oktyabr 2015-ci il.
4. Asif Hacıyev, "Dədə Qorqud kitabı": oxunuşlar, açımlar", Bakı, Elm, 2007, 214 s.
5. Yeni Tarama sözlüyü,Türk dil kurumu yayınları, Ankara, 1983, 476 s.
6. مجمع التواریخ , کتابخانه سنایی,کتابخانه طهوری, تهران, ۱۳۴۷
7. (https://az.wikipedia.org/wiki/Qara)
8. Древнеетюркский словарь, Ленинград, 1969, 676 с.
9. Zərinazadə H., Fars dilində Azərbaycan sözləri, Bakı, 1962.

## Specific features of Turkic words in «Dzhahangoshayi-Nadir "

### Summary

This article provides a critical analysis of Turkish words and expressions that have been used in the work "Cahanqoşayi-Nadiri" by Mirza Mehdi Khan Astrabadi- former Foreign Minister of Afshar country and Nadir Shah's secretary. Author based on named work traced the differences between the dialects and idioms of Turkish language, as well as lexical and phonetic changes that have occurred as a result of historical processes on a large areal hydronyms, toponyms and ethnonyms. The great analisys of comparison of linguistic units, gave the opportunity to make concrete conclusions about the development of language.

## Специфические особенности тюркских слов в «Джахангошайи-Надири»

### Резюме

В данной статье проводится критический анализ туркских слов и выражений , которые были использованы в произведении "Cahanqoşayi-Nadiri" Мирзы Мехди хана Астрабади, бывшего министром иностранных дел государства Афшаров и секретарём Надир шаха. Автор на основе, названного произведения проследил различие между диалектами и идиомами турецкого языка, а также лексические и фонетические изменения, произошедшие в результате исторических процессов, на большом ареале гидронимов,топонимов и этнонимов. В статье широкий анализ сравнения языковых единиц дал возможность сделать конкретные выводы о развитии языка.

**Rəyçi: prof. R.Novruzov**

**Səlimli Təmkinə Fərahim qızı**
Azərbaycan Dillər Universiteti

# AZƏRBAYCAN VƏ TÜRK DİLLƏRİNDƏ İŞLƏDİLƏN FRANSIZ MƏNŞƏLİ SÖZLƏR

***Açar sözlər:*** *fransız dili, müasir türk dili, alınma sözlər, lüğət tərkibi*
***Key words:*** *French language, modern Turkish language, loanwords, lexical content*
***Ключевые слова:*** *французский язык, современный турецкий язык, приобретаемые слов, лексический состав*

Hamımızın bildiyi kimi yer üzündə yaşayan bir çox millətlər və bu millətlərin danışdığı bir çox dillər mövcuddur. Xalqların, millətlərin bir-biri ilə əlaqəsi olduğu kimi dillərin də bir-birinə təsiri vardır. Müxtəlif xalqlar arasındakı mövcud olan əlaqələrdən danışan fransız dilçisi İ.Vandriyes yazir: "Heç vaxt elə ola bilməz ki, hər hansı bir dil uzun müddət xarici təsir olmadan inkişaf etsin, əksinə qonşu dillərin ona təsiri əksər hallarda həmin dilin inkişafında mühüm rol oynayır. Dillərin bir-biri ilə təmasda olması tarixi bir zəruriyyətdir və həmin təmas bir dilin digərinə müdaxiləsinə gətirib çıxarır" (4, s. 117).

Bu fikrə qüvvət olaraq deyə bilərik ki, lüğətin zənginləşməsində əsas rol oynayan amillərdən biri də alınma sözlərdir. Lakin elmin, texnikanın və insanlar arasında ünsiyyət vasitələrinin geniş inkişaf etdiyi müasir dövrdə müxtəlif dillərdə danışan xalqların bir-birinə yaxınlaşması, sosial dəyişikliklər arasında olan əlaqələr cəmiyyət və dil problemi baxımından hələ də kifayət qədər tədqiq olunmamış məsələlərdəndir.

Bu problemin öyrənilməsində müəyyən uğurların olmasına baxmayaraq, həll olunmamış bəzi məsələlər bu günə qədər qalmaqdadır. Bunların içərisində "sözlərin alınması mexanizminin araşdırılması", "alınma sözlərin semantik cəhətdən yeni dildə dəyişməsinin xüsusiyyətləri", "söz alınması prosesinin dinamikası", "dillərin birinin digəri ilə ən intensiv şəkildə yaxınlaşdığı dil səviyyələri və bu yaxınlaşmanın xüsusiyyətləri" və s. bu kimi məsələlərin daha dərindən tədqiq olunmasına ehtiyac vardır. Bununla əlaqədar olaraq bu və ya digər dildə olan alınma sözlərin tədqiqinə maraq getdikcə artır.

Tədqiqatçıların böyük əksəriyyəti tədricən belə bir nəticəyə gəlir ki, alınma sözlər dilin təkmilləşməsinə və inkişafına kömək edir.

Dil əlaqələri ilə məşğul olan tədqiqatçıların qohum dillər arasında alınma sözlər probleminə diqqət verilir. Alınma sözlər və onların qarşılıqlarının tapılması problemi cəmiyyətin tarixi ilə bağlı şəkildə tədbiq olunur.

Alınma prosesini fəal inkişafın ən yüksək nəticəsi hesab edən D.N.Şmelevin əcnəbi sözlərə münasibəti belədir: "Əcnəbi sözlərin alınması prosesi ikitərəfli prosesdir. Bu ancaq bir dilin hazır əlamətlərinin sadəcə olaraq başqa bir dilin ixtiyarına verilməsi demək deyildir. Bu, həm də həmin əlamətlərinin üzvi şəkildə alan dilin sistemi tərəfindən mənimsənilməsi deməkdir. Bu elementlərin həmin dilin xüsusi tələblərinə uyğunlaşması, yeni sistem şəraitində formal və semantik baxımdan dəyişməsi deməkdir" (4, s. 121).

Alınma prosesi mürəkkəb bir dil hadisəsidir və müşahidələr göstərir ki, türk dili və onun terminologiyası təkcə öz imkanları hesabına deyil, həmçinin digər dillərin leksik-terminoloji bazasından geniş miqyasda faydalanmaq əsasında inkişaf edərək formalaşmış və zənginlik qazanmışdır. Bu zənginləşmənin mənbələrindən biri də Avropa dillərindən ən çox da fransız dilindən keçən söz və terminlərdir. Fransız mənşəli sözlər, ümumiyyətlə, digər dillərdə olduğu kimi, türk dilinin də bütün təbəqələrində müəyyən bir iz buraxmış və dilin demək olar ki, bütün funksional üslublarında leksik-semantik çalarlıq yaratmışdır.

Müasir türk ədəbi dilinin lüğət tərkibinin zənginləşməsində alınma söz və terminlərin xüsusi yer tutduğu faktlar əsasında müəyyən edilmişdir. Belə ki, türk dilində işlənən alınma sözlərin çoxu ərəb dilindən sonra fransız dilindən alınma sözlərdir, yəni ərəb dilindən 6467, fransız dilindən 5253, fars dilindən 1359, ingilis dilindən 485, alman dilindən 98, rus dilindən 44 söz alınmışdır. Bu siyahını başqa dillərdən də alınmış sözlərin sayını göstərməklə uzada bilərik. Yəni türklərin Osmanlı Dövləti dövründə və sonra da başqa ölkələrlə həm tarixi, həm siyasi-iqtisadi münasibətləri olmuş və bu münasibətlər zamanı yeni sözlərin türk dili lüğətinə keçməsi gerçəkləşmişdir. Lakin türk dilinin daha çox təsiri altında qaldığı fransız dili olmuşdur. Xüsusilə, XVI əsrin birinci yarısından, Qanuni Sultan Süleymanın hakimiyyəti illərindən başlayaraq türklərin fransızlarla olan siyasi, ticari və elmi-ədəbi münasibətləri yüzillər sonra daha da genişlənmiş və Avropanı öz təsiri altına alan sənət, ədəbiyyat və elm dili olaraq qəbul edilən fransız dilinin türk dilinə olan təsiri dilin lüğət tərkibindəki yeniləşmə prosesində də öz əksini tapmışdır.

Türk alimləri göstərir ki, fransız dilinin türk dilinə geniş biçimdə daxil olmasının bir səbəbi də xüsusilə XIX əsrdə dilin sadələşdirilməsi məqsədilə atılan ərəb və fars sözlərinin yerinə fransız sözlərinin

alınması və bu prosesin çox qısa bir vaxtda inkişaf etdirilməsi idi. Türk ictimaiyyətində baş verən qərbləşmə sosial həyatın hər sferasında əks olunurdu və təbii ki, türk dili və mədəniyyətində də dərin izlər buraxırdı. Əvvəllər hakim olan ərəb və fars dili, daha sonra fransız dili XX əsrin II yarısından etibarən isə Türkiyənin Ingiltərə və ingilisdilli Qərbi Avropa dövlətləri, xüsusən Amerika ilə elmi-texniki və təhsil sahəsindəki əlaqələrinin böyük sürətlə inkişaf etməsi nəticəsində türkcəyə ingilis dilinin təsiri özünü hiss etdirir. Xüsusilə də son 30-40 ildə xarici ölkələrdə təhsil alınması və Türkiyədə ingilisdilli məktəblərin, universitetlərin açılması türk dilinə ingilis mənşəli sözlərin keçməsinə səbəb olur.

Fransız dili kənar dil kimi türk dilinin müxtəlif sferalarına öz müsbət və mənfi təsirini göstərmişdir. Fransız dilindən türk dilinə keçən terminlər müxtəlif elm sahələri ilə əlaqədardır. Məsələn, apatit, aragonit (geologiya), apokrif, antoloji (ədəbiyyatşünaslıq), apostrof, artikülasyon (dilçilik), aldehit, amonyum (kimya), akardeon, akompanyatör (musiqi), antrasit, arduvas (mineralogiya), arterit, bazofobi (tibb), astrofozik, galaksi (astronomiya), alotropi, akseleroqraf (fizika), amip, antilop (zoologiya), amitoz, alveol (biologiya) anomali, agnosi (psixologiya), ampirizm, amoralizm (fəlsəfə) və s.

Fransız mənşəli sahə terminləri dedikdə isə türk ədəbi dilindəki fransız alınmaları müxtəlif sahələr üzrə qruplaşdırılmış və təhlil edilmişdir. Sahə terminləri dedikdə maliyyə, idman, məişət, texnika, dəniz, nəqliyyat və rabitə, ictimai-siyasi məzmunlu söz və terminlər nəzərdə tutulur. Məsələn, *bankomat*, *adisyon* (maliyyə işləri), *duayen* (diplomatiya), *adres*, *adaptör*, *abonman* (rabitə), *aksona, armatör* (dənizçilik), *kolye, alyans* (zərgərlik) *amiral, garnizon* (hərbi sahə), *bisküvi, fritöz* (kulinariya) *dantel, büfe* (məişət) *arena*, *homologasyon* (ictimai-siyasi məzmunlu sözlər), *abondone*, *atletik*, *akrobasi* (idman) və s.

Bundan başqa məlum olduğu kimi, hər hansı bir elm sahəsində terminlərin müəyyən edilmiş bir mənası olur. Lakin bəzi hallarda eyni termin bir çox sahələrdə və ya eyni termin eyni sahədə müxtəlif mənalarda işlənir. Fransız dilindən Türkiyə türkcəsinə keçən terminoloji vahidlərin bir qismi də müştərək terminlərdən ibarətdir. Bunlara ortaq terminlər də demək olar. belə terminlər müxtəlif elm və sahə sferalarında işlənərək mənaca fərqli cəhətlər yaradıblar. Məsələn, “argüman” sözü fransız dilində “argument” sözüdür. Bu sözdən beş mənada müxtəlif sahələrdə istifadə olunur: 1) hüquq sahəsində: dəlil, sübut, əsas; 2) fəlsəfədə: iddia; 3) astronomiya: bərabərləşdirmə və ya göy cisminin hərəkətinə aid hər hansı bir dəyər; 4) riyaziyyatda: dəyişən kəmiyyət; 5) yenə riyaziyyatda: bir cədvəldə hər hansı bir sayın dəyərini tapmaq üçün istifadə olunan rəqəm. Aksiyon fransız dilində «action» termini yeddi sahədə və mənada işlənir. Məsələn: 1) hər hansı bir maddi amilin və ya düşüncənin ortaya çıxması; 2) insan fəaliyyəti və iradəsinin ifşa edilməsi; 3) hərəkət, iş; 4) ticarətdə: sərmayənin bir hissəsi; 5) yenə ticarətdə: hissə sənədi, pay sənədi; 6) teatrda: bir aktyorun səhnə üzərindən hərəkəti, bu hərəkətdən ortaya çıxan inkişaf; 7) teatrda oyunun məzmununu inkişaf etdirən hadisə, hekayə. Belə nümunələrdən çox gətirmək olar, lakin mən müasir türk dilində çox sıx işlənən fransız mənşəli sözləri vermək istərdim.

*asansör – fr. (ascenseur) – lift; diyet – fr. (diète) – pəhriz; benzin – fr. (bensine) – benzin; bikini – fr. (bikini) – çimərlik paltarı; kuaföz – fr. (coiffeur); ambulans – fr. (ambulance) – təcili tibbi yardım; küvet – fr. (cuvette) – ləyən (əl-üz yuyan); helikopter – fr. (hélicoptère) – vertalyot; gazoz – fr. (gazeuse) – qazlı su; misket – fr. (mousquet) – silah; otel – fr. (hôtel) – otel; külot – fr. (culotte) – qısa şalvar; prenses – fr. (princesse) – şahzadə; mayo – fr. (maillot) – mayka; monitör (moniteur) – ekran; plastik – fr. (plastique) – plastik; makyaj – fr. (maquillage) – makiyaj; serum – fr. (serum) – sistem (tibb) istasyon – fr. (station) – dayanacaq; otogare – fr. (auto-gare) – vağzal; bagaj (bagage); bale (ballet); banknot (bank-note); bateri (batterie); bijuteri (bijouterie); fayton (phaéton); gardirop (garde robe); garson (garçon); gitar (guitar); kaktüs (cactus); lazer (laser); komando (commando); mağaza (magasin); manken (manquin); maske (masque) və s.*

Bu sözlərin sayını çox uzada bilərik, lakin çox işlək olan bu sözləri yazmaqda əsas məqsədim sözlərin içərisində nə qədər çox sözün Azərbaycan dilində də işlədildiyini göstərməkdir. Bu sözlərin çoxunun mənasını bilirik. Azərbaycanlılar XIX-XX əsrlərdə oxumaq, təhsilini artırmaq üçün Fransaya üz tutmuş, Bakıda, Tiflisdə, Rusiyada və bir çox böyük şəhərlərdə olan məktəb və təhsil ocaqlarında fransız dili əsas aparıcı dil kimi tədris olunmuşdur. Hal-hazırda ingilis dili, rus dili öyrənilən əsas dillər olduğu kimi fransız dilini bilmək də təhsilli olmağın göstəricisi kimi qəbul olmuşdur. Bu dövrlərdə hətta indiyə kimi moda, dizayn, parfümeriya, dekor barədə danışarkən mütləq fransız sözlərindən istifadə olunur. Diqqət etdiyimiz kimi bu sözlər özü də fransız dilindən alınmış sözlərdir. Türk dili və Azərbaycan dilinin alınma söz və terminlərini müqayisə etdikdə belə bir qənaətə gəlirik ki, fransız mənşəli terminlər türk dilinə bilavasitə (birbaşa), Azərbaycan dilinə isə daha çox dolayı yolla daxil olmuşdur. Türk dilindən fərqli olaraq rus dili fransız mənşəli terminlərin Azərbaycan dili terminologiyasına daxil olmasında vasitəçi rol oynamışdır. Hətta fransız dilini bilməyənlər bu sözlərin rus dilindən alınmış sözlər olduğunu zənn edirlər. Türk dilində çox sıx işlənən sözlərin içərisində bizim də işlətdiyimiz nə qədər çox söz olduğunu gördük. Bundan əlavə *ansambl,*

*abunəçi, anket, avtobus, büro, komod, desert, divan, elektrik, fond, lampa, menyu, mineral, partiya, pilot, pyes, restoran, süjet, titul, turist, otel, vizaj, vizajist, stil, park, bulvar* və s. Yəni bu siyahını bir qədər də artırmaq mümkündür. Elə sözlər vardır ki, elmin-texnikanın, modanın inkişafı ilə bağlı olaraq dilimizə keçmişdir. Bəzilərinin öz ana dilimizdə qarşılığı var, bəziləri isə alınma termin kimi qalır və dilimizdə işlədilir.

Türk dilindəsə fransız mənşəli alınma sözlərin sayı o qədər çoxdur ki, müasir gənclər bu sözlərin qarşılığı olduğu halda əcnəbi sözlərin, yəni fransız və ingilis dillərindən alınmaş sözlərə üstünlük verirlər. Məsələn, «buluşma» sözü varkən «rendevu» (randez-vous), «bavul» sözü varkən «valiz» (valise), «şalvar» sözünü işlətmək yerinə «partalon» və s. Bu sözlərin sayını çox uzatmaq olar, lakin türk dilində, yaxud Azərbaycan dilində bu sözlərin qarşılığı varsa ana dilindəki sözlərimizdən istifadə etmək dilimizin pozulmamasına səbəb olar və türkdilli ölkələr arasında olan sözlərin fərqini azaldar. Belə ki, dilimizin inkişafı nəticəmində alınma terminlərin bir hissəsi dilin öz daxili imkanları hesabına düzəldilən neologizmlərlə əvəzlənməyə başlamışdır. Bunun bütün türkdilli ölkələri əhatə etməsi çox məqsədə uyğun olardı.

### Ədəbiyyat:

1. Aksoy Ömer Asım. Gelişen ve Özleşen Dilimiz. Ankara: A.Ü.Basınevi, 1963, 27 s.
2. Xəlilova İ.N. İnternasional terminlər. Bakı: Maarif, 1991, 192 s.
3. Xudiyev N. Azərbaycan ədəbi dilinin zənginləşmə yolları. Bakı: ADPU, 1987, 84 s.
4. Məmmədova N.Y. Çağdaş Türk dilinə fransız dilinin təsiri. // Filologiya məsələləri. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutu. Bakı, 2007, № 4, s. 113-122

### The words of French origin used in Turkish and Azerbaijani languages

**Summary**

One of the important reasons of enrichment of the language is loanwords in vocabulary of Turkish and Azerbaijani languages. Creation of loanwords in Modern Turkish and Azerbaijani languages is one of the most productive and modern methods. Today there are numerous words of french origin used in this languages.

### Слова французского происхождения, используемые в турецком и азербайджанском языках

**Резюме**

Статья посвящена использованию заимствованных из французского языка слов в азербайджанском и турецком языках. Отмечается что, заимствование из других языков является одним из способов обогащения языка. Автором установлено что в настоящее время в турецком и азербайджанском языках используется огромное количество слов, взятых из французского языка.

**Rəyçi: dos. S.Allahyarova**

**Seyidova Vəfa Mirəhməd qızı**
Azərbaycan Dillər Universiteti

# XÜSUSİ ADLARIN FRANSIZ DİLİNDƏN TƏRCÜMƏ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *transformasiya, transliterasiya, transkripsiya, xüsusi adlar, tərcümə*
***Key words:*** *transformation, transliteration, transcription, proper names, translation*
***Ключевые слова:*** *трансформация, транслитерация, транскрипция, собственные имена, перевод*

Coğrafi adları bəşəriyyətin mənəvi mədəniyyətinin ən qiymətli abidələrindən biri hesab etmək olar. Onlar nəsildən-nəslə ötürülərək dövrümüzə qədər gəlib çatmışdır. Coğrafi adların informasiya potensialı çox böyük və müxtəlifdir. Hər bir ad özündə istinad etdiyi obyektin müəyyən xüsusiyyətini daşıyır. Bu, tarixi, coğrafi və linqvistik problemlərin həllində, məsələn, obyektin tarixən harada yerləşməsi, hansı xalqa məxsus olması haqqında mühüm rol oynayır.

Bu məqalədə bəzi fransız toponimlər və antroponimləri araşdırılır.

Toponim və antroponimlərin bir dildən başqa dilə transformasiyası zamanı qarşıya, əsasən, iki problem çıxır. Bunlardan birinə onların tələffüzü zamanı, digərinə isə yazılışı və ya qrafik ifadəsi zamanı rast gəlmək olur. Hər iki problemin həll edilməsi bu sahə üzrə mütəxəssislərin qarşısında böyük vəzifələr qoyur. Aydındır ki, coğrafi adların şifahi səslənmə yolu ilə əmələ gəlməsi əsas rola malikdir və xronoloji nöqteyi-nəzərdən daha qədim tarixə söykənir.

Xüsusi adlar fransız dilindən tərcümə edilərkən (insan və coğrafi adlar, idarə, təşkilat, qəzet və bu kimi bir çox adlar), bir qayda olaraq aşağıdakı üsullardan istifadə edilir: 1) tərcümə; 2) transliterasiya; 3) transkripsiya.

Bu adların tərcüməsi zamanı digər üsullardan fərqli olaraq tərcümə üsulundan çox nadir hallarda istifadə olunur, məsələn, təşkilat adları və coğrafi adların bəzi əhəmiyyətli elementləri (*Bas-Rhin* `Aşağı Reyn`, *la Chin* `Çin`), adətən, tərcümə edilir. Şəxs adlarının da milli ekvivalentlərinə rast gəlmək olur: *Léon* `Lev`, *Jean* `İohan`, *Luis* `Lüdovik`.

Lakin antroponim və toponimlərin tərcüməsinin və ya onların ekvivalentlərinin Azərbaycan dilində verilməsi sovet quruluşu dövründə kiril əlifbasından istifadə olunan zamanlara məxsus bir üsuldur ki, bu hal-hazırda da bəzən istifadə olunur. Müasir dövrdə Avropa standartlarının tələbinə uyğun olaraq latın əlifbası istifadə olunan dillərdə xüsusi adlar, əsasən, olduğu kimi də verilməlidir.

Transliterasiya ([lat. trans `*vasitəsilə*` və littera `*hərf*`] - Bir əlifbanın hərflərinin başqa əlifbanın hərfləri ilə verilməsi) zamanı tərcümə edilən adlar faktiki tələffüzdən kənar qalaraq həmin dilin əlifbasına uyğun olaraq digər dilin əlifbası ilə verilir. Tərcümə zamanı transliterasiya üsulundan XVIII-XIX əsrlərdə istifadə olunmağa başlanmışdır. Buna misal olaraq göstərmək olar ki, məsələn, həmin zamanlar Didro əvəzinə Diderot (*Diderot*), Beranje əvəzinə Beranjer (*Béranger*) kimi yazırdılar.

Müasir dövrdə xüsusi adların tərcüməsi zamanı istifadə olunan üsullardan biri də praktik transkripsiya, yəni sözlərin digər dildə səsləndiyi kimi yazılmasıdır. Xüsusi adların bu cür təqdim olunması təqribi xarakter daşıyır, çünki Azərbaycan və fransız dillərinin fonem sistemi heç də həmişə üst-üstə düşmür.

Xüsusi adların fransız dilindən Azərbaycan dilinə dəqiq verilməsi üçün ilk növbədə bu sözün fransız dilində düzgün oxunuşunu bilmək lazımdır. Fransız dilində xüsusi adların oxunuşunda çox tez-tez ümumi qaydadan kənarlaşmalara, qədim orfoqrafiya qalıqlarına rast gəlinir. Buna görə də bu və ya digər xüsusi adın dəqiq tələffüzünü yalnız məlumat mənbələrindən əldə etmək mümkün olur.

Bundan əlavə, fransız dilində səslənən adın Azərbaycan dilində hansı orfoqrafiya ilə daha dəqiq verilməsini, defislərin, apostrofların, baş hərflərin işlədilməsi, sözün ayrı və ya bitişik yazılması qaydalarını bilmək zərurəti də meydana çıxır.

Xüsusi mənaya malik bəzi *Mon Blan, For Maon, Por Lui, Por Növ* kimi coğrafi adlar, adətən, tərcümə edilmir.

Coğrafi adların tərkibinə daxil olan sözönülər və bağlayıcılar da tərcümə edilmir, onlar digər dillərə transkribasiya vasitəsilə keçirlər. Məsələn, *La neuville-devant-Nancy* `Lanövil dövan Nansi`; *Grez-en-Bouère* `Qrez-an-Buer`; *Dives-sur-Mer* - Div sür Mer.

Xüsusi adların tərcüməsi zamanı departamentlərin yerləşdiyi ərazini ifadə edən sözlər tərcümə edilir: *Haute-Marne* `Yuxarı Marna`; *Bas-Rhin* `Aşağı Reyn`; *Alpes Maritimes* `Sahilyanı Alp`; *Pyrénées-Orientales* `Şərqi Pireney`.

Departament adlarının tərkibinə daxil olan digər ünsürlər isə tərcümə edilmir: *Bouches-du-Rhône* `Buş dü Ron`; *Côte-d'Or* `Kot Dor`; *Nord* `Nor`.

Bəzi fransız coğrafi adları Azərbaycan dilində səsləndikləri kimi də tələffüz edilir: Nant, Tuluz, Havr.

Fransız küçə, meydan və məşhur görməli yer adları, adətən, tərcümə edilir: *Les Champs Elysée* \`Yelisey çölləri\`; *Boulevard Sébastopol* \`Sevastopol bulvarı\`; *Place de Concorde* \`Konkord meydanı\`; *Bois de Boulogne* \`Bulon meşəsi\`. Lakin bəzən bu adların hədəf dilində səsləndirildikləri kimi adlandırıldıqlarını da eşıtmək olur.

Əhəmiyyətli dərəcədə tanınmayan yer adları isə tərcümə edilmədən verilə bilir. Məsələn, *Rue du Bac* \`Rü dü Bak.

Qəzet, jurnal və ictimai təşkilatların adları da tərcümə edilmir, lakin onların qarşisinda olan artikl buraxılır: *L'Humanité* \`Ümanite\`; *Le Point* \`Puan\`.

İdarə adları tərcümə edilir: *La Banque de Paris* \`Paris bankı\` və *La Banque des Pays-Bas* \`Niderland bankı\`.

Kütləvi qurumlar və siyasi partiyaların adları tərcümə edilir: *La Confédération Générale du Travail* \`Ümumi Əmək konfederasiyası\`.

Abbreviasiyaların da tərcümə olunmuş formaları verilir: *ONU* \`BMT\`; *USA* \`ABŞ\`; *OTAN* \`NATO\`.

**İnsan adlarının tərcüməsi**

İnsan adları səsləndikləri kimi verilir: *Robert* \`Rober\`; *Gustave* \`Qüstav\`.

Qadın adları Azərbaycan dilində verilərkən çox tez-tez **-a** şəkilçisini qəbul edir: *Marguerite* \`Marqarita\`; *İsabelle* \`İzabella\`. Lakin istisna təşkil edən Süzan, Marian, Madlen, Sesil, Nikol, İren, Lüsi kimi adlara da rast gəlmək olur.

Fransız krallarının və onların ləqəbləri bir qayda olaraq tərcümə edilir: *Clovis* \`Xlodvik\`; *Charle Magne* \`Böyük Karl\`.

Fransa ərazisindən kənarda olan coğrafi adların fransız dilindən tərcüməsi zamanı bu adlar fransız dilində səsləndikləri kimi deyil, həmin ərazidə yaşayan xalqların dilində səsləndikləri kimi verilir: Tisiyan, Venesiya, Plasensa.

Fransızlar çox hallarda Almaniya ərazisində olan yer adlarını da öz dillərinə uyğun olaraq adlandırırlar. Bu yerlərin adlarını da Azərbaycan dilinin qanunlarına uyğun olaraq vermək lazımdır: *Bavière* \`Bavariya\`, *Bade* \`Baden\`, *Forêt Noire* \`Şvartsvald\`, *Rhénanie* \`Reyn vilayəti\`, *Trève* \`Trir\`.

Belçika və İsveçrə ərazisində yerləşən coğrafi yerlərin adları səsləndirilərkən daha çox çətinliklərə rast gəlmək olur. Belçika ikidilli ölkədir: vallunlar fransız dilində, flamandlar holland dilində danışırlar. Bu səbəbdən də çoxlu Belçika coğrafi adları eyni zamanda iki cür, yəni fransız və holland variantında səsləndirilir. Məsələn, *Liège* \`Luik\` = \`Lyej\` ; *Malines* \`Mechelen\` = \`Malin\`; *Anvers* \`Anrwerpen\` = \`Antverpen\`; *Gand* \`Gent\` = \`Gent\`.

Cənubi Belçika (valun) adlarının müasir dövrdə, əsasən, fransız variantından istifadə edilir: Lyej, Namyur. Şimali Belçika (flamand) adlarının isə holland variantından istifadə edilir: Antverpen, Gent. Bütün ölkə ərazisini kəsib keçən iki çayın hər birinin iki adı vardır: Esko (Şelda) və Myez (Maas).

Çoxdilli İsveçrədə də analoji vəziyyət mövcuddur. Burada fransız adları yalnız ölkənin fransız dilli əhalisi yaşayan hissəsində istifadə edilir: Cenevrə bölgəsi, Vo.

Coğrafi adların transformasiyası zamanı xüsusi diqqət tələb edən bütün yuxarıda sadalanan qaydalardan başqa bəzi istisna hallara da rast gəlinir:

1. Fransız dilində olmayan nəşrlərin adları çap edildikləri dildə səsləndirildiyi kimi verilir ( artikl buraxılır): *Times* \`Tayms\`; *Der Spiegel* \`Şpiqel\`.

2. Bəzi hallarda isə ənənəvi olaraq adlandırma fransız dilinin təsiri altinda baş verir: Magellen, Don Kixot, Don Juan.

Yuxarıda sadalananlara istinad edərək qeyd etmək lazımdır ki, xüsusi adlar tərcümə sahəsində mühüm rola malikdir, yaşadığımız polilinqvizm dövründə onların tərcüməsi, yəni bir dildən digər dilə keçirilməsi zamanı xüsusi qaydalara çox diqqətlə riayət etmək lazımdır.

**Ədəbiyyat:**

1. Bayramov Q. Tərcümə sənəti. Bakı, 2008.
2. Иванович В.А. Имя собственное в многоязычном мире. М.: РЕБУС, 1998.
3. Каспенко П.К. Теория перевода. М.: АСТ, 2001.
4. Носков Л.А. Путешествие по миру: языки. М.: АЗБУКА, 2004.
5. http://www.lingvoinfo.com/link=76
6. http://www.rolemancer.ru/sections.viewarticle&artid=2211

**Translation of proper names from French**
**Summary**

The article deals with matters concerning the transformation of proper names from the French language.

It also deals with the problems which emerge the transformation of these names by means of transcription and transliteration.

The article speaks at the same time about the distinctive features of proper names, and about their French prononciation in Azerbaijani. The research has been carried out on the bases of the materials of the French and Azerbaijani languages.

**Особенности перевода собственных имён с французского языка**
**Резюме**

Данная статья посвящена именам собственным и способам их перевода с французского языка на азербайджанский.

В ней описываются особенности перевода наименований имён собственных, проблемы, возникающие при переводе этих названий путём транскрипции и транслитерации.

Рассматриваются также отличительные черты имён собственных и способы точной передачи французского произношения имён собственных на азербайджанский язык.

**Rəyçilər: prof.Q.Bayramov, dos.İ.Əmirbəyov**

## ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ

**Золина Нигяр Чингиз гызы**
Самарский государственный социально-педагогический университет

# «ЗАРУБЕЖНЫЙ РОМАН О ЗОЛУШКЕ» (НА ПРИМЕРЕ РОМАНА ДЖ.ОСТЕН «ГОРДОСТЬ И ПРЕДУБЕЖДЕНИЕ»)

***Ключевые слова:*** *любовный роман, синдром Золушки, архетип, массовая литература*
***Açar sözlər:*** *sevgi romanı, Zoluşka sindromu, arxetip, kutləvi ədəbiyyat*
***Key words:*** *romance novel, «Cinderella's syndrome», archetype, mass literature*

Многие исследователи – литературоведы, культурологи, социологи, философы – отмечают важность сказок для понимания текущего состояния того или иного общества. Поскольку именно сказки формируют в нас базовые стереотипы в самой примитивной форме. По словам Кэрол Келли: «сказки изучаются с целью <…> выявления изменений ценностей с течением времени».(7. с. 87). А С.Ю. Барсукова афористически замечает: «По тому, каков женский кумир данного общества, можно сказать, что это за общество, каковы его цели и какими средствами общество пытается их реализовать» (1. с. 105). Многие литературоведы отмечают сходство сказки и популярного дамского романа. Нортроп Фрай считает, что и сказка, и популярный роман – это ответвления одной повествовательной традиции: «romance», средневековых рыцарских романов, в центре которых была любовная линия. Фрай называл сказки «наивным romance», а романы – «сентиментальным romance» (5. с.3). .О. Вайнштейн поддерживает теорию своих коллег: «архетипической для розового романа в большинстве вариантов является сказка о Золушке со всеми её перипетиями» (2. с.311). Аналогичного мнения придерживается и Е.Тараненко: «Женская проза в том числе не исчерпывается столь упрощенно выхолощенным архетипом Золушки. Вот дамский роман – целиком и полностью».

Сказка о «Золушке» – одна из самых популярных сказок в мире. По разным данным, существует от 345 до 700 версий данной сказки. Например, Мэриан Кокс британская исследовательница опубликовала работу в 1891 году, которая называется «Золушка: 345 вариантов». А Кэрол Келли приводит сведения, согласно которым существует около 700 разновидностей этого мотива (7. с. 3). Дж. Джейкобс писал, что суть сюжета о Золушке состоит в подъеме по общественной лестнице девушки за счет удачного брака. Он даже предлагает именно так, описательно, и называть этот сюжет: «Золушка, или Удачный брак всеми презираемой служанки при помощи феи, являющейся в виде животного, и в результате испытания с туфелькой» (Cinderella, or the Fortunate Marriage of a despised Scullery-maid by aid of an Animal Godmother through the Test of a Slipper) (6. с.273).

Один из наиболее популярных дамских романов XIX в. – «Гордость и Предубеждение» Джейн Остен. Все знают, что первым, кто поднял тему Золушки в романе Джейн Остен «Гордость и предубеждение», был Ричард Олдингтон,(8. р.4) английский поэт, прозаик и литературный критик. Он с иронией сравнил положение Элизабет по отношению к Дарси с положением Золушки.

Не все приемлют подобное сравнение, так как прямолинейная и смелая, обладающая незаурядным чувством юмора, независимостью суждений, Элизабет, совсем не похожа на покорную и кроткую героиню западноевропейской сказки. И всё же, присмотревшись, можно найти параллели для данного ироничного сравнения.

Начнём с того, что семейное положение наших героинь обнаруживает несомненное сходство. Элизабет была, как и Золушка, любимицей отца, который называл её одну своей крошкой и считал, что «..в Лиззи немножко больше толку, чем в её сёстрах»(3. с.7), что касается матери, то «Миссис Беннет любила Элизабет меньше других дочерей»(3. с.117). Как и у Золушки, у Элизабет были взбалмошные избалованные матерью сёстры, но, помимо их, была замечательная старшая сестра и подруга.

Между Дарси и Элизабет социальная и культурная пропасть была не меньше, чем между Золушкой и её прекрасным принцем. Хоть они оба и принадлежали к одному дворянскому сословию, Дарси был владельцем имения, приносящего ему десять тысяч фунтов годового дохода, в то время как отец Элизабет был не богат. Его имение приносило ему всего две тысячи годового дохода, а значит, приходилось быть скромным в расходах на воспитание и образование дочерей, полагаю-

щимся детям его сословного круга по меркам того времени. Он не мог их обеспечить должным приданным, даже его имущество и скромные земельные владения наследовались, согласно закону о майорате, по мужской линии. По всему выходило, что в случае смерти отца, все женщины семейства Беннет оставались без крова над головой.

Скромность доходов мистера Беннета отразилась и на образовании дочерей. Они никогда не воспитывались гувернанткой, не занимались регулярно музыкой и рисованием, что вызвало в своё время шок у тёти Дарси – леди Кэтрин де Бёр. Отсюда, возможно, и вытекает то свободомыслие и свободолюбие, что присуще Элизабет. По её словам «те из нас, кто хотел учиться, имели для этого всё, что требовалось. Нас всегда поощряли к чтению, и у нас были необходимые учителя. Конечно, если одна из нас предпочитала бездельничать, для этого у неё оставалась полная возможность»(3. с.183). А поскольку Элизабет-то как раз и не бездельничала, то к вышеперечисленным качествам обладала неплохим кругозором, начитанностью, что влияло на её речь и манеры, и что, в свою очередь, привлекло к ней внимание мистера Дарси и выгодно оттенило её в его глазах на фоне младших сестёр и матери. «Я полюбил вас за ваш живой ум»(3. с.413) - позже скажет ей Дарси. И Элизабет, со свойственным ей юмором и задором, прокомментирует: «Вы вполне можете называть это дерзостью. Да оно почти так и было. Ведь в том дело и заключалось, что вам опротивели любезность, внимательность и угодничество, с которым к вам относились все окружающие. Вас тошнило от женщин, у которых в мыслях, в глазах и на языке была лишь забота о том, как заслужить вашу благосклонность. Я привлекла ваше внимание к себе именно тем, что оказалась вовсе на них не похожей» (3. с.413)

И всё же самая главная пропасть между нашими героями – пропасть культурная. И если в сказке для влюблённого принца ничто не имело значения, кроме любви к своей избраннице, то Дарси и Элизабет пришлось немало потрудиться ради своего счастья, преодолев и гордость, и предубеждение, формированию которого у Дарси по отношению к Элизабет способствовала вульгарность её семейства, в частности, матери и младших сестёр. По мнению Н.М. Демуровой, «Гордость Дарси не только сословная, это гордость умного, образованного и волевого человека, сознающего своё превосходство над окружающим обществом. Его гордость, так же как и у Элизабет, ведёт к предубеждению: он предубеждён против семейства Беннет, так как они не ровня ему ни по общественному положению и состоянию, ни по уму, ни по образованию, ни по силе характера». И с ней сложно не согласиться.

Для того, чтобы счастливо воссоединиться с Элизабет, ему придётся не только рассеять то заблуждение, в котором пребывает она. Но и переосмыслить свои принципы и взгляды на гордость, поставив любовь к своей избраннице превыше всего.

Как и мачеха Золушки, миссис Беннет озабочена лишь одним – выдать замуж своих дочерей, и чем богаче и состоятельнее будет жених - тем лучше. Чувства дочерей при этом её мало волнуют, чему служит доказательством разразившийся скандал после отказа Элизабет мистеру Коллинзу. «Но я вам вот что скажу, дорогая мисс Лиззи, - резюмирует она, - ежели вы себе вбили в голову, что можете и впредь отказывать всякому жениху, кто бы к вам ни посватался, то вы и вовсе не выйдете замуж! И клянусь вам, мне неизвестно, кто станет о вас заботиться, когда умрёт ваш отец. Мне это будет не под силу, запомните. С этого дня я с вами покончила. Больше я с вами не стану разговаривать..» (3. с.127)

В отличие от сказочной мачехи, мисс Беннет не злой персонаж, просто она очевидно глупа, недалека и бестактна, самодурна, тем не менее, наличие такой матери может быть не меньшим источником страданий для девушки. Что касается отца, то это был образованный и интеллигентный человек, спокойный и рассудительный, однако, он совсем не прилагал усилий, чтобы обуздывать характер своей жены и младших дочерей. Как пишет Остен, «Мистер Беннет связал свою судьбу с женщиной, привлекшей его молодостью и красотой, а также мнимым добродушием, впечатление о котором нередко бывает создано только названными выше внешними качествами. Ещё в самом начале их брака эта женщина узостью взглядов и ограниченным развитием уничтожила в нём всякое чувство истинной супружеской привязанности. Уважение, доверие, духовная близость исчезли навсегда, а вместе с ними рассеялись все надежды на семейное счастье»(3. с.258). Ценя свой душевный комфорт и спокойствие, он абстрагировался от всех проблем связанных с их поведением дома и в обществе, предпочитая воспитанию подшучивание над своим женским семейством, что тоже неоднократно приводило к достаточно постыдным моментам в жизни Элизабет.

Вот такой краткий социальный, семейный, культурный анамнез красноречиво показывает в каком неравном положении находилась Элизабет перед Дарси, и, разумеется, с иронией вполне

можно назвать Элизабет Беннет Золушкой. Хотя, конечно, сама она, её характер, более подходят описанию той женщины, которая создала её как персонаж – несравненной Джейн Остен. Но судьба закончилась счастливее, чем судьба писательницы, она завершилась в духе сказки, где любовь всегда преодолевает все преграды.

**Литература:**

1. Барсукова С.Ю. «Золушки» советской и постсоветской эпохи // Рубеж. Альманах социальных исследований. 1998. № 12. С. 92-105.
2. Вайнштейн О. Розовый роман как машина желаний // Новое литературное обозрение. 1996. № 22. С. 303-331.
3. Джейн Остен «Гордость и Предубеждение» Изд. Аст. М. 200
4. Поршнева А.С, Бороненко А.В. Зарубежный «Роман о Золушке»: к истории вопроса//Вестник Чувашского университета. 2012. №2, с. 341-351.
5. Frye N. The Secular Scripture. Cambridge; Mass.: Harvard University Press, 1976. 199 p.
6. Jacobs J. Cinderella Britain // Folklore. 1893. Vol. 4, № 3. P. 269-284
7. Kelley K. A modern cinderella // The Journal of American Culture. 1994. Vol. 17, № 1. P. 87-92.
8. Richard Aldington «Jane Austen» /Ampersand Press, 1948

**Zoluşka haqda əcnəbi roman (C.Ostenin “Qürur və qərəz” romanı əsasında)**

**Xülasə**

Bu məqalə "Zoluşka haqqında xarici roman" mövzusuna həsr olunur,həmçinin Zoluşkanın arxitipi folklordan ədəbiyyata qədər nəzərdən keçirilir.Məqalədə əsas diqqət C.Ostinin "Qürur və qəraz" romanına yetirilir.Burada roman və nağılların qəhrəmanlarının müqayisəli analizi aparılır,onların oxşar və fərqli xüsusiyyətləri aşkar olunur.

**Foreign Cinderella novel (“Pride and Prejudice” novel used as example)**

**Summary**

The article focus on the question named: “Foreign Cinderella novel”. The article considered the archetype of Cinderella, from folklore to literature. It pays particular attention to Jane Osten’s novel: “Pride and prejudice”. We’re providing comparative analysis of novel and fairytale’s characters, identify similarities and differences between them.

**Рецензент: проф. Е.В.Абрамовских**

**Rəsuli İradə Qafur qızı**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetini

# AZƏRBAYCAN MÜHACİR ƏDƏBİYYATI HAQQINDA

***Açar zözlər:*** *mühacirət, vətən, vətənpərvər, simpozium, milli mədəniyyət*
***Key words:*** *emigration, motherland, patriot, symposium, national culture*
***Ключевые слова:*** *эмиграция, родина, патриот, симпозиум, национальная культура*

Azərbaycan mühacir Unlike ancient and medieval times, immigrants who were deported from their homeland shared their pains, fighting for national independence, fighting for national unity and calling their compatriots to national unity, which is a real patriotic example.əti qədim və keşməkeşli bir tarixə malikdir. Doğrudur, siyasi mühacirlər həm qədimdə, həm orta əsrlərdə və həm də yeni dövrdə olmuşdur. Lakin bu mühacirlərin bir qrupu vətəndən uzaqlarda yaşasalar da, xalqın istiqlaliyyəti uğrunda mütəşəkkil iş aparmamış, bir qismi isə sadəcə hakimiyyətdən salındıqları üçün itirilmiş vəzifələrini geri qaytarmaq üçün zəif mübarizə etmişdilər. "1917-1918-ci illərə qədərki Azərbaycan mühacirətinin Türkiyə, İran və Avropa ölkələrində Azərbaycan istiqlalı problemlərini təbliğ etməsi, Azərbaycanda türkçülüyün və qabaqcıl ictimai-siyasi fikrin yayılmasındakı müsbət rolunu qeyd etməklə yanaşı, onu da göstərməliyik ki, bu dövr Azərbaycan mühacirəti azsaylı olmuş, ümumiyyətlə, epizodik xarakter daşımış, yaxşı təşkilatlanmamışdı"[1].

Qeyd edək ki, xalqımızın milli istiqlaliyyət mübarizəsi mühacirət hərakatının tarixi ilə bağlı olmuş və xüsusilə 20-30-cu illərdə həm Türkiyədə və həm də Avropanın bir sıra ölkələrində Azərbaycan mühacirətinin fəaliyyəti daha geniş olmuşdur.

Aprel işğalından sonra Azərbaycanın vətənpərvər ziyalıları yer üzünə səpələndi. Onlar "Vətən", "Millət", "Azərbaycan", "Azadlıq", "İstiqlaliyyət" sözləri üstündə "Vətən xaini" damğası ilə doğma diyardan didərgin salındı. Bir çox ziyalılar Avropaya – Parisə (Ə.M.Topçubaşov, C.Hacıbəyli, M.Məhərrəmov və b.) getdilər və burada geniş fəaliyyət göstərdilər. Bir sıra həmvətənlərimiz isə Türkiyədə özlərinə sığınacaq tapdı və bu ölkə bütün dünyaya səpələnən Azərbaycan mühacirətinin mərkəzi oldu.

"Ən ağır sınaqlardan keçən milli təəssübkeşlik qeyrəti mühacir ziyalıların, yazıçı, alim, jurnalistlərin fəaliyyətinin istiqamətverici sükanı olmuşdur. Damarlarında Azərbaycan qanı dövr eyləyən, gözünü qürbətdə açmış nəsillər də öz atalarının, babalarının yolunu davam etdirmişlər. Hamılıqla üzü Azərbaycana doğru yatmışlar, ayılanda da üzü Azərbaycana doğru salavat çevirmişlər. Əsasən Türkiyədə, eləcə də Almaniya, İngiltərə, İspaniya, İsveçrə, həmçinin Amerikada yaşayan azərbaycanlıların vətəndə qoyub gəldikləri öz doğma ədəbiyyatlarını, onun sonrakı inkişafını tədqiq edib yaymış, özləri də milli söz sənətimizin qürbət motivli nümunələrini yaratmışlar" [2].

Azərbaycandan çox-çox uzaqlarda doğma yurdumuza aid mühacir mətbuat orqanları geniş şəkildə fəaliyyət göstərmişdir. "Azərbaycan", "Azərbaycan yurd bilgisi", "Azəri türk", "Birlik-dirilikdir", "Ergenekon yolu", "Mühacir", "Odlu yurd", "Türk izi", "Koroğlu", "Türk yolu", "Xəzər", "Türk kültürü", "Türk ədəbiyyatı", "Tanıtım", "Yeni sorğu", "Nisan", "İqtibas", "Zaman" və s. Mühacir qəzet və jurnallarda Azərbaycan ədəbiyyatı məsələlərinə vaxtaşırı yer ayrılırdı. Mühacir mətbuatının əsasını qoyanlardan M.Ə.Rəsulzadə, Əhməd Ağaoğlu, Ceyhun Hacıbəyli, Mirzə Bala Məmmədzadə və Əhməd Cəfəroğlunun fəaliyyətini Vahab Yurdsevər, Mustafa Həqqi Türkəqul, Əhməd Qaraca, Nihad Çətinqaya, Əli Yavuz Akpınar, Süleyman Təkinər, Nizaməddin Onk, Yusif Gədikli, Kərim Yaycala və başqa soydaşlarımız davam etdirmişlər.

"Mühacirətdəki həmvətənlərimizdə sən demə, Azərbaycan istiqlalının süqutundan sonra bizdə yaranmış ədəbiyyata bizdən fərqli olaraq başdan-binadan obyektiv, dəyişməz münasibət mövcudmuş. Bu obyektivliyə biz hələ indi gəlib çıxmışıq" [3].

Siyasi-ictimai vəziyyət nəinki Şimali Azərbaycandakı vətənpərvərlərimizi, eləcə də Cənubi Azərbaycanda yaşayan milyonlarla soydaşımızı didərginliyə məcbur etmişdi. Mühacir, qaçqın, köçkün adı ilə onlar öz yurdlarından uzaq düşmüş, ağır və möhnətli həyat tərzi keçirmiş, düşdüyü mühitin qanun və hüquqlarından məhrum olmuşlar. Cənubi Azərbaycanın mütərəqqi fikirli sənətkarlarından Mirzəli Möcüz Şəbüstəri, Səid Səlmasi, Həbib Sahir, İbrahim Zakir və başqaları şah istibdadı rejiminə boyun əyməmiş, təzyiq və təqiblərə məruz qalaraq qürbət ölkələrdə yaşamaq məcburiyyətində qalmışdılar. M.Möcüz İstanbulda yaşadığı illərdə mütərəqqi türk ədəbiyyatı ilə maraqlanmış, T.Fikrət, M.Emin, N.Kamal və digər sənətkarların bədii irsini mütaliə etmiş və bu mənimsəmə onun dünyagörüşünə və yaradıcılığına böyük təsir göstərmişdir. İstibdad rejiminin doğma yurddan sürgün etdiyi İbrahim Zakir "Qürbətdə" şeirində vətən

məhəbbətinin sinəsində necə qövr etdiyindən danışırdı:

*Vətəndən ötrü dolannam cahanda məcnuntək,*
*Tapılmayır mənə bir qəmküsar, qürbətdə.*
*Edib xaraba əziz ölkəm o xainlər,*
*Bu qəmli göz yaşım eylər nisar qürbətdə.*
*Yetişsə vaxt sənin intiqamını allıq,*
*O vaxt qəlbim olar laləzar, qürbətdə.*
*Bu gündə Zakir edər əndəlibtək əfqan,*
*Edib vətən sözünü bir şüar, qürbətdə[4].*

Cənibi Azərbaycanın qocaman sənətkarlarından olan Həbib Sahir də milli müstəqillik və ana dili uğrunda apardığı mübarizəyə görə dəfələrlə sürgün edilmiş və zindana salınmışdır. Zülm və ədalətsizliyin törətdiyi faciələrə görə doğma "baba ocağı"ndan didərgin düşdüyünü, qürbət diyarın ona cəhənnəm kəsildiyini ürək ağrısı ilə təsvir edən şair yazırdı:

*Haram oldu mənə baba ocağı,*
*Yurdum oldu karvansara bucağı,*
*Aclıq çəkib, korluq gördüm dünyada,*
*Keçdi şamım, söndü odum, ocağım,*
*Məndən sonra axmaz oldu bulağım [5].*

Bu gün Avropada yaşayan mühacir həmvətənlərimiz milli mədəniyyətimizin və ədəbiyyatımızın dünya miqyasına çıxmasına böyük səy və təşəbbüs göstərirlər. İstedadlı yazıçılarımız Anarın "Beşmərtəbəli evin altıncı mərtəbəsi" Elçinin "Ağ dəvə" romanları alman dilində nəşr olunaraq böyük müvəffəqiyyət qazanmışdır. Almaniyada çıxan "Sizə", "Yazın", "Kirpi" jurnallarında, Stokholmda Azərbaycan dərnəklərinin ana dilindəki radio verilişlərində, Berlin radio və televiziyasında yazıçılarımızın çıxışlarına, intervyülərinə tez-tez yer ayrılır [6].

1990-cı ilin 28 mayında Türkiyədə Birinci Millətlərarası böyük Azərbaycan Konqresinin açılışında dünyanın neçə ölkəsindən gəlmiş yurddaşlarımız da bu böyük tədbirin iştirakçısı oldu. Konqresdə Azərbaycan-türk mədəni əlaqələrinin genişləndirilməsi məsələsindən danışılsa da, əsas diqqət Azərbaycanda baş verən son hadisələrə həsr olunmuş, tariximizin, mədəniyyətimizin bir çox səhifələrinin ermənilər tərəfindən təhrif edildiyi qeyd edilmişdir. Konqresin iştirakçısı şair-publisist Sabir Rüstəmxanlı bu tədbirin əhəmiyyətindən bəhs edərək yazır: *"Konqresinəhəmiyyətini göstərmək üçün bir neçə məsələni xatırlatmaq bəs edər: birincisi, bu, Azərbaycan mövzusunun beynəlxalq miqyasda ilk ayrıca müzakirəsi idi; ikincisi: konqres Azərbaycan Xalq Cümhuriyyətinin yetmiş iki illiyinə həsr olunmuşdu və 28 may günü açılırdı; üçüncüsü: hələ heç vaxt Türkiyəyə Azərbaycandan dil, tarix, ədəbiyyatşünaslıq, etimologiya, ədəbi-mədəni əlaqələr və s. elm sahələrini təmsil edən tanınmış alim və yazıçıların bu boyda və belə nüfuzlu dəstəsi getməyib; dördüncüsü:, konqres respublikamızı ağır imtahanlara çəkən axırıncı üç ilin hadisələrindən sonra, yüzlərlə əzizimizi əlimizdən alan Qanlı Yanvar qırğınlarının, türklər demiş, Ocaq ayı qətliamının yarası sağalmamış keçirilirdi və dünyanın müxtəlif yerlərindən gəlmiş qonaqların bu hadisələrə münasibətini bilmək zəruri idi" [7].*

1991-ci ilin aprel ayında isə Bakıda Azərbaycan EA Nizami adına Ədəbiyyat İnstitutu, Azərbaycan Yazıçılar Birliyi, "Vətən" cəmiyyəti, Azərbaycan Milli Yaradıcılıq Qurumu və Türkiyədəki (Ankara) Azərbaycan Kültür Dərnəyinin birgə təşkil etdiyi ilk Beynəlxalq elmi simpoziumu keçirildi.

Elmi simpoziumdakı ayrı-ayrı çıxışlarda belə bir fikir təsdiqləndi ki, dünyanın müxtəlif ölkələrinə dağılmış mühacirlər barədə Azərbaycan Sovet Sosialist Respublikasında , o ləğv olunana qədər, ancaq düşmən kimi danışılmışdır – onların kifayət qədər zəngin ədəbi-bədii, elmi, ictimai-siyasi irsinin inkar olunması hələ bir yana qalsın, haqlarında kifayət qədər nalayiq sözlər yazılmış, sözlər söylənmişdir[8].

Simpozium "Azərbaycan mühacirət ədəbiyyatı" mövzusuna həsr olunsa da, ümumiyyətlə, söhbət ayrı-ayrı məruzələrdə bütövlükdə Azərbaycan mühacirətinin tarixinin öyrənilməsinə son illərdə başlanılmışdır.

Simpoziumun işində dünyanın müxtəlif yerlərindən gəlmiş elm və sənət xadimləri iştirak edərək məruzələr etmişdilər. Tehran Azad İslam Universitetinin cərrahiyyə kafedrasının müdiri, professor, Fransa Cərrahiyyə Akademiyasının həqiqi üzvü, "Varlıq" jurnalının baş redaktoru Cavad Heyət simpoziumun keçirilməsi barədə öz mülahizələrini belə ifadə edirdi: *"Simpoziumda bir çox mühacir yazıçı və şairlər haqqında, o cümlədən demokratik Azərbaycan Respublikasının yaradıcısı və Azərbaycanın böyük rəhbəri Məmmədəmin Rəsulzadə, Əhməd Ağaoğlu, Əlibəy Hüseynzadə, Əhməd Cəfəroğlu, Mirzəbala və digər mühacirətdə yazıb yaradan şəxslər haqqında yaxşı məruzələr eşitdik" [7].*

Simpozium iştirakçısı, Türkiyədəki Qazi Universitetinin türk dili və ədəbiyyatı bölməsinin sədri Əhməd Bican Ərcilasun Azəri mühacirləri haqqındakı fikirlərini açıqlayaraq yazır: *"...Mühacirətdəki azərbaycanlılar, deyim ki, Türkiyədə mühüm iş görüblər. Ümumən Azərbaycan ədəbiyyatı, mədəniyyəti onlar tərəfindən bizə tanıdılıb, Azərbaycanın özünə gəlincə, təəssüflə deməliyəm ki, xalq özü bu ədəbiyyatdan uzun müddət xəbərsiz qalmışdır. Ara-sıra xəbər tutan vardısa da, bu çox azlıq təşkil edirdi. Birinci dəfədir ki, mühacirətdə yaşayıb yaradanların aqibəti ilə Azərbaycanda belə maraqlanır və onun təbliğinə səy göstərirlər. Bunun da Azərbaycan ədəbiyyatına zənginlik gətirəcəyinə şübhə etmirəm. Mən elə düşünürəm ki, Azərbaycan ədəbiyyatının birtərəfli inkişafı bu ədəbiyyatlarla bütövlənəcək" [7].*

"Azərbaycan mühacirət ədəbiyyatı (XX əsr)" Beynəlxalq Elmi Simpoziumunun dünyadakı bütün Azərbaycan mühacirlərinə qəbul etdiyi müraciətində deyilir: *"...Əziz həmvətənlər! Azərbaycandan ayrı düşmüş Azərbaycan türkləri! Tarix şahiddir ki, millət sizi heç vaxt özünə yad bilməmişdir. Vətən torpağı vətən övladının torpaq olmuş vücudunun əmələ gəldiyi kimi, mənəvi vətən obrazı da bizim üçün həmişə bütün həmvətənlərin vətən hissinin və vətən yaddaşının cəmindən yaranmışdır. Uzaqda olsun, ya yaxında, fərqi yoxdur: harada vətən oğlunun nəfəsindən bir hərarət varsa, orada vətənin özündən bir qəlpə, bir zərrə, bir ünvan var. Millət pərən-pərən düşüb, xalq min-min didərginə, köçkünə çevriləndə vətən də ev-ev, mənzil-mənzil, divar-divar olub, min yerə, min ünvana parçalanır. Heç şübhə etməmək olar ki, belə ünvanlardan hər birində vətənin tarixi və taleyi yaşayır. Mühacirət və qürbət mətləbi heç də təkcə bu ayrı-ayrı ünvanların – fərdlərin taleyi miqyasında müsibət demək deyil, yox, mühacirət - bütövlükdə vətənin faciəsi və taleyi ilə bağlı mətləbdir. Mühacirət ağrısını duymuş milyonların dərdi nə qədər ağır və ovunmaz olsa da, bəslədiyi övladları itirən xalqın ağrısı iki o qədər acı, iki o qədər göynəklidir. Tarix boyu ana Azərbaycan övlad yarasına məlhəm olmağa həmişə hazır olub. Lakin bu gün Qarabağ yaralı ananın (Azərbaycanın!) özünün köməyə, nəvazişə, məlhəmə və məhəbbətə ehtiyacı var.*

*Həmvətənlər – dünyaya vətəndən səpələnən vətən qəlpələri!*

*Biz bu gün tarixi məclisə ona görə yığışmışıq ki, ayrı düşmüş beyinlər və ürəklər, tarixlər və nəsillər arasında ülfət və ünsiyyət baş versin" [7].*

## Ədəbiyyat:

1. N.Nəsibzadə. Şimali Azərbaycan siyasi mühacirəti: təşəkkülü və tarixi missiyası. "Ədəbiyyat qəzeti ", 4 fevral 1992-ci il.
2. Q.Qasımzadə. Mühacirət və müasir Azərbaycan Azərbaycan ədəbiyyatının bəzi məsələləri. "Ədəbiyyat qəzeti", 22 noyabr 1991, №47.
3. Q.Qasımzadə. Mühacirət və müasir Azərbaycan Azərbaycan ədəbiyyatının bəzi məsələləri. "Ədəbiyyat qəzeti", 22 noyabr 1991, №47.
4. Cənubi Azərbaycan ədəbiyyatı antologiyası. III cild, Bakı, 1998. s.34.
5. Həbib Sahir. "Kovşən" kitabı. s.91.
6. Q.Qasımzadə. Mühacirət və müasir Azərbaycan Azərbaycan ədəbiyyatının bəzi məsələləri. "Ədəbiyyat qəzeti", 22 noyabr 1991, №7.
7. Sabir Rüstəmxanlı. Birinci millətlərarası Böyük Azərbaycan Konqresi. "Azərbaycan", 15 iyun 1990, №21.

## About Azerbaijan immigrant literature

**Summary**

Unlike ancient and medieval times, immigrants who were deported from their homeland shared their pains, fighting for national independence, fighting for national unity and calling their compatriots to national unity, which is a real patriotic example.

## Об азербайджанской эмигрантской литературе

**Резюме**

В отличие от древних и средневековых времен, иммигранты, которые были депортированы с родины, делились своими болями, борющихся за национальную независимость, борющихся за национальное единство и призывавших своих соотечественников к национальному единству, что является настоящим патриотическим примером.

**Reyci: prof. V.Əliyev**

**Исмайлова Севда Нуреддин гызы**
Бакинский славянский университет

## ОБРАЗ НЕВЕСТЫ В ТВОРЧЕСТВЕ А.С.ПУШКИНА

***Ключевые слова:*** *Пушкин, тема семьи, образ, невеста, личность, гендер*
***Açar sözlər:*** *Puşkin, ailə mövzusu, obraz, nişanlı qız, şəxsiyyət, gender*
***Key words:*** *Pushkin, a family theme, a character, an engaged lady, a personality, a gender*

В современном литературоведении о Пушкине сказано так много, что казалось бы, не осталось ничего неизведанного в творчестве этого писателя. поэтому очень трудно найти новый предмет для исследования или новый, незатронутый аспект во взгляде на произведения Пушкина, его художественный мир. В современном мире, когда утрачиваются нравственные ценности, особенно в среде подрастающего поколения, когда скромность и нравственная чистота девушек – это пустые, ничего не значащие слова, особенно важно обратиться к образам наших ровесниц, живших во времена Пушкина, узнать, какие они были и, быть может, перенять для себя уроки нравственности, именно этим обусловлена **актуальность** моего исследования.

Воплощением идеала женственности многие считают героинь произведений А. С. Пушкина. Как известно, русская классическая литература отличалась глубоким интересом к женским характерам. Не является исключением и А.С. Пушкин, создавший в своём творчестве целую галерею женских характеров.

Тема семьи, родственных отношений, преемственности поколений, семейных корней занимает в творчестве Пушкина одно из центральных мест. Ей посвящены многие лирические произведения поэта («Моя родословная», «Вновь я посетил» и др.), и почти каждое прозаическое и лиро-эпическое произведение сюжетно связано с этой темой, отображая столкновения человеческих взаимоотношений, так или иначе касаясь института брака, семьи.

Следует отметить, что в ранних романтических произведениях Пушкин описывает события, связанные с сильными, предельными по эмоциональной наполненности чувствами, событиями, происходящими в экзотической обстановке и выводящими читателя из привычного, обыденного мира. «Братья-разбойники» (1921 – 1823), «Кавказский пленник» (1823), «Бахчисарайский фонтан» (1821 – 1823), «Цыганы» (1828), «Полтава» (1928) рисуют образы исключительных, ярких личностей, намеренно ставящих себя в условия экстраординарные.

В более зрелых реалистических произведениях, созданных в конце 1820-30 годов, А.С. Пушкина начинают занимать проблемы более жизненные,

Важным для Пушкина образом, который часто наделен в подавляющем большинстве случаев положительной оценочностью. Является образ девушки-невесты. Он фигурирует практически в каждом эпическом и лиро-эпическом произведении автора: «Руслан и Людмила» (1820), «Цыганы» (1824), «Арап Петра Великого» (1827), «Жених» (1827), «Полтава» (1828), «Евгений Онегин» (1823-30), «Станционный смотритель» (1830), «Метель» (1830), «Барышня-крестьянка» (1830), «Дубровский» (1833), «Медный всадник» (1834), «Сказка о царе Салтане» (1831), «Пиковая дама» (1831), «Сказка о мертвой царевне» (1833), «Капитанская дочка» (1836).

принципиально важные для поэта, а потому повторяющиеся из произведения в произведение приёмы и аспекты изображения героинь-невест. Это прежде всего:

1) внешние данные (портрет) и те его детали, которые постоянно находятся в центре авторского внимания;

2) среда воспитания, родные, семья; важно в каких отношениях с ними находится героиня-невеста;

3) внутренний мир, состояние души героини-невесты, её характер, ценностные ориентиры;

4) поэтика имени, рассмотренная в контексте христианской и народно-поэтической традиции.

Обобщив внешние данные героинь-невест *(Приложение VI)*, я отметила следующее: в подавляющем большинстве А.Пушкин достаточно подробно описывает внешность невесты. Сопоставив их черты, я обнаружила ряд неслучайных совпадений: почти у всех героинь светлые волосы, большие голубые глаза, стройный стан, прекрасный голос, они часто бледны, всем им 17-18 лет. При этом подчёркнуто отсутствие особой яркости во внешности, бросающейся в глаза и привлекающей всеобщее внимание. Не вписывается в этот ряд только облик Ольги Лариной. Это, по сути, не пушкинская невеста. Поэт признаётся читателю, что разочарован:

Её портрет: он очень мил,
Я прежде сам его любил,
Но надоел он мне безмерно…

Рассмотрев цветовую гамму при описании внешности героинь, мы видим, что преобладающими цветами являются светлые тона (бледные, голубые, льняные, светло-русые), они сопоставимы с семантическим полем светоносности, чистоты, духовности. Уместно сопоставить это с понятием «чистый лист» (tabula rasa), на котором судьба будет писать свои знаки. Этому и соответствует внешность пушкинских героинь-невест.

Пушкин не противоречит одному из тезисов «Домостроя» - свода правил, регламентирующих не только иерархию взаимоотношений в семье, но и её нравственный климат: "Жена да не перечит своему мужу". Можно сказать, что Пушкин этот тезис истолковывает гораздо шире. Согласно Пушкину, выйдя замуж, женщина связывает свою судьбу с мужем и проявляет себя как самостоятельная личность уже в гораздо меньшей степени. Поэтому писатель, не нарушая исконно русской традиции, оставляет право личностной реализации прежде всего за невестой, понимая, что после замужества такие поступки могут нести эпатирующий характер и нетипичны по своей сути.

Ставя перед собой иные цели, Пушкин-реалист стремится быть верным правде жизни. Для русского менталитета, тем более в первой трети XIX века, эмансипированная женщина – нонсенс. Должно пройти ещё, как минимум, пять десятков лет, чтобы это явление стало более или менее распространено в России. Но его невесты, не обретшие ещё статуса "жены, послушной мужу", совершают поступки, выводящие их за рамки общепризнанных норм поведения. Именно это даёт автору право оправдать их смелость и тайный или скрытый вызов, бросаемый общественной морали. *(Приложение VII).*

На внутренний мир невест оказывает большое внимание не общение с родными, а французские романы, "преданье русской старины". Почти все героини - "читательницы нежные романов". Это, на мой взгляд, важный момент.

Не общение с родными, не влияние родителей или сестры, а в большей степени французские романы, "преданья старины глубокой" и русский фольклор оказывали влияние на пушкинских героинь. Общим является следующее: у героинь сложные отношения с родителями, и той духовной близости, которую Пушкин не устаёт подчёркивать в отношении отцов и детей, здесь почти не наблюдается. Каждая из невест дана в окружении той среды, которая формировала их личности. «Скромны и послушны» внешне практически все из названных героинь. В этом смысле пушкинская невеста действительно «невеста», что, по В.И.Далю, этимологически восходит к слову «неведомая», неведомой она остаётся и для своей семьи» (1).

Важны также имена героинь. Как известно, семантика имён отражает в целом общие черты у всех героинь: нежность, спокойствие, детскость, но при этом твёрдость и готовность постоять за своё достоинство, своенравие и непримиримость к несправедливости.

Раскрывая внутренний мир героини-невесты, Пушкин вновь использует излюбленный приём контраста, придавая образам внутреннюю динамичность: робость, скромность, замкнутость - это общие черты поведения героинь-невест. Но с момента, когда начинает решаться их судьба все меняется. Они проявляют себя личностями, способными на поступок, способными выйти за рамки устоявшихся норм, традиционных правил и стереотипов. В этом смысле, образы невест, созданные Пушкиным, в большей степени интересны поэту как личности. Его героини-женщины в большей степени личности, чем мужские персонажи. С другой стороны, Пушкин следует русской традиции, изображая невесту как «неведомую и не ведающую» своей судьбы, но чутко к ней прислушивающуюся.

В словаре Даля «невеста» – «девица, обреченная или обрученная мужу, засватанная, просватанная, зарученная» (1) В связи с подобной интерпретацией можно отметить, что у поэта существенно расходятся тема женщины вообще и тема девушки-невесты. Поэту интересна дозамужняя история героини и малоинтересна или совсем неинтересна ее судьба после замужества. В силу этого судьба госпожи Лариной дана «конспективно» как необходимая отправная точка для сравнения с судьбами ее дочерей. Ольга, которая обречена повторять историю жизни матери, остается в памяти читателя моментальным снимком.

И вот уж с ним пред алтарем
Она стыдливо под венцом
Стоит с поникшей головою,
С огнем в потупленных очах,

С улыбкой легкой на устах («Евгений Онегин»). Также поверхностно дается и замужняя жизнь всех героинь-невест, перешедших в статус супруги. Именно в тот краткий период жизни женщины, когда она уже вполне сложилась как личность («заневестилась»), но еще не принесла клятв перед алтарем, она может заявить о себе действительностью поступка, проявив тем самым свое свободное волеизъявление. Поэтому все пушкинские сюжеты, так или иначе касающиеся судьбы девушек на выданье, нацелены на максимальную реализацию их свободной воли. Постепенное нарастание этого сюжета очевидно при сопоставлении героинь, чьи образы создавались поэтом в разные годы. Людмила – предмет открытого любования автора. Она похищенная невеста, но и в плену у Черномора сохраняет свое целомудрие и верность Руслану, оставаясь в рамках фольклорного мотива испытания. Пушкин в своей романтической поэму изменяет привычный сказочный сюжет и «закольцовывает» его свадебным пиром: с него поэма начинается, им же заканчивается. Людмила предстает некой ценностной и эмоциональной константой, поэтому автор в большей степени сосредоточен на переживаниях других персонажей. В последующих интерпретациях «сюжета с невестой» Пушкин постепенно, но целенаправленно усиливает мотив бунтарства своих героинь, меняя его мотивацию. Так, в «Цыганах» своеволие Земфиры обусловлено прежде всего ее цыганской натурой и контрастирует с поведенческими стереотипами Алеко, выявляя ограниченность его представлений о свободе. А в «Женихе» невеста Наталья не боится прилюдно разоблачить злодея, проявляя выдержку и поистине не девичью силу характера, сопоставимую с таким критерием, как «мужество». В «Полтаве» Пушкин еще более усложняет сюжет невесты. Поворачивая сюжет «похищение невесты» к трагической, а не счастливой развязке. Так, своеволие Марии оборачивается ее невольным предательством семьи и ужасным возмездием – сумасшествием. Пушкин художественно исследует этически значимый для себя конфликт права на свободное волеизъявление и порядка, закрепленного традицией. Поместив в центр этого конфликта женщину, Пушкин актуализирует также проблему женской свободы выбора вообще. Поэт подвергает сомнению личностную цельность женщины, которая зависит от мужчины и в традиционном – материальном – смысле и в морально-нравственно. Тем самым Пушкин подвергает сомнению патриархатную парадигму традиционных ценностей, требующую от женщины отказа от собственного личностного начала.

«Евгений Онегин» – следующая ступень в развитии сюжета невесты. Татьяна, хоть и не просватана за Онегина, сама назначает себя таковой в письме («то в высшем суждено совете, то воля неба: я – твоя!»). Став невестой, она рождается как личность, то есть обретает себя сначала в слове, потом в поступке. Среди всех персонажей поэмы Пушкин отдает явное предпочтение Татьяне. Главная причина в том, что она способна к самостоянью, готовности поступать не как все. Но жизненные обстоятельства – это непреодолимая преграда для любой женщины, поскольку ломать их - это задача мужчины.

Пушкин выбирает для своей героини путь, предполагающий сохранение ее женственности: Татьяна делает мир лучше фактом своего присутствия, постепенно изгоняя из него пошлость, глупость, жеманство. Таким образом, она выступает согласно своей женской природе не миросокрушительницей, но мироустроительницей. Поиск достойного «суженого» приводит Пушкина к следующему варианту сюжета: вместо эгоистичного и хандрящего Онегина в «Дубровском» появляется Владимир достойный, активный, с врожденным чувством справедливости, но счастливый финал все-таки не складывается, поскольку невеста Марья Кирилловна уже задана как идеальная невеста, но ломать миропорядок она хочет и не может.

В 1830-е годы Пушкин параллельно обращается к сюжету семейной истории, преобразуя «сюжет невесты» в «историю супругов», изначально предназначенных друг для друга. В этом выразилась потребность поэта в утверждении онтологического статуса человеческого счастья в качестве нормы бытия. Пушкин реализует этот сюжет, по меньшей мере, трижды: комически в «Барышне-крестьянке», мелодраматически в «Метели» и трагически в историческом романе – «Капитанской дочке». Все три героини-невесты, действующие в них (Лиза Муромская, Марья Гавриловна и Маша Миронова) обретают достойных женихов, успев во время своего короткого девичьего века проявить лучшие качества личности, способность к поступку. Они обретают счастье по воле судьбы, а не против нее. Их своеволие на этот раз увенчалось счастливым браком не вопреки судьбе, а по воле судьбы.

Выйдя замуж, женщина связывает свою судьбу с мужем и уже не обязана проявлять себя как самостоятельная и самодостаточная личность. Татьяна Ларина – исключение, поэтому и названа «милым идеалом», ибо трудно представима в реальности. В более поздних сюжетах Пушкин, не

нарушая исконно русской традиции, оставляет право личностной реализации именно за невестой, понимая, что, после замужества такие поступки неизбежно обретут излишне эпатирующий характер и поэтому по сути своей будут нетипичны и нереалистичны. Пушкин-реалист остается верен правде жизни. Для русского менталитета первой трети XIX века женщина-«эмансипэ», скорее, нонсенс, нежели характерное явление. Должно пройти еще, как минимум, пять десятков лет, чтобы оно стало более или менее распространенным в России. Поэтому именно пушкинские невесты, не обретшие еще статуса «жены, послушной мужу», совершают поступки, выводящие их за рамки общепризнанных норм поведения. Именно это дает автору право оправдать их смелость и тайный или скрытый вызов, бросаемый ими общественной морали, но не нарушающий их женственности.

**Литература:**

1. В.И. Даль. Словарь живого великорусского языка. http://slovardalja.net. (In Russian)
2. Н.Коржавин. Ольга и Татьяна: Эссе // Радуга: Журнал художественной литературы и общественной мысли. – 2003. – № 3. – С. 149–167.
3. С.Ю. Воробьева. К вопросу о типологии женских образов в творчестве А. С. Пушкина: гендерный аспект // Известия Уральского федерального университета. Сер. 2, Гуманитарные науки. 2017. Т. 19. № 2 (163), с.120-133
4. Ю.А.Гладышева. Сравнение как способ репрезентации гендерных моделей культуры в романе А.С. Пушкина «Евгений Онегин» // Ученые записки: электронный научный журнал Курского государственного университета. 2012. № 3 (23). Т. 2

**A.S.Puşkin yaradıcılığında nişanlı qız obrazı**

**Xülasə**

A.S.Puşkin yaradıcılığında nişanlı qız obrazı xüsusi yer tutur. Müəllif üçün hələ həyatın yanı ailə həyatının astanasında olan qadın obrazı daha böyük maraq kəsb edir. Çünki A.S.Puşkin üçün artıq mühitin amansız qaydaları ilə, ailədə qadının mövqeyi ilə barışaraq adiləşən qadın obrazı maraqlı deyil. Astana da olan qəhrəmanını isə müəllif onun daxili gücünü, onun iradəsini sınayaraq şəxsiyyət kimi təsvir edir ve oxucusuna bir müsbət qəhrəman olaraq təqdim edir. Bu cür obrazı müıəllifin müraciət etdiyi bütün jane və üslublarda təqdim edir. Lakin realistik əsərlərində, xüsusən “Evgeniy Oneqin”də nişanlı qız obrazı Tatyana Larina obrazının timsalında daha dolğun və əsaslı şəkildə təsvir olunur.

**The character of the engaged lady in Pushkin's literary legacy**

**Summary**

The character of the engaged woman has a great role in Pushkin's literary legacy. The woman who is going to take steps into the domesticity has great importance for the author. Because the woman who has already accepted the ruthless manners of society and her primary life in the family is not vital for A.S. Pushkin. The author puts his character's will and inner power to the test, describes her as a real personage and in this way he introduces her as a positive heroine to the readers. The author uses such a kind of character in all genres and literary forms which he applied. However, in his realistic works, especially in "Yevgeni and Onegin ", the engaged woman character has been described more detailed and deeply in the character and specific features of Tatiana Larina.

**Рецензент: доц. Д.Ф.Гумбатова**

**Qaçayeva İlahə Yaşar qızı**
Bakı Avrasiya Universiteti
ilaheqacayeva94@gmail.com

# BUTAVERMƏ MOTİVİNİN TƏSƏVVÜFİ SEMANTİKASI

***Açar sözlər:*** *Allah ,aşıq, aşiq, buta, məşuq, məhəbbət, təsəvvüf, ürfan, dastan, dərviş, pəri, müqəddəs, hicran, ruh, yol*
***Key words:*** *God, ashug, ashug, buta, mashug, love, sufism, wisdom, epos, dervish, fairy, separation, holy, spirit, way*
***Ключевые слова:*** *Бог, ашугом, ашуг, бута, машуг, любовь, суфизм, мудрость, эпос, дервиш, фея, разделение, святой, дух, путь*

Azərbaycan aşıq yaradıcılığında buta elementi ürfani düşüncənin əsas simvollarından biridir. Buta öz mənşəyini qədim folklordan götürür. Nağıllarımızda beşikkəsmə, göbəkkəsmə kimi ünsürlər qohumlararası birliyin əsas vasitəsi kimi diqqəti cəlb edirsə, butavermə sevənlər arasında sosial-mənəvi birliyin ilahi eşq formasında təsbit olunmasında, daha üstün şəkildə ürfani düşüncədə bəşəri məhəbbətin Allaha eşq məzmununda qəbul edilməsində üzə çıxır.

Azərbaycan dastanlarında butavermə ikitərəfli olur. Dərviş, seyid, Həzrət Əli, Xızır və b. butanı həm oğlana, həm də qıza içirdir. Bu hadisə yuxuda baş verir.Bu yuxu adi deyil, ilahi yuxudur. Aşiq haqq yuxusundan ayılandan sonra ilk dəfə əlinə saz alır, dediklərini ata-anası, yaxın adamları qavraya bilmir. Məhz bu prosesdən sonra aşiqə vergi verilir, bunun sayəsində gizli sirləri aça bilir.

Butavermə mağarada, zağada, ağac altında və s. yerlərdə baş verir. Bu seçilmiş məkan ilahi cəhətdən qiymətləndirilmiş olmalıdır (5, 106). Burada həm də ağacın və mağaranın daşıdığı məna yükünü nəzərə almaq lazımdır. Mağara o dünyanın işarəsi, ağac isə o dünya ilə bu dünya arasında əlaqə yaradan dünya ağacıdır. Butavermə motivinin həm də möcüzəli doğuluş motivi ilə də əlaqəsi vardır. Bəzi məhəbbət dastanlarında sonsuz ata-ananın dərvişin verdiyi almanı yedikdən sonra övlada sahib olması göstərilir. Belə çıxır ki, bu oğlan dünyaya gəlməmişdən əvvəl onun butasının kim olması haqqında ilahi məkanda iaşərələr vardır. Yəni bu butavermə motivi qabaqcadan planlaşdırılmış hadisədir. Bu prosesə nağıllarda göbəkkəsmə adı verirlərsə, məhəbbət dastanlarında butavermə adlandırılır. M. Cəfərli yazır ki, "doğuluşun və onunla bağlı göbəkkəsmə nişanlanmanın olub-olmaması butavermə motivinin olub-olmamasının işarəsi kimi çıxış edir (5, 105).

M. H. Təhmasib yazır ki, "Bizcə, dastan yaradıcıları bu çətinliyi aradan qaldırmaq üçün çox düşünmüş, nəhayət, dindən icazə yolu ilə işin içindən çıxmaq qərarına gəlmişlər ki, bunun üçün də qəhrəmanları bir-birini yaxından görməsi motivi ilə onları bir-birinə "buta" eləmək priyomları birləşdirilmişdir" (6, 69). M. H. Təhmasib burada butavermənin daşıdığı irfani-sufi dəyərləri, butavermənin Allaha qovuşma yolunda bir vasitə olduğunu nəzərə almır.Butavermədən sonra aşiqin xəstələnməsi, ağzından köpük qusması, özündən getməsi kimi hallar baş verir. Bu, həm də daxili təmizlənmədir. Allah yolunun yolçusu olmaq üçün əsas qəhrəman inisiasiya (ölüb-dirilmə) prosesindən keçməlidir. Məhz bundan sonra başqa dünyanın təsiri altında ona mərifət elmi aşılanır. İslamın geniş yayılmasından sonra Xızıra kult kimi münasibətdə qadağalar da rol oynayırdı, önə Həzrət Əli kultu çıxırdı. Bizə elə gəlir ki, bu proses Qurbani və Aşıq Abbas Tufarqanlı dövründən başlamış, sonrakı ustad aşıqların yaradıcılıqlarında daha da möhkəmlənmişdir. Hər halda bu, təbii bir inkişaf idi, dastanda Xızır kultu həm də mifoloji xarakter verirdi. Əli kultu isə dastanı daha da ilahiləşdirərək, sevənlərin Allaha qovuşmasını təsəvvüfi düşüncədə məhz Həzrət Əlinin nurlu əlindən abi-kövsər içirməklə təmin etmiş olurdular.

M.Cəfərli bu butavermə prosesini 3 mərhələyə bölür: qəhrəmanın əvvəlki vəziyyəti (aciz, tənbəl, xəstə və s.); simvolik ölüm – yuxuda buta alması vəziyyəti; qəhrəmanın yeni vəziyyəti (aşiq və haqq aşığı) (5, 117).

Buta qəhrəmanlarının dünyaya gəlməsi, məşuqları ilə evlənməsi Allahın iradəsi ilə baş verir. "Qurbani" dastanında Qurbani deyir :

Haqqım əmr eylədi, gəldim dünyaya,
Gözümü açdım, mayıl oldum o burca,
Arif oldum, haqq kəlamın oxudum,
Əlif qəddim dal yazılmış o burca. (1, 12)

Yenə M.Cəfərli yazır ki, "burc" metaforası ilə Qurbani Allaha işarə edir. Burc Allahın məkanıdır. Burc Göyün 9 qatından sonra gələn zamansız, məkansız bir yerdir (5, 151). Və biz görürük ki, bu nurdan buta alanlar vəhdəti-vücuda dönəndə yenə bu nura bələnir, onun işığına bürünür, Haqqa qovuşurlar.

Dastanlardakı butavermәni dərindən anlamaq üçün bir neçə görkəmli aşığın adı keçən məhəbbət dastanını nəzərdən keçirək.

"Qurbani" dastanında butavermə hadisəsi belə baş verir: "Öküzləri açıb buraxdı. Özü də yıxılıb bir zağada yatdı. Qurbaninin göz evi örtülü, könül evi açıq idi. Onun yuxusuna Gəncə şəhərində Ziyad xanın qızı Pəri xanım girdi. Pəri xanımın əlini Qurbaninin əlinə verib, onları bir-birinə buta elədilər. Hər iki aşıq-məşuq yuxuda görüşdülər, alışdılar, verişdilər" (1, 8)

Qurbani kimdən buta aldığını belə anladır:

Bir kimsənə gəldi mənim üstümə,
Yazılı şəninə ya minəl-əta!
İmam ola, damad-Əhmədi-Mürsəl
Doldurub camini eylədi əta.

Tərəhhüm eylədi abi-kövsərdən,
Onunçün keçmişəm can ilə sərdən,
İstədim mətləbim payi-Qənbərdən
Kəramət eylədi mənə bir buta. (1, 11)

Nümunə verdiyimiz bu iki bənddəki təsəvvüf simvollarının Əhmədi-Mürsəlin (peyğəmbərin adı) damadının kim olduğunu açıq göstərir. Həzrət Əli nqablı gəzdiyinə görə, ya da başqa səbəbdən ola bilər ki, Qurbani onun adını birbaşa çəkmək istəməmişdir

Aşıq Abdulladan toplanmış digər variantda isə Qurbaniyə buta Mazannənə pirində verilir. Mazannənə pirində Qurbani yalvarır ki, ona buta versinlər. Ona Abdulla xanın qızını buta verirlər.(6, 361). Hər iki buta alma yerində müqəddəslik vardır. Ona görə də butavermənin məkanı düz seçilmişdir.

"Qurbani" dastanının Dirili versiyasında da Qurbaniyə Mazannənə pirində Həzrət Əli gəncəli Abdulla xanın bacısı Pəri xanımı buta verir. Bu hadisəni Qurbani belə izah edir:

Yatmış idim xabi-qəflət içində,
Onda gördüm: oyan, oyan, - dedilər.
Oyandım qəflətdən, açdım gözümü
Min bir kəlmə mənə bəyan dedilər. (1, 81)

Dastanın birinci versiyasında Qurbani Şıx oğlu Şah İsmayılın köməyi ilə butasına qovuşur. Dirili versiyasında isə Şah Abbasın köməyi ilə butasına yetmək ərəfəsində onu ilan vurur.Qurbaninin ilan çalması ilə bağlı baş verən ölüm aşiqlə məşuqu məhz o dünyada görüşdürür. Yəni o, Allahdan (Pəri) ayrılan zərrənin işığı Pərinin də təbii ölümü ilə kəsrətə, yenə Allahına (Pərisinə) qovuşur.

"Tahir və Zöhrə" dastanında isə möcüzəli doğuluş motivinin iştirakı ilə dərvişin verdiyi almadan iki qardaşın – Əhməd vəzirin Tahir adlı oğlu, Hatəm Soltanın isə Zöhrə adlı qızı dünyaya gəlir. Dastanda onlar göbəkkəsmə vasitəsilə bir-birinə deyiklidirlər. Butavermə bu dastanda əvvəlcədən baş verməsə də, Tahirin haqq aşıqlığı göstərir ki, onların butalanması hadisəsi baş vermişdir.

"Lətif şah" dastanında isə Dərdli şahın oğlu nurani qocanın verdiyi almadan doğulur. Lətif şaha butanı da həmin dərviş verir, dövran aynasına baxan Lətif şah Hindistan şahının qızı Mehriban Soltana vurulur.

"Şahzadə Əbülfəz" dastanı da nağıl şəklində söylənilir. Şahzadə Əbülfəz gələcək sevgilisinin əlindən bir cam su içib ona buta olur. Dastanda dərvişin, Həzrət Əlinin və b. adı çəkilmir. Bu da onu göstərir ki, ozandan aşığa keçid mərhələsində butavermə ilə bağlı ozanın heç bir anlayışı yoxdur.

"Əsli və Kərəm" dastanında da butavermə yoxdur. Amma bu eşq dastanını kamil bir sənətkar danışır. Dədə Kərəmin ilahi vergili Haqq aşığı olması ilə bağlı olaraq adına şagirdləri tərəfindən dastan qoşulmuşdur.

"Abbas və Gülgəz" dastanında isə Abbas eşq yuxusuna getmişdir. Artıq Aşıq Abbas Tufarqanlının zamanında təsəvvüf görüşləri geniş yayıldığından ustad aşıqlar öz yaradıcılıqlarında sufizmə məxsus simvollardan, o cümlədən butavermə və buta priyomundan geniş istifadə edirdilər. Dastanda da Aşıq Abbas deyir:

Mənim ağam Şahi-Mərdan Əlidi,
Hökm eyləsə, düşmən bağrın əridi,
Abbas deyər: yarın adı Pəridi,
Anam, mövlam mənə buta veribdi. (2, 117)

Təsəvvüfdə şah titulu sayılan-seçilən simvollardan biridir. Bu dastanda da sufi aşıq öz dastan yaradıcılığında Şah Abbasın köməyindən istifadə etməklə şah titulunun yüksək məziyyətlərini qabardır.

"Seydi və Pəri" dastanında da Seydini Hindistan padşahının qızı Pəriyə buta verən Həzrət Əlidir. Həzrət Əli həm də onu gələcək bəlalardan qoruyur və butasına qovuşdurur.

"Müğüm şah" da eşq dastanıdır. Dastanda butavermәni Xızır icra edir. Müğüm şah üç gün sərv ağacının altında bihuş yatır, ayılanda başının altında bir cam, bir Quran, bir də saz görür. Onun butası Fətəli xanın qızı Gülşad xanımdır. Buta verilən Müğüm şah və Gülşad xanım uzun sınaqlardan çıxaraq bir-birinə qovuşurlar.

"Aşıq Qərib" dastanında isə butavermə prosesini dərviş yerinə yetirir. Dərviş Rəsula (Qərib) deyir ki, tiflisli Xoca Sənanın qızı Şahsənəmi buta verirəm. Rəsul Tiflisdə qonağı olduğu qarının ona "qərib" deməsi (qərib – sufi simvoludur) ilə adını dəyişib Qərib qoyur.

"Əmrah" dastanında isə buta verən Əmrahın ərəb adlandırdığı Həzrət Əlidir. Həzrət Əli Mahmud paşanın qızı Sayat pərini Əmraha buta vermişdir.

Bütün bu dastanlardakı butavermәni qruplaşdırsaq, onun Həzrət Əlinin, dərvişin, Xızırın, seyidin adı ilə bağlı olduğunu görərik. Bu dastanlar təsəvvüf ideyalarının təsiri altında yaradılmış və sufi-ifani dünyagörüşünün yayılmasına xidmət etmişdir.

**Ədəbiyyat:**

1. Azərbaycan dastanları. 5 cilddə. 1-ci cild. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1965, 380 s.
2. Azərbaycan dastanları. 5 cilddə. 2-ci cild. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1966 , 475 s.
3. Azərbaycan dastanları. 5 cilddə. 3-cü cild. Bakı: Azərbaycan SSR EA Nəşriyyatı, 1967, 340 s.
4. Cəfərli M. Azərbaycan dastanlarının struktur poetikası. Bakı: Nurlan, 2010, 404 s.
5. Təhmasib M.H. Seçilmiş əsərləri. 2 cilddə. 1-ci c. Bakı: "Kitab aləmi" NPM, 2011, 440 s.
6. Təhmasib M.H. Azərbaycan xalq dastanları (orta əsrlər). Bakı: Elm, 1972, 400 s.

**The conceptual semantics of the Buta motive**

**Summary**

Buta in the Azerbaijani epics is double-edged. Dervish, Sayyid, Hazrat Ali, Khidr and others. The butane is for both the boy and the girl. This dream is not a usual dream, but a divine sleep.Although the logic of buta-logic is metaphorical, it can also be understood that the love of a dream in a dream is at the same time its defeat by God. Because "sleep is an irrational space in which sacred and secular worlds invade". There are many divisions in this structure. Sleeping, dreamer, dreamer, etc., to take part in writing it. Here you also need to evaluate the place of your sleep. After sleep, he loses his sacred meaning and is considered a normal space. Playing a song, the ability to read, has archaic semantics. This is a question of David's local talent. As a result, we see the successful completion of the process of understanding God's love.If we group the buta of all these epics, we will see that it is related to the name of Hazrat Ali, Dervish, Khidrayn, and Seyyid. These epics were created under the influence of ideas of tasawwuf and served to spread the outlook of sufism.

**Концептуальная семантика мотива бута**

**Резюме**

Бута в азербайджанских эпосах обоюдоострая. Дервиш, Сайид, Хазрат Али, Хидр и другие. Бутан как для мальчика, так и для девочки. Это событие происходит. Этот сон - не обычный сон, а божественный сон. Хотя логика бута-логики метафорична, можно также понять, что любовь к мечте во сне - это одновременно и его поражение Богом. Потому что «сон - это иррациональное пространство, в котором вторгаются сакральные и светские миры». Здесь вам также нужно оценить место вашего сна. После сна он теряет свое сакральное значение и считается обычным пространством. Воспроизведение песни, умение читать, имеет архаическую семантику. Это вопрос местного таланта Дэвида. В результате мы видим успешное завершение процесса понимания любви Бога. Если мы сгруппируем бута всех этих эпосов, то увидим, что это связано с именами Хазрата Али, Дервиша, Хидрейна, Сейида. Эти эпопеи были созданы под влиянием идей тасаввуфа и послужили распространению мировоззрения суфизма.

**Rəyçi: prof. S.Rzasoy**

**TARİX HISTORY ИСТОРИЯ**

**Hacızadə Fəhmin Məftun oğlu**
Azərbaycan Turizm və Menecment Universiteti
fehmin_hacizade@mail.ru

# NAXÇIVAN MUXTAR RESPUBLİKASININ TARİXİ-MEMARLIQ ABİDƏLƏRİ VƏ ONLARIN TURİZM ÜÇÜN ƏHƏMİYYƏTİ

***Açar sözlər:*** *Naxçıvan,ehtiyyat, mədəniyyət, tarixi abidələr, memarlıq abidələri, turizm*
***Key words:*** *Nakchivan, culture,historical monuments, architectural monuments, tourism*
***Ключевые слова:*** *Нахчыван, ресурсы, культура, исторические памятники, архитектурные памятники, туризм*

## Giriş

Naxçıvan MR-nın qədim tarixə malik olması, özünəməxsus iqlimi, burada olan tarixi memarlıq abidələri, dadlı mətbəxi, bol meyvə-tərəvəzi, müalicə mənbələri, yerli əhalinin qonaqpərvərliyi daim turistləri özünə cəlb etmişdir. Eyni zamanda Naxçıvanın əlverişli zonada yerləşməsi, dağ iqlimi burada turizmin inkişafına şərait yaradır. İl ərzində 400 mindən artıq turistin səyahət etdiyi muxtar respublikamıza gələn qonaqlar buradan dərin təəssüratlarla ayrılır. Bütün bunlar Şərqlə Qərbin qovşağında yerləşən Naxçıvanın ümumi inkişafına mühüm təsir göstərməklə, eyni zamanda Azərbaycanın mədəniyyətini dünyaya tanıtmaq üçün də yaxşı fürsətdir.

## Əsas hissə

Hər bir xalqın qədimliyini sübut edən onun mədəni dəyərləri və tarixi abidələridir. Naxçıvan bölgəsi tarixi abidələrlə zəngin bölgələrimizdən biridir. Naxçıvan MR-nın ərazisində 1162 tarixi memarlıq abidələri vardır ki, bunlardan dünya əhəmiyyətli abidələrin sayı 58, ölkə əhəmiyyəti abidələrin sayı 455, yerli əhəmiyyətli abidələrin sayı isə 649-dur. Belə tarixi-memarlıq abidələrindən Əlincə qalası, Möminə Xatun, Yusif ibn Küseyr, Nəimi, İmamzadə türbələri, qədim körpülər, Gilan şəhərinin qalıqlarını göstərmək olar. Ümumilli liderimiz Heydər Əliyevin sözləri ilə desək “Naxçıvan ərazisini götürsək bu kiçik ərazidə həddindən çox dünya miqyaslı tarixi-memarlıq abidələri yaşayıb və bu gün də yaşayır. Onların hər biri Azərbaycan xalqının həm tarixi, həm mədəniyyəti, həm də adət-ənənələrini göstərən abidələrdir...

Naxçıvanın qədim və zəngin tarixə malik olmasını burada yerləşən qalalar sübut edir. Bunlardan biri də ***Əlincə qalası***dır. Orta əsrlər dövrünə aid bu qala Ağqoyunlu, Qaraqoyunlu və Teymurilərin mübarizə meydanına çevrilmiş və bu mübarizələrin canlı şahidi olmuşdur. Azərbaycanın ən qədim qalalarından biri hesab olunan, sirli və bir o qədər də maraqlı tarixə malik olan və əyilməzlik simvolu sayılan Əlincə qalası Naxçıvan-Culfa yolunun kənarında, Əlincə çayının sağ sahilində yerləşir. Qədim türk dilində “düzənlik” mənasını verən “alan” və “qənimət” mənasını verən “alınc” sözlərindən götürüldüyü güman edilir. Tarixi mənbələrə əsasən qalanın adı alan tayfaları ilə, digər məlumata görə isə Nuh peyğəmbərin nəticəsi Alınca xanın adı ilə bağlıdır. Ancaq son dövrlərin araşdırmalarına əsasən Əlincək tayfasının adı ilə bağlı olduğu göstərilmişdir.

Dədə Qorqud dastanında Əlincə qalası haqqında məlumatlara rast gəlinir. Qala 2000 m hündürlükdədir. Qalaya su kəməri çəkmək mümkün olmamışdır. Ona görə də yağış suyunu hovuzlara doldurmuşlar. Belə bir məlumat da vardır ki, qaladan Əlincəçayına gizli yol vardır.

Bu qalanın hələ Sasanilər dövründə istifadə olunduğu söylənilir. Bir maraqlı fakt da ondan ibarətdir ki, Atəbəy Şəmsəddin Eldənizin hakimiyyəti illərində Atabəylər dövlətinin xəzinəsi burada saxlanılırdı. Əlincədəki saraylar və tikililər Atabəylərin sifarişi ilə tikilmişdir.

Hürufilik hərəkatının qızğın dönəmləri bu qala ilə bağlıdır. Hətta bu hərəkatın banisi Fəzilullah Nəimi burada öldürülmüşdür. Qala XIII-XIV əsrlərdə Hülakilər dövlətinin, XIV əsrin II yarısından isə Cəlarilərin hakimiyyəti altında olmuşdur. Sonrakı dövrlərdə Qaraqoyunluların hakimiyyəti altına düşmüşdür. 1387-1401-ci illərdə Əlincə qalası Əmir Teymurun və oğlu Miranşahın dəfələrlə hücumuna məruz qalır [3, səh 108].

Əlincə qalasında 2016-cı ildə Respublikamızın prezidenti İlham Əliyev cənabları tərəfindən verilən sərəncama əsasən təmir-bərpa işləri aparılmışdır.

Naxçıvanda yerləşən Mağara memarlıq abidələrinin nümunələrindən biri də ***Yusif ibn Kuseyr türbəsi***dir. Türbə iki hissədən ibarətdir. Bu hissələr səkkizbucaqlı formada olan yeraltı və yerüstü hissələrdir.

Türbənin yerüstü hissəsi xatirə qülləsindən, yeraltı hissəsi isə sərdabədən ibarətdir. Türbə həm daxildən, həm də xaricdən bişmiş kərpiclə hörülmüşdür. Yusif ibn Kuseyr türbəsi "Atababa günbəzi" və ya "Atababa türbəsi" də adlandırılır. Türbə hicri təqvimi ilə 557-ci ilin Şəvval ayında, miladi təqvimi ilə 1162-ci ildə inşa edilmişdir [3, səh 481].

Yusif ibn Kuseyr türbəsinin memarlıq üslubu çox maraqlıdır. Belə ki, ikiqat günbəzli quruluşa malik olan türbə bayırdan piramidşəkilli, içəri tərəfdən isə çatma tağ şəkilli günbəzlə örtülmüşdür. Türbənin üzərində kufi xətlərlə müqəddəs kitabımız Qurandan ayələr həkk olunmuşdur.

Naxçıvan şəhərində yerləşən və tarixi-memarlıq abidələrinin ən gözəl nümunələrindən biri də ***Möminə Xatun türbəsi***dir. Bu türbə Şərq memarlıq üslubunda 1186-cı ildə Əcəmi Əbu Bəkr tərəfindən inşa edilmişdir.

Möminə Xatun Atabəylər dövlətinin banisi Şəmsəddin Eldənizin həyat yoldaşı idi. Onun qəbri üzərində məqbərənin tikilməsinə Şəmsəddin Eldəniz tərəfindən qərar verilmiş, tikinti işləri isə onun oğlu Məhəmməd Cahan Pəhləvanın hakimiyyəti illərində hicri təqvimi ilə 582-ci ilin məhərrəm ayında, miladi təqvimi ilə 1186-cı ilin aprel ayında tamamlanmışdır. Xalq arasında bu türbə "Atabəy günbəzi" adı ilə tanınır. Ümumi hündürlüyü 34 m-dir, sonralar 8 m hündürlüyündə olan xarici örtük hissəsi dağıdılmışdır. Belə güman edilir ki, yeraltı sərdabə hissəsində Atabəylər dövlətinin hökmdarı Şəmsəddin Eldəniz, həyat yoldaşı Möminə Xatun və oğlu Məhəmməd Cahan Pəhləvan dəfn edilmişdir. Çox təəssüf ki, dəfn olunan şəxslərin məzarlarının baş daşları oğurlanmışdır. 2003-cü ildə burada təmir-bərpa işləri aparılmışdır.

***İmamzadə kompleksi*** Naxçıvan şəhərinin cənub-şərq hissəsində yerləşir. Bu memarlıq abidəsi Səfəvilər dövrü üçün xarektrikdir. Belə ki, XVIII əsrdə inşa olunmuşdur. Daha dəqiq desək, tədqiqatçıların türbə üzərindəki kitabəni araşdırarkən məlum olmuşdur ki, İmamzadə türbəsi Səfəvi hökmdarı Əbu Müzəffər Şah Təhmasib Bahadur xanın hakimiyyəti illərinə Hacı Fuad bəyin oğlu Həzrət Rufai bəyin əmri ilə tikilmişdir.

Üç binadan ibarət olan bu kompleksin əsas hissəsini türbə təşkil edir. Abidə aşağıdan kvadrat formasındadır. Diqqəti cəlb edən memarın ustalıqla abidənin gövdəsinə qırmızı və bənövşəyi rəngli kərpiclərlə təkrarlanan "Allah" sözünü yazmasıdır. Kompleks ən qədim və zəngin tarixi abidələrdən biri olduğu üçün 2008-ci ildə Naxçıvan Muxtar Respublikası Ali Məcslisi sədrinin göstərişi ilə yüksək səviyyədə təmir-bərpa və yenidənqurma işləri aparılmışdır.

Ordubad şəhərində yerləşən tarixi-memarlıq abidələrindən biri ***Qeysəriyyə*** abidəsidir. Abidə şəhərin mərkəzində yerləşir. Sahəsi 540 $m^2$ olan bu abidə səkkizbucaqlı zaldan, zalın üzərini örtən günbəzdən, günbəzləri saxlayan dayaqlardan və dayaqlarla divar arasında yerləşən keçidələrdən ibarətdir. "Qeysəriyyə" sözü ta qədimdən daş-qaş, ləl-cəvahirat satılan Şərq bazarı mənasını verir. Bu cür tikili dünyada əsasən üç yerdə vardır. Bunlardan Səmərqənd, Təbriz və Ordubad şəhərləridir. Bu abidələrdən ən yaxşısı və abad vəziyyətdı olanı Ordubad şəhərindəkidir. Sonralar bu abidədən "Zorxana" kimi istifadə olunmuşdur. Belə ki, müxtəlif yerlərdən gələn pəhləvanlar burada öz güclərini yoxlayır, qalib gəldikləri təqdirdə mükafat olaraq xandan bir kisə qızıl alırlarmış. XIX əsrin ortalarından etibarən bu binada "Əncüməni-şüəra" ədəbi məclisi təşkil olunmuşdur ki, burada şairlər öz yazdığı yeni şeirlərini oxuyurdular və kimin güclü yazdığı bəyan edilirdi. XX əsrdən etibarən bu bina ipək sexi kimi fəaliyyət göstərməyə başlamışdır. 1978-ci ildə əslən ordubadlı olan memar Zakir Babayev tərəfindən abidədə bərpa işləri aparılmışdır. Qeysəriyyə binası 1981-ci ildən Ordubad rayonu Tarix-Diyarşünaslıq Muzeyi kimi fəaliyyət göstərir. 2011-ci il 14 yanvar tarixində yenidən bərpa olunan abidənin açılışı olmuşdur.

Culfa rayonunun Xanəgah kəndində Əlincə çayının sahilində ***Xanəgah abidə kompleksi*** yerləşir. Bu abidə orta əsrlərə aiddir. Xalq arasında bu abidə Şeyx Xorasan kompleksi də adlanır. Kompleksə türbə, məscid və bəzi tikililər daxildir. Türbədə tapılan daş kitabəyə əsasən kompleksin Uluq Qutluq Lala bəyin əmri ilə tikilmişdir. Türbənin memarı Xacə Cəmaləddin olmuşdur. Burada olan qəbirdə kimin dəfn edilməsi ilə bağlı müxtəlif fikirlər vardır. Bu fikirlərdən birinə görə, burada Əlincə qalasında faciəli şəkildə öldürülən, Hürufilik təliminin banisi Fəzullah Nəiminin müridləri tərəfindən cənazəsi dəfn olunmuşdur. El arasında bu abidənin Şeyx Xorasan kimi adlandırılmasının səbəbi F. Nəimi ilə bağlıdır. Çünki F. Nəimi Xorasanda təhsil almış və ləqəblərindən biri Şeyx Xurasanmış.

Möhtəşəm memarlıq abidəsi olan ***Qarabağlar Türbə Kompleksi*** Kəngərli rayonunun Qarabağlar kəndinin ərazisində yerləşir. Abidə kompleksi XII – XIV əsrə aiddir. Kompleksə qoşaminarəli baştağ, türbə və dini təyinatlı tikililər daxildir. Zaman keçdikcə abidənin bəzi hissələri dağılmış, üzərində olan kitabələr isə itmişdir. Qalan kitabələrə əsasən Kompleksin tikilməsini Cahan Qudi Xatın əmri əsasında inşa edilməsi güman olunur.

Kompleksin əsasını təşkil edən türbə 12 yarımsilindirdən ibarətdir və Naxçıvan Memarlıq məktəbinin ən zərif nümunələrindən hesab olunur. Türbənin dörd baştağı vardır. Hər bir baştağın yuxarı hissəsində müqəddəs kitabımız olan Qurani-Kərimin "Əl-Mumin" surəsinin 16-cı ayəsinin axırıncı hissəsi həkk edilmmişdir. Abidənin gövdə hissəsində kərpicdən hazırlanmış romb formasında iri həcmli sahə vardır ki, burada kufi xətti ilə kitabələr yazılmışdır. Bu dəfələrlə təkrarlanan yazıların mətni isə belədir: "Allahdan başqa Allah yoxdur. Məhəmməd – Allahın ona salavatı olsun – Allahın elçisidir".

## Nəticə

Azərbaycanın ayrılmaz hissəsi olan Naxçıvan bölgəsinin turizm potensialını tədqiq edərkən aydın olur ki, bölgə mədəni, tarixi və təbii resurslarla olduqcə zəngindir. Burada mövcud potensialdan istifadə edilməklə mədəni, tarixi turizm növləri inkişaf etdirilmişdir.

Əhalinin maariflənməsi, abidələrin tanıdılması məqsədilə KİV-də, internet portallarında, turizm saytlarında daha çox məlumatlar verilməli, abidələr broşurlar, metodik vəsaitlər, turist kitabçaları çap edilməli və ən əsası müxtəlif dillərdə tərcümələr edilməlidir.

## Ədəbiyyat:

1. Məsim Abadov – Azərbaycan turizmi və onun inkişaf problemi. Bakı, Şərq Qərb Nəşriyyatı, 2014. Səh. 161.
2. Naxçıvan abidələri ensiklopediyası – Naxçıvan Nəşriyyatı. 2008. Səh. 434.
3. Vəli Baxşəliyev, Fizzə Quliyeva – Naxçıvanın tarixi abidələri. Bakı-Nurlan-2017. Səh. 140.
4. http://azerbaijan.az/portal/Society/Tourism/tourism_a.html?tourism_17
5. http://nakhchivan.preslib.az/az_d1.html
6. http://www.nakhchivan.az/portal-1/index-2.htm

## Historical-architectural monuments of Nakhchivan Autonomous Republic and their importance for tourism

### Summary

The article provides information about the historical monuments in the territory of Noxcivan AR and their benefits and importance for tourism. Noxcivon the Autonomous Republic attracts tourists from different parts of the world with its beautiful nature, ancient and unique historical monuments and modern urban infrastructure.

## Историко-архитектурные памятники Нахчыванской Автономной Республики и их значение для туризма

### Резюме

В статье дается информация об исторических памятниках в Нахчыване на территории АР и их пользе и значении для туризма. Нахчыванская Автономная Республика привлекает туристов со всего мира своей прекрасной природой, древними и уникальными историческими памятниками, современной городской инфраструктурой.

**Rəyçi: dos.N. B. Nəsirli**

**Məmmədova Günel Alxan qızı**
Azərbaycan Respublikası Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyasının

# BAKI ŞƏHƏR DUMASI VƏ AZƏRBAYCANLI DEPUTATLAR

***Açar sözlər:*** *Əsasnamə, şəhər özünüidarəetməsi, Bakı şəhər Duması, seçkilər, deputatlar, fəaliyyət*
***Key words:*** *Statue, urban self-governance, Baku city Duma, elections, deputies, activities*
***Ключевые слова:*** *Правила, городское самоуправление, Бакинская Городская Дума, выборы, депутаты, деятельность*

Çar Rusiyası Cənubi Qafqazı işğal edəndən sonra onun sərvətlərindən kifayət qədər faydalanmaq məqsədilə bir sıra- inzibati, iqtisadi, mədəni, sosial-siyasi və s. – islahatlar hazırlayıb həmin ərazilərdə də tətbiq etməyə başladı. Həmin islahatlar sırasına şəhər özünüidarəsinin yaradılması da daxil idi. Bu məqsədlə "Şəhər əsasnaməsi" hazırlanıb 16 iyun 1870-ci ildə qəbul edilmişdi. Doğrudur, həmin əsasnamə özgə xalqların yaşadığı ərazidə yerləşən mərkəzlərdə yerli xalqların mədəni və inzibati idarə "şüurunun aşağı olması" bəhanəsi ilə dərhal tətbiq eidlmədi. Ancaq XIX əsrin ortalarından ölkədə - Rusiyada özünü getdikcə aydın şəkildə göstərən kapitalist münasibətləri həmin əsrin 70-ci illərində Bakı şəhərində də nəzərə çarpmağa başlamışdı. Bu işdə Bakıda neft sənayesinin inkişaf etməsi nəticəsində Bakı şəhərinin getdikcə Rusiyanın qabaqcıl sənaye mərkəzlərindən birinə çevrilməsi də öz rolunu oynayırdı.

Qeyd edək ki, 1859-cu il Şamaxı zəlzələsi nəticəsində Şamaxı şəhərinin quberniya mərkəzi statusu ləğv edilərək senatın qərarı və I Nikolayın təsdiqi ilə həmin status Bakı şəhərinə verilmişdi.[1] (1) Bakıda sənayenin müxtəlif sahələrinin inkişaf etməsi və onun getdikcə abadlaşaraq böyüməsində bu amil də az rol oynamırdı.

Mövcud vəziyyətlə hesablaşmağa məcbur olan çar Rusiyası hakim dairələri Bakıda da "Şəhər əsasnaməsi"nin tətbiqi zərurətini etiraf etməli oldular. Bakı general-qubernatoru D.S.Staroselskinin Qafqaz Canişininə ünvanlanan 19 fevral 1875-ci il tarixli təqdimatı bu baxımdan maraq doğurur; təqdimatda oxuyuruq: "Mənə (yəni, qubernatora – (G.M.) həvalə olunan quberniyada yerləşən şəhərlərin gəlirlərinin vəziyyətini, əhalinin ictimai işlərin müstəqil aparılmasına hazırlıq səviyyəsini və digər şərtləri nəzərə alaraq, hesab edirəm ki, "Şəhər əsasnaməsi"ni yalnız quberniya şəhəri olan Bakıda tətbiq etmək mümkündür." (2,133)

Bu təqdimata əsaslanaraq Qafqaz canişini Bakı şəhərində "Şəhər Əsasnaməsi"nin tətbiqini lazım bildi. Ancaq o, Dövlət Şurasının Cənubi Qafqaz diyarının şəhərlərində əsasnamənin tətbiqi qaydalarını rəhbər tutaraq, Bakı şəhərində özünüidarə orqanlarının yaradılması (tətbiqi) üçün hələlik yalnız aşağıdakı işlərin görülməsinə icazə verdi:

1. Şəhər dumasına deputat seçkilərinə bütün hazırlıq işlərinin həyata keçirilməsi üçün komissiya yaradılsın;
2. Şəhər ictimai idarəsinin bütün təsisatları təcili surətdə şəhər idarəsinin ixtiyarına verilsin. Təkcə tikinti hissəsi istisna olmaqla, bu hissə Bakı quberniya tikinti şöbəsinin tabeliyində qalsın". (3,51)

Müəyyən məşvərət və müzakirələrdən sonra Dövlət Şurasının 28 oktyabr 1877-ci il tarixli qərarı ilə Cənubi Qafqazda "Şəhər Əsasnaməsi"nin tətbiqi qaydaları müəyyənləşdirildi. Eyni zamanda diyarın ayrı-ayrı şəhərlərində "özünüidarə" orqanlarının təşkili məsələsi və onun ardıcıllığının müəyyənləşdirilməsi Qafqaz canişininin özünə həvalə edildi. Beləliklə, bütün Rusiya şəhərləri üzrə özünüidarə islahatlarının keçirilməsi haqqında qanun müəyyən məhdudiyyətlərlə 8 ildən sonra – 1878-ci ildə Azərbaycanda yalnız Bakı şəhərində tətbiq edilməyə başladı.

Qeyd edək ki, şəhər islahatına əsasən iki özünüidarəetmə orqanı nəzərdə tutulurdu – Şəhər duması və onun icraedici orqanı olan şəhər idarəsi. Hər iki orqan seçkili idi. Yəni onların tərkibi seçki ilə müəyyən edilirdi.

Rusiya senatının qərarına əsasən Bakı şəhərində Duma və Şəhər idarəsi 1877-ci ilin dekabr ayında təsis edildi.

Müəyyən məhdudiyyətlərinə baxmayaraq, Azərbaycanın qabaqcıl görüşlü xadimləri Bakı şəhər dumasına seçkilərdə və şəhər özünüidarə işlərində yaxından iştirak etməyə çalışır, bunun üçün bütün mümkün imkanlardan bəhrələnməyə üstünlük verirdilər. Bu işlərdə H.Z.Tağıyevin, H.Zərdabinin, Ə.Topçubaşov, H.Ağayev və başqalarının fəallıqları diqqətə layiqdir.

Bəlli olduğu kimi, Həsən bəy Zərdabi müəyyən səbəblər üzündən "Əkinçi" qəzetinin nəşri dayandırıldıqdan sonra bir müddət Bakıdan uzaqlaşdırılaraq, əvvəl Zərdabda, sonra Qubada yaşayıb fəaliyyət göstərməli olmuşdu. Onun Bakıya ikinci dəfə qayıdışı 1896-cı ildə mümkün olur.

Həsən bəy Zərdabi Bakıya gələndən sonra şəhərin ictimai-mədəni həyatında qızğın fəaliyyətə başlayır. "Kaspi" qəzeti redaksiyasında çalışaraq, sosial-mədəni problemlərə dair publisistik məqalələr yazıb qəzet vasitəsi ilə diqqəti həmin məsələlərin həllinə yönəldir, digər tərəfdən Bakı şəhər dumasına üzv seçilərək, mətbuatda qaldırdığı problemlərin həllinə özünün vətəndaş töhfəsini vermək barədə düşünürdü. Ancaq şəhər əsasnaməsinə əsasən duma seçkilərində varlılar, daha yüksək məbləğdə vergi ödəyiciləri iştirak edə bilərdilər. Bununla belə dövrün tanınmış pedaqoq və publisistlərindən olan Fərhad Ağazadənin "Həsən bəy Məlikov Zərdabinin tərcümeyi-halı ("Əkinçi" qəzetinin əlli illiyi münasibətilə)" adlı əsərində göstərildiyi kimi, qaydalara əsasən "O vəqtlər Bakı Dumasına seçmək və seçilmək həqqinə... Həsən bəy kimi ziyalılar seçilmək istədikdə onlar başqa bir dövlətlinin övladına qəyyum olur və sonra bu həqqi qazanırdılar" (4, 47). H.Zərdabinin Bakı şəhər dumasına üzv seçilmək hüququ əldə etməsi üçün onu şəhər dövlətlilərinin birinin övladlarına qəyyum təyin etdilər. F.Ağazadənin yazdığı kimi, H.Zərdabinin "...uydurma bir qəyyumluqla Dumaya düşməsindən məqsədi puldan artıq şəhər əhalisi üçün çalışmaq idi". (Yenə orada)

Doğrudan da, H.Zərdabi digər duma üzvlərindən fərqli olaraq, yüksək maaşlı idarələrdənsə kasıb məktəblərdə çalışmağa, yoxsul və kimsəsiz uşaqlara elm, savad öyrətməyə, onların gələcək fəal ictimai həyata hazırlanmalarına üstünlük verirdi. O, daha çox şəhərin yoxsullar yaşayan məhlələrinin abadlaşdırılması, oranın işıqlandırılması, su təchizatı, təmizliyi və s. qayğısına qalır, yoxsulların hüquqlarını müdafiə edirdi. Şəhərin uzaq məhəllələrində yeni məktəblərin açılmasının təşkili, zibillərin vaxtında təmizlənib atılması və digər məsələlər Həsən bəyin duma üzvü kimi fəaliyyət sahələrinə daxil idi. O, duma və şəhər idarəsi qarşısında qaldırdığı məsələlərin həllinə, demək olar ki, tamamilə nail olurdu. Həsən bəy Zərdabinin fəallığının nəticəsi idi ki, onun Dumada üzv kimi çalışdığı on beş il ərzində Bakıda məktəblərin sayı 3-dən 16-ya çatmışdı.

H.Zərdabi məktəblərdə ana dili dərslərinə verilən dərs saatlarının artırılması və dərsliklərin, tədris proqramlarının təkmilləşdirilməsi qayğısına da qalır, bu məqsədə çatmaq üçün çalışmaqdan, müvafiq idarələrə ayaq döyməkdən, məmurlarla görüşüb qaldırdığı məsələlərin həllinin vacibliyinə onları inandırmağa çalışmaqdan yorulmurdu. Bu cür canfəşanlıqlarına görə çox vaxt ondan razı qalmayan məmurlar "...Həsən bəyə deyərdilər ki: "Sənin başında tük yox, cibində pul! Bu nə füqəra deyirib bağırırsan?" (4, 48).

H.Zərdabi bəzi qlasnılardan (duma üzvlərindən) fərqli oalraq, şəhər dumasının diqqətini birinci növbədə Bakının, Bakı əhalisinin, onun mədəni-maarif ocaqlarının problemlərinin həllinə yönəldir, fikrini tutarlı dəlillərlə əsaslandırırdı. Bu haqda oxuyuruq:

"Tiflisdə açılan politexnikum üçün Bakı şəhərindən para istənildiyi vaxt Həsən bəy demişdi: "Şəhərin pulu varsa, kasıbların məktəblərinə sərf etməlidir. Politexnikum isə varlı balaları üçün açılır. Qoy ora Quqasovlar, Mantasevlər, Xatısovlar, Əsədullayevlər (O zamankı Bakı milyonerləri – G.M.) pul versinlər. Çünki orada baltaçı İvanın, ya da dardaycı Abdullanın oğlanları oxumayacaqlar. Uşaqlarını orada tərbiyələndirmək istəyən neft mədənçiləri, zavodçuları politexnikumun da qeydinə qalmalıdırlar". (4, 48)

Əlbəttə, Həsən bəyin bu cür çıxışları çoxlarını ona qarşı qaldırırdı. Lakin H.Zərdabini bu cür hallar öz yolundan döndərə bilmirdi. O, qızların təhsil almaları üçün Bakıda qız məktəbinin açılması ideyasını irəli sürmüş və məqsədinə çatmaq üçün məşhur messenat Hacı Zeynalabdin Tağıyevin köməyindən istifadə etmişdi. Belə ki, II Nikolayın tacqoyma mərasimi ərəfəsində H.Z.Tağıyev II Nikolaydan həmin günün şərəfinə Bakıda müsəlman qız məktəbinin açılmasına razılıq verməyi xahiş edir... Çarın razılığı ilə Bakıda qız məktəbi 1898-ci ildə açılır. H.Z.Tağıyev həmin məktəbin fəaliyyəti üçün üç yüz min manatadək pul ayırır. (5,15)

F.Ağazadənin yazdığına görə. Bakı qız məktəbinin nizamnaməsini də Həsən bəy tərtib edib hazırlamışdı.

Nizamnaməyə əsasən məktəbə təhsil görmüş qadın müdirlik edə bilərdi. Ona görə də H.Zərdabinin həyat yoldaşı, Tiflis gimnaziyasının məzunu Hənifə xanım həmin məktəbə müdir təyin edilir. Həsən bəy isə onlara kömək etmək məqsədişlə məktəb şurasında da çalışır. (4, 49-50)

Mənbələrin də göstərdiyi kimi, Bakı Şəhər Dumasının üzvü kimi Həsən bəy müxtəlif vaxtlarda bir çox komissiyaların ya üzvü, ya da sədri olmuşdur. Daha dəqiq desək, H.Zərdabi Bakı şəhər duma üzvü kimi "...məktəb komissiyasının sədri, yaxud üzvü, bağ, maliyyə və inşaat komissiyasının, Mixaylovski xəstəxanası nəzdində təsərrüfat komitəsinin üzvü, Marinski qız məktəbinin Qəyyumlar Şurasının, Su komissiyasının və sairənin üzvü olmuşdur". (6, 80)

Tarix üzrə fəlsəfə doktoru Esmira Cavadova H.Məlikov Zərdabinin Bakı şəhər Dumasındakı fəaliyyətindən danışarkən, haqlı olaraq, bildirir ki, 1897-1907-ci illədə Həsən bəy Məlikov (Zərdabi) Bakı Şəhər Dumasının iclaslarında fəal iştirak etmişdir. O, müzakirəyə çıxarılan məsələlərin hər biri haqqında əsaslandırılmış fikirlər söyləmiş, irəli sürdüyü fikri və təklifləri məntiqi dəlillərlə əsaslandırmış, bu zaman ancaq xalqın mənafeyini güdmüşdür. Onun Dumada qaldırdığı və müdafiə etdiyi məsələlər əsasən xəstəxanaların,məktəblərin, kitabxana, körpələr evi və uşaq bağçalarının, qocalar evlərinin, park və bulvarların, körpülərin pulsuz təmiri, küçələrin təmiri, işıqlandırılması, təmizliyi və sairdən ibarət olmuşdur. (7, 12).

H.Zərdabi şəhər dumasından xalqın maraqlarını müdafiə, özünün vətəndaş ideyalarını həyata keçirmək üçün əlverişli bir tribuna kimi istifadə edirdi. Bunu onun Duma iclaslarındakı çıxışları əyani şəkildə göstərməkdədir. (8, 162-163,168-169, 182, 194, 210, 229-230, 361, 410, 474, 520-521 и.т.д.)

Dumanın hansı komissiyasında olmasından asılı olmayaraq H.Zərdabi bütün vaxtlarda həqiqət tərəfdarı olmuş, zəhmətkeş xalqın tərəfində durmuş, məktəb, maarif, teatr, mədəni maarif ocaqlarının təsisi və təşkilində yorulmadan çalışmışdır. Dumanın iclas protokollarında tez-tez bu cür qeyd və cümlələrə təsadüf edilir: "Qlasnı H.b.Məlikov şəhər torpaqlarının tutulmasına qarşı tədbirlər görülməsini xahiş edir. (1898-ci il)". "H.b.Məlikov Upravanın baş mühasibinin maaşının ildə 600 manat artırılmasını olduqca yolverilməz hesab edir və göstərir ki, onu bir qədər azaldıb əvəzində şəhərdə bir neçə məktəb açmaq olar". "H.b.Məlikov indiki vaxtda bir neçə vəzifələrin ixtisar edilməsini lazım bilir. H.b.Məlikov təəccüb edirdi ki, Uprava həkimlərin ixtisar edilməsinə razılıq verir". "H.b.Məlikov şəhər pullarının nəzarətsiz surətdə xərclənməsinə dərhal son qoyulmasını tələb edir". və s. (6, 80-81)

Bütün bu cür çıxış, tələb və təkliflər Həsən bəyin həm bəzi deputat həmkarları – məsələn, şəhər qlavası Novikov, Dumanın sədri Belyavski, Duma üzvləri Antonov, Saparov və b. tərəfindən cürbəcür etirazlarla – replika, irad, etiraz çıxışları və sairlə qarşılanır, ayrı-ayrı nüfuz sahibləri tərəfindən ona hədə-qorxu gəlinirdi. Lakin Həsən bəy Məlikov (Zərdabi) bütün bu cür halların heç birinə məhəl qoymayıb, öz mövqeyindən bir addım belə geri çəkilmirdi. Belə ki, şəhərə içməli su çəkilişi məsələsinin müzakirəsi zamanı dumada Bakıya içməli suyun dağlardan deyil, Ambarsum Melikovun Zuğulbadakı malikanəsindən çəkilməsi barədəki təklif razılıqla qarşılananda H.Məlikov (Zərdabi) bərk hiddətlənmiş, Melikovun ona rüşvət təklifini qəzəblə rədd etmişdi. Həsən bəy deyirdi ki, " – Mənim hər məğlubiyyətim maraqlarını müdafiə etdiyim adamların çoxlu qurbanlar verməsi deməkdir. Ona görə də uğursuzluqlarım və məğlubiyyətlərim mənə...ağır təsir göstərir." (9, 78-79)

Maraqlıdır ki, Ambarsum Melikovun şəhərin içməli su ilə təchizatı məsələsində arxasında şəxsi mənafe – külli miqdarda qazanc əldə etmək məqsədi güdən canfəşanlıqları uğursuzluğa uğradı və Bakı şəhərinə içməli su çəkilməsi məsələsi Həsən bəyin və onun tərəfdarlarının istəklərinə, ən başlıcası isə xalqın mənafeyinə uyğun şəkildə öz həllini tapdı. Bu işdə H.Məlikov Zərdabinin inadlı və ardıcıl mübarizəsi ilə yanaşı, Bakı şəhərinin içməli su ilə təchizinə təminat verən zəngin su ehtiyyatı mənbələrinin müəyyənləşdirilməsinə cəlb eidlən mütəxəssislərin uzunmüddətli axtarış və təhlillər nəticəsində gəldikləri obyektiv elmi qənaətləri də, Dumanın fəxri sədri, milyonçu H.Z.Tağıyevin dəstəyi ilə əhəmiyyətli rol oynamışdı.

Qeyd edək ki, elmi-tarixi mənbələrin göstərdiyinə görə, əvvəlki illərdə Bakı şəhərinə onun yaxın ətrafından üç mənbədən çəkilən su təchizatı sistemləri artıq xeyli böyüyüb inkişaf etmiş, həm əhalinin sayına, həm də sənaye obyektləri və inzibati idarələrin miqyasına görə geniş bir ərazini (və çoxsaylı əhalini) özündə birləşdirən Bakı şəhəri üçün son dərəcə zəif imkanlara malik olduğu üçün şəhərə yeni su kəmərinin çəkilməsi məsələsi qarşıda ən əhəmiyyətli və vacib problemlərdən biri kimi dayanmaqda idi. Ona görə Bakı şəhər duması 1878-ci ildən həmin problemin həlli üzərinə dəfələrlə qayıtmış, yeni su ehtiyyatlarının müəyyən olunması və onun layihələndirilməsi üçün mütəxəssislər, maliyyə mənbələri axtarışına çıxmışdı. Bu istiqamətdə müxtəlif vaxtlarda Bakıya dəvət olunub ona şəhər üçün zəngin içməli su ehtiyyatlarının müəyyənləşdirilərək çəkilməsini layihələndirmək məqsədi ilə mütəxəssislər dəvət edilib tapşırıqlar verilir, tədqiqat qrupları təşkil edilirdi. Alman mühəndis Şollun bu məqsədlə apardığı tədqiqatlardan gəldiyi elmi nəticələr ümidverici və inandırıcı, həm də hər cəhətdən səmərəli idi. Ancaq o, 1902-ci ildə malyariya xəstəliyinə tutulduğuna görə Azərbaycanı tərk etməli olur. Şollun işlərini davam etdirən cənab Şon Pfiffer alınan nəticələri Almaniyanın Frankfurt-Mayn şəhərindən Hacı Zeynalabdin Tağıyev tərəfindən Bakıya dəvət olunan ingilis əsilli mühəndis Vilyams Lindley həm Şollun araşdırmalarının nəticələrinə, həm də öz axtarış və təhlilləri əsasında gəldiyi qəti qərar əsasında Şollar-Bakı su kəməri layihəsini təqdim edib elmi dəlillərlə əsaslandırır. O, Şollar-Bakı su kəməri layihəsini irəli sürüb onun perspektivliyinə və səmərəliyinə çoxlarını inandıra bilir. Alimin layihəsi Bakı şəhər Duması tərəfindən 5 may 1909-cu ildə qəbul edilərək, onun həyata keçirilməsi istiqamətində işlərə başlanır... (10, 70-73; 204-206; 284; 303; 413-414 və s.)

Digər məsələlərlə yanaşı Bakı şəhərinin içməli su ilə təchizi ilə bağlı aparılan müzakirələrdə H.Məlikov Zərdabi həm iclaslardakı, həm mətbuat səhifələrindəki çıxışları, həm də su komissiyasındakı fəaliyyətində özünün vətəndaşlıq mövqeyini həmişə açıq və qətiyyətlə ifadə etmişdir. Məsələn, Bakıya içməli su kəmərinin çəkilməsi məsələsinin Dumanın hər yeni tərkibində müzakirəyə çıxarılsa da, nəticəsiz qalıb növbəti seçkiyədək uzanmasına Həsən bəy "Kaspi" qəzetində dərc etdirdiyi məqalələrinin birində münasibətini belə bildirmişdi: "Hər 4 ildən bir Dumanın tərkibi yeniləşdikcə içməli su məsələsi gündəmə gəlir, qızğın müzakirə olunur, su mənbəyi axtarışlarına, yol və digər xərclərə pul ayrılır və sonra arxivə verilir ki, 4 ildən sonra bir də ortaya gəlsin, bir də xərclər çəkilsin. (11)

H.Zərdabi Bakıya içməli su kəmərinin çəkilməsinin taleyüklü, həyat əhəmiyyətli bir məsələ olduğunu diqqətə çatdırmaqla yanaşı belə bir məsələyə münasibətdə şəxsi qazanc və kommersiya maraqlarının durması ilə heç cür barışa bilmirdi. Ona görə şəhər idarəsinin belə bir məsələnin həllinə yarıtmaz münasibətini tənqid edərək yazırdı: "Bizim içməli suyumuz yoxdur və bunda bizim şəhər idarəsi günahkardır... Bizim küçələrimiz sulanmır, yanğınları söndürmək üçün su yoxdur – yenə də şəhər idarəsinin üzündən. Hətta şəhər küçələrində ağacları sulamaq üçün də su yoxdur. Əgər xüsusi şəxslər istədikləri vaxt hətta içməli su tapırlarsa, bizim şəhər idarəsi isə sərəncamında olan texnika və milyonlarla vəsaitə malik ola-ola nəinki içməli su, hətta dəniz suyu belə tapmırsa, deməli nə isə başqa işlər baş verir". (12)

Bütün bunlar azərbaycanlı deputatların, o cümlədən Həsən bəy Məlikov Zərdabinin Bakı şəhər dumasındakı fəaliyyətlərinin də milli və ictimai faydalığındakı, təəssübkeşliyindən, vətəndaşlıq məsuliyyəti üstə köklənməsindən irəli gəlir, xəbər verir.

Bildiyimiz kimi, "Şəhər əsasnaməsi"nə görə, Bakı şəhər duması üzvlərinin ancaq üçdə biri qeyri-xristian, yəni müsəlman əhalinin üzvü ola bilərdi. Üçdə iki hissəsi isə ruslar, ermənilərlə yanaşı xristian dininə məxsus digər millətlərin nümayəndələri üçün nəzərdə tutulmuşdu. Azərbaycan xalqının qabaqcıl görüşlü nümayəndələri bu vəziyyətlə barışmaq istəmir, şəhər əhalisnin əsas hissəsini təşkil edən və ərazinin əsl sahibi olan müsəlmanların duma hüquqlarının pozulmasına qarşı qətiyyətlə mübarizə aparır, Bakı şəhər dumasında müsəlman əhalisi nümayəndələrinin – üzvlərinin say tərkibinin 50 faizə çatdırılmasına nail olmağa çalışırdılar. Bu məsələyə münasibətdə də H.Zərdabi hələ Bakı şəhər dumasına üzv seçilməzdən əvvəl xüsusi fəallıq göstərmişdi. Həsən bəyin inadlı, ardıcıl və məqsədyönlü, taktiki fəaliyyəti nəticəsində, nəhayət, qanunda (əsasnamədə) dəyişiklik edildi – Bakı şəhər duması üzvlərinin dumada say tərkibinin 50 faiz təşkil etməsinə şəhər bələdiyyə rəisi Rayevskinin razılığı ilə icaazə verildi. Bu vəziyyət 1906-cı ilədək davam etdi. (13, 49-50) Bakı şəhər Dumasında müsəlman əhalinin nümayəndələrinin say tərkibinin nisbətinin yüksəldilməsi Dumada müsəlman qlasnıların təsir gücünün artmasında əhəmiyyətli rol oynadı. Görkəmli dövlət xadimi Əlmərdan bəy Topçubaşovun - müsəlman əhalinin nümayəndəsinin 1901-ci ildə Bakı şəhər dumasının sədri seçilməsi buna əyani misaldır.

Qeyd edək ki, Əlimərdan bəyin adının Bakı şəhər dumasına 1901-ci ildə keçirilən seçki siyahısına daxil etdirilməsində olduğu kimi, onun Dumaya sədr seçilməsi prosesi də qızğın müzakirə və mübarizə şəraitində keçmişdir. Bakı şəhər dumasına yeni seçilən azərbaycanlı qlasnıların əlbir fəaliyyətləri nəticəsində dumaya sədr irəli sürülən 4 namizədin içərisindən böyük səs çoxluğu ilə Ə.Topçubaşov seçilmiş və müvafiq administrativ yazışmalardan sonra o, Bakı şəhər Dumasında 1902-ci ilin fevralından Duma sədri kimi fəaliyyətə başlamışdı. (13)

Qeyd edək ki, Bakı şəhər Dumasına 1901-ci il 29 oktyabr və 18 noyabr tarixlərində keçirilən seçkilərdə Ə.Topçubaşovla yanaşı Həsən bəy Məlikov, Adil xan Ziyadxanov, Mövsüm bəy Xanlarov, Fərrux bəy Vəzirov, İbrahim və İsmayıl Səfərəliyevlər, milyonçulardan Hacı Zeynalabdin Tağıyev, Musa Nağıyev, Şəmsi Əsədullayev, İsa bəy Hacınski də şəhər dumasına üzv seçilmişdilər.

Əlimərdan bəy Topçubaşov Bakı şəhər dumasına sədrlik etməklə yanaşı, dumanın təhsil, su təchizatı, texniki, təşkilat və komissiyalarında, Qəyyumlar şurasında da üzv kimi fəallıq göstərirdi. O, 1904-cü ildə Bakını bürümüş olan vəba epidemiyasının və onun fəsadlarının aradan qaldırılması istiqamətində də həm duma sədri, həm də "Kaspi" qəzetinin redaktoru kimi səmərəli işlər görmüşdür...(14) Professor Vilayət Quliyev Ə.Topçubaşovun Bakı şəhər Dumasındakı fəaliyyətindən danışarkən yazır: "Ə.Topçubaşov... 1902-ci ildə xalqın – Azərbaycan türklərinin ilk nümayəndəsi kimi Bakı şəhər Dumasının sədri seçilmişdi. 1905-ci ilə qədər bir neçə mühüm komissiya və şuranın üzvü olmaqla yanaşı, qanunverici orqanın işinə rəhbərlik etmişdi. Bu mühüm vəzifədə çalışdığı üç il ərzində şəhərin abadlaşdırılması üçün böyük işlər görmüş, maarifin, mədəniyyətin, səhiyyənin inkişafına mühüm töhfələr vermişdi. Çoxmillətli, çoxkonfessiyalı Bakıda dini-etnik zəmində meydana çıxan qarşıdurmaları önləmək üçün titanik fəaliyyət göstərməli olmuşdu". (15,14)

Onu da əlavə etməyi lazım bilrik ki, 1899-1903-cü illərdə Bakı şəhər dumasının katibi vəzifəsində Azərbaycan xalqının nümayəndəsi Məhəmməd bəy Hüseynbəyov, 1903-cü ildən isə məşhur dramaturq Nəcəf bəy vəzirov işləmişdir.

Beləliklə, XX əsrin ilk illərindən başlayaraq Bakı şəhər dumasında və sosial-mədəni həyatda Azərbaycan xalqının açıq fikirli, vətənpərvər ruhlu nümayəndələrinin sayı hiss olunacaq dərəcədə artdığı kimi, nüfuzları və sosial-siyasi çəkiləri də yüksəlməyə başladı. Bütün bunlar qarşıdan gələn digər ictimai və siyasi hadisələr-inqilab. Milli muxtariyyət və istiqlal uğrunda mübarizədə Azərbaycan xalqının təşkilatlanmasında da mühüm əhəmiyyət kəsb etdi.

**Ədəbiyyat:**

1. Bayramoğlu A. Quberniya mərkəzinin Şamaxıdan Bakıya köçürülməsinə dair. “Azərbaycan” qəz., 20 noyabr 1996

2. Мурадалиева Е. Городы Северного Азербайджана во второй половине XIX веке. Издательство Бакинского Университета, Баку, 1991, 168 стр.

3. Милман А. Как избирали органы «Самоуправления в дореволюционном Азербайджане». Азернешр, Баку, 1961,133 стр.

4. Həsən bəy Zərdabi, Fərhad Ağazadə. “Əkinçi”. “Xalq qəzeti”nin nəşri. Bakı. “Xalq qəzeti”, 2008. 53 s.

5. Nəriman Nərimanov. Hacı Zeynalabdin Tağıyevin əlli illik məişəti və cəmaətə xidmətləri.Badkubə, 1900, 33 s.

6. İzzət Rüstəmov. Həsən bəy Zərdabi. Bakı, 2012, 236 s.

7. Эсмира Джавадова. Гасан бек Меликов (Зардаби) – выдающийся общественный деятель. Деятельность Гасан бека Меликов (Зардаби) в Бакинской Городской Думе (1897-1907). Баку, «Элм ве тэхсил» - 2015, стр. 4-32

8. Деятельность Гасан бека Меликов (Зардаби) в Бакинской Городской Думе (1897-1907). Баку, «Элм ве тэхсил» - 2015. 456 стр.

9. Vilayət Quliyev. “Böyük Əkinçi” . Tərtib, tərcümə, müqəddimə, izah və şərhlər.180 s.

10. “Su ehtiyyatları, hidrotexniki qurğular və ətraf mühit mövzusunda beynəlxalq elmi-praktiki kofransın materialları. 15-16 mart 2017-ci il. Bakı şəhəri, Azərbaycan. Bakı 2017, 456 s.

11. “Kaspi” qəz., 1901, № 70

12. “Kaspi” qəz., 1902, № 16, 1903 №5

13. ARTA fond 50, siyahı 1, sax.vah.194, vərəq 68, 78 və s.

14. Əlimərdan bəy Topçubaşov. “...Xalqımızın müstəqil yaşayacağına inanırdıq”. Tərtib, tərcümə, müqəddimə, izah və şərhlərin müəllifi Vilayət Quliyev. Azərbaycan Tərcümə Mərkəzi, Bakı, 2018. 688 s.

15. Vilayət Quliyev. Əlimərdan bəy Topşubaşov: Portret cizgiləri. Əlimərdan bəy Topçubaşov. “ Qalqımızın müstəqil yaşayacağına inanırdıq”. Bakı, 2018, s.9-36. S.688

**Baku City Duma and Azerbaijani deputies**

**Summary**

In the second half of the 19th century, after the acceptance of “city statue” it is also allowed to the formation and functioning of self-governing bodies – city duma and city administration in Baku. After this the Muslim elite of the city (azerbaijani) are actively participated in the activity and elections of city duma.
In the article are talking about the activities of the Duma’s member in Baku city duma H.Zardabi, A.Topchubashov, H.Z.Taghiyev and others. Different content and directional work by Azerbaijani deputies in different committees of Duma are illuminated reference with historical and scientific sources.

**Бакинская Городская Дума и депутаты - азербайджанцы**

**Резюме**

Со второй половины XIX века после принятия «Городского правила» в городе Баку было разрешено сформировать органы самоуправления городской думы и городского управления. После этого на выборах в городскую думу и в деятельности думы активно участвовала мусульманская ( азербайджанская) элита.

В статье говорится о деятельности членов Бакинской городской думы Г.Зардаби, А.Топчубашева, Г.З.Тагиева и др. Освещается содержание и направление деятельности депутатов – азербайджанцев думы в разных комиссиях, опираясь на конкретные исторические факты и научные источники.

**Rəyçi: dos. R.Bayramova**

**Hacızadə Fəhmin Məftun oğlu**
Azərbaycan Turizm və Menecment Universiteti
fehmin_hacizade@mail.ru

# NAXÇIVAN TURİZM BÖLGƏSİNDƏ FƏALİYYƏTDƏ OLAN TURİST MARŞRUTLARI

***Açar sözlər:*** *Naxçıvan, tarixi abidələr, memarlıq abidələri, turizm*
***Key words:*** *Nakchivan, historical monuments, architectural monuments, tourism*
***Ключевые слова:*** *Нахчыван, исторические памятники, архитектурные памятники,т уризм*

## Giriş

Naxçıvan zəngin turizm ehtiyatları – qədim tarixi və müasir inkişafı, rəngarəng təbii müxtəlifliyi və unikal müalicə-rekreasiya məkanları, yaradılmış müasir sosial-mədəni infrastrukturu ilə güclü turizm cazibəsinə malikdir. Naxçıvan MR-nın qədim tarixə malik olması, özünəməxsus iqlimi, burada olan tarixi memarlıq abidələri, dadlı mətbəxi, bol meyvə-tərəvəzi, müalicə mənbələri, yerli əhalinin qonaqpərvərliyi daim turistləri özünə cəlb etmişdir. Eyni zamanda Naxçıvanın əlverişli zonada yerləşməsi, dağ iqlimi burada turizmin inkişafına şərait yaradır. İl ərzində 400 mindən artıq turistin səyahət etdiyi muxtar respublikamıza gələn qonaqlar buradan dərin təəssüratlarla ayrılır. Bütün bunlar Şərqlə Qərbin qovşağında yerləşən Naxçıvanın ümumi inkişafına mühüm təsir göstərməklə, eyni zamanda Azərbaycanın mədəniyyətini dünyaya tanıtmaq üçün də yaxşı fürsətdir.

## Əsas hissə

Günü-gündən inkişaf edən, müasirləşən qədim Azərbaycan torpağı Naxçıvan Muxtar Respublikasının turizm potensialı çox böyükdür. Buna həmçinin Naxçıvan MR-nın coğrafi mövqeyi, əlverişli iqlimi, təbiəti, füsünkar yaşıllıqları, flora və fauna nümunələri, tarixi abidələri şərait yaradır. Turizmi daha da inkişaf etdirmək üçün burada bir çox lazımlı işlər görülmüşdür. Belə ki, müasir standardlara uyğun hotel və mehmanxanalar tikilib istifadəyə verilmiş, istirahət parkları salınmış, tarixi hadisələrin canlı şahidi olan memarlıq nümunələrində təmir-bərpa və restavrasiya işləri aparılmışdır. Muxtar Respublika ərazisində qədim dövrlərin nümunləri olan təbiət və tarixi abidələr yəni Qarabağlar Memarlıq Kompleksi, Əcəmi Əbu Bəkrin əl işləri olan Möminə Xatun, Yusif ibn Küseyr türbələri, əyilməzlik simvolu olan Əlincə qalası, təbiət abidələrindən Babək qalası, Əshabi-Kəhf, Göy-göl, qədim insan məskənləri olan Gəmiqaya və Kilit mağarası, 800 ildən çox yaşı olan qocaman, əzəmətli Şərq Çinarı turistlərin diqqəti özünə daha çox özünə cəlb edir [12, səh 161].

Naxçıvan turist marşurtuna daxil olan bölgələr: Bakı-Naxçıvan-Ordubad-Culfa-Babək-Şahbuz-Şərur-Kəngərli.

**Naxçıvan şəhəri** Naxçıvan MR-nın ən əsas şəhəridir və inzibati mərkəzi hesab olunur. Dəniz səviyyəsindən 1000 m hündürlükdə yerləşən Naxçıvan şəhəri Naxçıvançay çayının sağ sahilində yerləşir və paytaxtımız Bakı şəhərindən 560 km uzaqlıqdadır. Arxeoloji qazıntılar nəticəsində aparılan tədqiqatlar hesabına Naxçıvan şəhərində eramızdan əvvəl II-I minilliklərə aid çoxlu maddi-mədəni dəlilllər tapılmışdır. Yerli sakinlər isə burada yaşayış məskənlərinin salınmasını Nuh peyğəmbərin adı ilə bağlayırlar. Belə rəvayət olunur ki, Böyük daşqından xilas olmaq üçün Nuh peyğəmbərin gəmisi quruya yan almaq məqsədilə üç dəfə Kiçik Qafqaz sıra dağ zirvələrinə toxunur. Bu toxunuş İlandağ, Qapıcıq, Alagöz zirvələrinə olmuşdur. Daşqın çəkildikdən sonra Nuh peyğəmbər və onun tərəfdarları uzun müddət bu torpaqlarda yaşamış və Nuh peyğəmbər burada vəfat etmişdir [18, səh 140].

Naxçıvan şəhərində yerləşən arxeoloji abidələrdən hesab olunan *Naxçıvan qalası* bu günkü gündə ən çox ziyarət edilən yerlərdən biridir. Abidə şəhərin cənub-şərq hissəsində yerləşir. El arasında "Köhnəqala" adı ilə də tanınır. Qala tarixi mənbələrdən alınan məlumatlara əsasən 632-652-ci illərdə inşa olunmuşdur və XIX əsrə qədər fəaliyyət göstərmişdir. Qala əsasən iki hissədən ibarətdir – Narınqala və Böyükqala. Qala müdafiə xarakterli olub, burada 300-dən çox adamın qoruna biləcəyi sığınacaq mağara vardır. Mağaradan Naxçıvançaya qədər gedən gizli yol mövcuddur. Su kəhrizləri qalanın içərisində yerləşir. Mağara yuxarıdan oyulmuş işıqla işıqlandırılır. 2010-2013-cü illərdə tarixi abidədə təmir-bərpa işləri aparılmışdır. Respublikamızın prezidenti İlham Əliyev cənabları 2014-cü il aprel ayının 7-də "Naxçıvan qala" Tarix-Memarlıq Muzey Kompleksinin açılış mərasimində şəxsən iştirak etmişdir [42].

Naxçıvan MR-nın şərq hissəsində **Ordubad şəhəri** yerləşir. Bu şəhər Muxtar Respblikanın ikinci böyük şəhəridir. Bu şəhər təzadlı iqlimi, əsrarəngiz təbiəti, təmiz havası, dərman bitkiləri, flora və faunası ilə diqqəti cəlb edir. Dəniz səviyyəsindən 850 m hündürlükdə olan Ordubad şəhəri XII yüzillikdən məlumdur.

Qədim tarixə malik olan bu şəhərdə bir sıra tarixi abidələr mövcuddur. Bunlardan biri də *Gəmiqaya*dır. Bu tarixi abidə Tivi və Nəsirvaz kəndlərindən şimal-şərqdəki dağ yəni Zəngəzur dağ silsiləsində olan zirvədir. Gəmiqaya zirvəsinin hündürlüyü 3725 m-dir. Bu əzəmətli zirvə daim buludlarla örtülü olduğundan uzaqdan mavi səmada üzən gəmiyə bənzəyir. Ona görə də xalq arasında Qafqazın ən uca zirvəsi olan Qapıcıq dağına Gəmiqaya adı verilmişdir [11, səh 156].

Gəmiqaya təsvirlərinə Qapıcıq dağının şərq və cənub yamaclarında yerləşən, Qaranquş yaylağında, Nəbi yurdunda və Kiçik Qafqazın Ordubad dağlarında olan rəsmlər aiddir. Arxeoloji qazıntılar nəticəsində məlum olmuşdur ki, bu yerlər Azərbaycan türklərinin ulu babalarının yurd yerləri olmuşdur. Burada yaşayan sakinlər əsasən ovçuluqla məşğul olmuşlar. Bu tarixi abidə özünün görünüşü, əzəməti ilə ora gələnlərin heyrətinə səbəb olur. Eramızdan əvvəl IV-I minilliklərə aid olan qayaüstü rəsmlər, piktoqramlar daha çox maraq doğurur. Qayalar üzərində olan insan, müxtəlif heyvan rəsmləri, ov səhnələri, yay-ox təsvirləri həkk olunmuşdur. Qayalar üzərində olan təsvirlər 1968-ci ildən daha dərindən öyrənilməyə başlanılmışdır. Heyvan rəsmlərinin çoxu keçi rəsmlərindən ibarətdir. Heyvanlar tək-tək və ya sürü ilə təsvir edilmişdir. Bəzi yerlərdə öküz qoşulmuş araba təsvirləri də görünür. Burada olan ov kompazisiyalarına baxdıqda ovçuların əsasən ox, kaman və kəməndlə silahlanaraq ov etdiyi məlum olur. Piktoqrafik təsvirlərə baxdıqda burada rəmzi işarələr – çərxifələnk nişanı, dairələr, üçbucaqlı, dördbucaqlı işarələr diqqəti cəlb edir. Bu cür təsvirlər arxeoloji qazıntılar zamanı tapılmış boyalı qablar üzərində də cızılmışdır. 2001-ci ilin aprelin 26-da Naxçıvan MR Ali Məclisinin Sədri tərəfindən verilmiş sərəncama əsasən Gəmiqayada aparılan arxeoloji qazıntılar və tədqiqatlar genişlənmiş bura dərindən öyrənilməyə başlamışdır [31].

XVII əsrə aid olan Ordubad rayonunun Aza kəndində Gilançayın üzərində yerləşən *Aza körpüsü* beş aşırımlıdır. Bu körpü Səfəvi hökmdarı I Şah Abbasın dövründə inşa edilmişdir. Aza körpüsü Böyük İpək Yolu ilə şərqdən qərbə və əksinə yol alan ticarət karvanlarının işini daha da asanlaşdırmaq məqsədi ilə salınmışdır. Bir çox təbiət hadisələri, güclü sel və daşqınlar nəticəsində dağıntılara məruz qalmış bu körpü 1997-ci ildə əsaslı olaraq yenidən qurulmuşdur. Hal-hazırda yerli əhali bu körpüdən istifadə edir.

Naxçıvan şəhərinin şərqində yerləşən **Culfa rayonu** ərazisindən Araz, Qardərya və Əlincə çayları axır. Araz çayının sahilində yerləşən Culfa rayonu İranla həmsərhəddir. Arazın o biri sahilində onunla simmetrik İranın Culfa rayonu yerləşir. Culfa rayonu da özünün füsünkar təbiəti, dağlıq, meşəlik zonası ilə seçilir. Rayon ərazisində XIII yüzlilliyə aid kiçik Gülüstan məqbərəsi, karvansara, XV əsrə aid Dər kəndi yaxınlığında yerləşən üç məqbərə, XII-XIII yüzilliklərə məxsus olan Əlincə qalası kimi abidələr vardır.

Culfa rayonunun Xanəgah kəndində Əlincə çayının sahilində *Xanəgah abidə kompleksi* yerləşir. Bu abidə orta əsrlərə aiddir. Xalq arasında bu abidə Şeyx Xorasan kompleksi də adlanır. Kompleksə türbə, məscid və bəzi tikililər daxildir. Türbədə tapılan daş kitabəyə əsasən kompleksin Uluq Qutluq Lala bəyin əmri ilə tikilmişdir. Türbənin memarı Xacə Cəmaləddin olmuşdur. Burada olan qəbirdə kimin dəfn edilməsi ilə bağlı müxtəlif fikirlər vardır. Bu fikirlərdən birinə görə, burada Əlincə qalasında faciəli şəkildə öldürülən, Hürufilik təliminin banisi Fəzullah Nəiminin müridləri tərəfindən cənazəsi dəfn olunmuşdur. El arasında bu abidənin Şeyx Xorasan kimi adlandırılmasının səbəbi F. Nəimi ilə bağlıdır. Çünki F. Nəimi Xorasanda təhsil almış və ləqəblərindən biri Şeyx Xurasanmış.

**Babək rayonu** həm dağ, həm də düzənlik reylefinə malikdir. Belə ki, şimal və cənub-şərq hissəsi dağ reylefi, cənub-qərb hissəsi isə düzənliklərdən ibarətdir. Burada ən uca dağ zirvəsi Qaraquş, Keçəltəpə, Buzqov zirvələridir. Babək rayonu mineral suları ilə məşhurdur. Burada Sirab, Vayxır, Qahab mineral su qaynaqları və daş duz yataqları vardır. Rayon ərazisində Naxçıvançay və bu çayın qolu olan Çəhirçay çayları axır. Rayonda həmçinin meşəliklər də vardır. Əhali heyvandarlıq, üzümçülük, taxılçılıq, bostançılıqla məşğuldur. Babək rayonunda olan memarlıq abidələri qədim tarixə malikdir.

Rayonun Qaraqala kəndində yerləşən *Miranşah piri* eramızdan əvvəl III-II minilliklərə aid olduğu güman edilir. Pir vaxtilə qaya oyuğunda olmuşdur. Hazırda pir bərpa olunaraq üzərində monumental abidə inşa edilmişdir.

Bundan başqa, XVIII əsrə aid olan *Nehrəm İmamazdəsi* də turistlərin marağına səbəb olur. Bu tarixi abidə rayonun Nehrəm kəndində yerləşir. Burada aparılan bir çox təmir-bərpa işləri nəticəsində Nehrəm İmamzadəsi türbə, məscid, təkyə və bir çox tikililər inşa edilərək kompleks şəklini almışdır. Türbənin içərisində bir qəbir vardır. Yerli əhali arasında yayılan deyimlərə görə bu qəbirdə VII imam Museyi-Kazımın oğlu Seyid Əqil dəfn edilmişdir.

Naxçıvan Muxtar Respublikasının şimal hissəsində yerləşən **Şahbuz rayonu**nun ərazisi dağlıqdır. Biçənək dağ aşırımı bu rayonun ərazisindən keçir. Rayon öz mineral suları ilə tanınır. Batabat, Badamlı, Biçənək və Karvansara kimi mineral suları vardır. Burada olan Qanlıgöl, Batabat gölləri öz əsrarəngiz gözəllikləri ilə diqqəti özünə cəlb edir [53].

Rayonun Biçənək kəndində yerləşən *"Fərhadın evi"* tarixi abidəsi xalq arasında Nizami Gəncəvinin əsərinin qəhramanı olan Fərhadın adı ilə bağlanır. Abidə qayada qazılmış dörd otaqdan ibarətdir. Giriş qapısının sağında və solunda kişi və qadın təsvirləri həkk edilmişdir. Aparılan tədqiqatların nəticəsində belə məlum olmuşdur ki, Fərhadın evi abidəsi eramızdan əvvəl I minilliyin sonu, eramızın ilk əsrlərinə aiddir.

Biçənək kəndində meşənin içərisində *Batabat karvansarayı* yerləşir. Bura iki otaqdan ibarətdir. Otaqlar iri qaya parçalarından dördkünc formada inşa edilmişdir. Aparılan tədqiqatlara əsasən Karvansarayın XVII-XVIII əsrlərə aid olduğu güman edilir.

Kaha dərəsi boyunca uzanan yolun üzərində uzunluğu 25 m, eni 1.5 m-ə çatan *Batabat müdafiə divarları* Şahbuz rayonu ərazisində arxeoloji abidədir. Bu abidəyə arxeoloji turlar təşkil etmək olar.

Naxçıvan MR-nın qərbində **Şərur rayonu** yerləşir. Ərazisinin böyük hissəsi dağ reylefinə malikdir. Dərələyaz dağ silsiləsi bu rayonun ərazisindədir. Ən yüksək dağ 2775 m olan Qalınqayadır. Araz çayının qolu olan Arpaçay bu ərazidən keçir və suvarma məqsədilə istifadə olunur.

Eramızdan əvvəl II-I minilliklərə aid olan qədim yaşayış məskənlərindən olan *Oğlanqala* Şərur rayonunda Arpaçay çayının sahilində, Qaratəpə dağındadır. 40 ha sahəni əhatə edən yaşayış məskəninin ətrafı müdafiə divarları ilə əhatə olunmuşdur. Memarlıq üslubuna görə assurların dağ qalalarına bənzəyir. Əlverişli strateji coğrafi mövqedə yerləşdiyi üçün uzun müddət müdafiə istehkamı kimi fəaliyyət göstərmişdir.

Babək və Şərur rayonları arasında **Kəngərli rayonu** yerləşir. Rayon əsasən dağlıq reylefə malikdir. Araz çayı bu rayonun ərazisindən axır.

Möhtəşəm memarlıq abidəsi olan *Qarabağlar Türbə Kompleksi* Kəngərli rayonunun Qarabağlar kəndinin ərazisində yerləşir. Abidə kompleksi XII – XIV əsrə aiddir. Kompleksə qoşaminarəli baştağ, türbə və dini təyinatlı tikililər daxildir. Zaman keçdikcə abidənin bəzi hissələri dağılmış, üzərində olan kitabələr isə itmişdir. Qalan kitabələrə əsasən Kompleksin tikilməsini Cahan Qudi Xatın əmri əsasında inşa edilməsi güman olunur [41].

4 iyul 2016-cı il tarxində Qarabağlar Türbə Kompleksində Naxçıvan Muxtar Respublikası Ali Məclisi Sədirinin Sərəncamına əsasən təmir-bərpa işləri aparılmışdır.

Kəngərli rayonu Şahtaxtı kəndində *Şahtaxtı arxeoloji abidəsi* yerləşir. Abidə kənddən keçən Asnı çayının sahilindədir. Tədqiqatlar nəticəsində aydın olmuşdur ki, abidə bir neçə cərgə qala divarları ilə əhatə olunmuşdur. Bu qala divarlarının orta tunc dövründə inşa olunduğu güman olunur. Qala divarları əsasən müdafiə xarakterlidir. Abidə dağıntılara məruz qalmışdır. Tədqiqatçı alimlər burada kəşfiyyat xarakterli araşdırmalar aparmış və məlum olmuşdur ki, abidə eramızdan əvvəl III-I minilliklərə aiddir [38].

## Nəticə

Azərbaycanın ayrılmaz hissəsi olan Naxçıvan bölgəsinin turizm potensialını tədqiq edərkən aydın olur ki, bölgə mədəni, tarixi və təbii resurslarla olduqcə zəngindir. Burada mövcud potensialdan istifadə edilməklə mədəni, tarixi turizm növləri inkişaf etdirilmişdir.

Əhalinin maariflənməsi, abidələrin tanıdılması məqsədilə KİV-də, internet portallarında, turizm saytlarında daha çox məlumatlar verilməli, abidələr broşurlar, metodik vəsaitlər, turist kitabçaları çap edilməli və ən əsası müxtəlif dillərdə tərcümələr edilməlidir.

## Ədəbiyyat:

1. Həbibə Soltanova – Azərbaycan Respublikasında turizm və onun inkişafı. Bakı, 2015. Səh. 316.
2. Məsim Abadov – Azərbaycan turizmi və onun inkişaf problemi. Bakı, Şərq Qərb Nəşriyyatı, 2014. Səh. 161.
3. Naxçıvan abidələri ensiklopediyası – Naxçıvan Nəşriyyatı. 2008. Səh. 434.
4. Vəli Baxşəliyev, Fizzə Quliyeva – Naxçıvanın tarixi abidələri. Bakı-Nurlan-2017. Səh. 140.
5. http://azerbaijan.az/portal/Society/Tourism/tourism_a.html?tourism_17
6. http://imp.nakhchivan.az/index.php/pages/imamzad-l-r
7. http://nakhchivan.preslib.az/az_d1.html
8. http://www.nakhchivan.az/portal-1/index-2.htm
9. http://www.turizm.nakhchivan.az/index.php/khaebaer/1073-05022019

**Tourist routes in Nakhchivan**
**Summary**

There are detailed information about historical monuments of Nakchivan in this article and the importance of these monuments for tourism is shown. Nakhchivan Autonomous Republic, with its wonderful nature, ancient and unique historical monuments, modern city infrastructure attract tourists from all over the world.

**Туристические маршруты в Нахчыване**
**Резюме**

В данной статье представлена подробная информация об исторических памятниках Нахчывана и показана важность этих памятников для туризма. Нахчыванская Автономная Республика с ее прекрасной природой, древними и уникальными историческими памятниками, современной городской инфраструктурой привлекает туристов со всего мира.

**Rəyçi: dos. N. B. Nəsirli**

**BEYNƏLXALQ MÜNASİBƏTLƏR INTERNATIONAL RELATIONS**
**МЕЖДУНАРОДНЫЕ ОТНОШЕНИЯ**

**Nəsirova Kəmalə Fuad qızı**
Bakı Slavyan Universiteti

# QLOBALLAŞAN DÜNYADA QAÇQIN VƏ MƏCBURİ KÖÇKÜN PROBLEMİ

***Açar sözləri:*** *Azərbaycan, Qaçqın, Məcbun köçkün, BMT-nin Qaçqınlar üzrə Ali Komissarlığı, ATƏT, Qaçqınkom, BMT*
***Key words:*** *Azerbaijan, Refugee, IDP, UN High Commissioner for Refugees, OSCE, UNHCR, H.ALİYEV*
***Ключевые слова****: Азербайджан, Беженцы, ВПЛ, Верховный комиссар ООН по делам беженцев, ОБСЕ, УВКБ ООН, ООН*

XX əsrin əvvəlindən başlayaraq qaçın problemi ilə qarşılaşan dünya birliyi Qaçqınların müdafiəsi və onlara yardım göstərməsi funksiyasını öz üzərinə götürmüşdür. Müasir dünyamızda insanlar daha təhlükəsiz firavan şəraitdə yaşamalıdırlar. Bəli yaşamalıdırlar. Çox təəsüf edici haldır ki, müharibələrin baş verməsi qaçqın və məcburi köçkün ordusunun formalaşması dünyanın qlobal problemlərindən biridir. Qaçqın və məcburi köçkün problemi dünyanı öz ahuşuna alıb desem yanılmaram. Qaçqın və Məcburi köçkün problemi Azərbaycan Respublikasından yan keçməyib. Tarixə nəzər salsaq görərik ki, 1905,1918-1920,1948 və soncu etnik təmizlənmə 1988-1993 cü illər ərzində baş vermişdi. Ermənistan Respublikasının etnik təmizləmə siyasəti nəticəsində yüz minlərlə azərbaycanlı öz doğma torpaqlarından qovuldular. Daha dəqiq desek deportasiyaya məruz qalıblar. İyirmi bir il ərzində ölkə əhalisinin təbii artımı 100:1faizə nisbətinə əsasən qaçqın və məcburi köçkünlərin sayı da artıb ilə 10min artmaqla bu rəqəm bir milyon 200 minə çatıb.(1-1)Azərbaycanda hər 8 nəfərdən biri qaçqındı. Azəbaycan vətəndaşları öz torpaqlarında məcburi köçkünə çevrildi. Dövlətimiz üçün çox acınacaqlı məsələdir. Hər bir qaçqın pənah apardığı ölkə üçün kifayət qədər problem yaşadır. Qaçqın və məcburi köçkün problemi Azərbaycan üçün iqtisadi, mədəni, sosial sahələrdə kifayət qədər problemlər yaşatdı. Müharibə şəraitində də olan ölkəmiz üçün qlobal bir problemə çevrildi. Ulu önder Heydər Əliyevin uzaqgörən siyasəti nəticəsində məcburi köçkünlərin məskunlaşdığı çadır düşərgələri növbə ilə sökülməyə başladı. Heydər Əliyev BMT-nin Qaçqın və Məcburi köçkünlər üzrə Ali Komissarlığına müraciət ünvanladı. Dünya birliyini bu ədalətsizliyə göz yumamağa çağırdı. Ulu öndər Heydər Əliyevin diplomatiyası sahəsində Ermənistan- Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin əsl mahiyyətini dünya içtimayyətinin diqqətinə çatdırmağa müvəffəq oldu. BMT-nin Təhlükəsizlik Şurası tərəfindən münaqişənin sülh yolu ilə həlli, işğal olunmuş ərazilərin Ermənistan silahlı qüvvələrindən azad edilməsi qaçqın və məcburi köçkünlərin doğma yurdlarına qaytarılması haqqında 4 qətnamə qəbul edilmişdir. 1993-cü il 30 aprel tarixli 822 nömrəli, 29 iyul tarixli - 853 nömrəli, 14 oktyabr tarixli - 874 nömrəli, 884 nömrəli 11 noyabr tarixində qətnamələr qəbul edildi.(2-s 176) Çox təəsüf edici haldır ki, təcavüzkarla təcavüzə məruz qalan, işğalçılıq siyasəti aparan, ərazi bütövlüyü prinsipini pozanlara qarşı sərt cəzalar tətbiq olunmur. Məhz Ulu önderin fəaliyyəti nəticəsində 1994-cü ilin may ayında atəşkəsə nail olundu. Qaçqınlara olunan Beynəlxalq humanitar yardımların sayı gündən–günə artırdı. Ərazimizin 20% işğal altında olması bu problemin necədə dərin köklərə bağlandığının əyani sübutudur. Uzun illərdir ki, danışıqlar prosesi gedir amma bu günə qədər heç bir nəticə əldə olunmayıb. Konfiliktin həll olunmamasının bir necə siyasi aspektləri var:

I-ci Ermənistan tərəfinin qeyri-konstruktiv mövqe tutması;

II-ci Beynəlxalq ictimaiyyətin o,cümlədən problemin həlli ilə bilavasitə məşqul olan ATƏT-in Minsk qrupunun baş vermiş münaqişəyə hüquqi –siyasi qiymət verilməməsi;

III- İslamafobiyanın, dinlər arasındakı ayrı seçkilik, xristian və islam cəbhəsinin formalaşması, müsəlmanlara qarşı irqi ayrı seçkiliyin aparılması;

IV- İşğalçı Ermənistan dövləti danışıqlar prosesini kobud surətdə pozması;

V- Erməni lobisinin və onların havadarlarının mövcud olması

Prezident İlham Əliyev Ümummilli liderimiz Heydər Əliyevin uğurlu siyasətinin laiqli davamçısıdır. Prezidentimizin əsas məqsədi qaçqınların və məcburi köçkünlərin yaşayış şəraitini yaxşılaşdırmaq, onları öz yurd yuvalarına qaytarmaqdan ibarətdir. Uğurlu daxili və xarici siyasətimiz nəticəsinə siyasi arenada

,beynəlxalq təşkilatlarda ,regional daxili təşkilatlarda və digər sahələrdə də uğurlu addımlara imza atıb. Dövlət Neft Şirkəti hesabına, Dünya Fondunun maliyyə yardımları hesabına qaçqınların yaşayış şəraiti xeyli yaxşılaşıb. İlham Əliyevin uğurlu siyasəti hesabına "qaçqın" çadırları tamami ilə ləğv olundu. Onların mənzil şəraiti xeyli yaxşılaşdı. Humanitar sahəyə daha çox diqqət ayrılır. Müasir dünya Ermənistan dövlətini işğalçı təcavüzkar ölkə kimi tanımalıdır. Dünyada gedən qloballaşma prosesləri, Azərbaycanın Avropa İttifağı ilə sıx əməkdaşlığı, Beynəlxalq hüququn prinsipləri, demokratikləşmə prosesləri artıq təcavüzə əsaslanan siyasəti qəbul etmir. Azərbaycan dövlətinin siyasəti və mövqeyi yalnız beynəlxalq hüquq normalarına və prinsiplərinə əsaslanır. Beynəlxalq hüququn prisipləri adət hüququnun tərkib hissəsidir. 1) Güc tətbiq etməmək və ya güclə hədələməmək prinsipi, 2) Dövlətlərin suveren bərabərliyi prinsipi, 3) Sərhədlərin toxunulmamazlığı, 4) Dövlətlərin ərazi bütövlüyü prinsipi.(3-S 367) Sadaladığım prinsipləri işğalçı ermənistan tərəfindən pozulub. İşğalçı Ermənilər haqqında dünya ictimaiyyətinin statlarına nəzər salaq: Ermənilər gürcülərə məxsus olan və monastırlarda gürcülərin izini məhv edir, daş üzərində gürcü yazılarını qaşıyır yaxud silir, daşın özünü tikintidən çıxarır və onların əvəzinə erməni yazıları ilə əvəz edirlər.(4-3) Mən onlarla (ermənilərlə) heç zaman dil tapa bilmədim. Onların hiyləgərliyi olduqca iyrənc, alçaqlığı olduqca dözülməz, əclaflığı olduqca təəsüfləndiricidir. (5-s-36-37) Zaqafqaziyada yaşayan 1 milyon 300 min erməninin 1milyonu yerli deyildir və onlar vilayətə bizim tətəfimizdən köçürülüblər. (6- 4-ci cild) A.S.Puşkin sən kölgəsən, sən qorxaqsan çünki sən ermənisən. Jemçuynikov yazıçı: Qışqıra-qışqıra danışmaq bu xalqın xəstəliyidir. Özgə millətləti də özlərinin xeyrinə qışqırmağa ,yalan informasiya yaymağa cəlb edə bilirlər. Sədi Şirazi - məhşur fars şairi: Erməni yer üzünün ilanı, insanlığın düşmənidir. (7-45504). A.S.Qriboyedov- Əlahəzrət ,ermənilərin mərkəzi rus torpaqlarında yerləşməsinə icazə verməyin. Onlar elə tayfadandıdılarki, bir neçə il yaşayandan sonra bütün dünyaya bu torpaqların ata və babalarına aid olduğunu qışqıracaqlar. Hal-hazırda dünya miqyasında böyük miqdarda qaçqın dünya içtimaiyyəti, mütəxəssislər, hökümətlər və könüllü qurumlar üçün problem yaradır. 2010-cu ilin dekabrından Ərəb ölkələrində ərzaq qiymətlərinin yüksəlməsi, söz azadlığı, bürokratik-əngələr və aşağı həyat səviyyəsi ilə əlaqədar başlayan etiraz nümaişləri başlandı. Ərəb Baharı adı ilə bir çox ölkələrdə vətəndaş müharibələri Misir, Liviyada, Tunisdə, Yəmən, Oman, Suriya, Əlcəzair, İraq və digər ölkələri bürüdü. Vətəndaş müharibələri yeni dövürdə beynəlxalq münasibətlər sahəsinin ən aktual problemidir. 20 iyun tarixixi BMT-nin Baş Məclisi tərəfindən təsdiq olunmuş Dünya Qaçqınlar günüdür. Hər bir ölkədə bu tarix özünə məxsus şəkildə qeyd edilir. 2000-ci ildə BMT BAŞ Məclisi Afrika qaçqınları ilə həmrəy olduqlarını ifadə edən xüsusi qətnamə qəbul edib. Həmin qəbul olunmuş qətnaməyə əsasən 1951-ci il konvensiyasının 50-ci ilini qeyd etdilər. Qətnamədə qeyd olundu ki, Afrika Birliyi Təşkilatı Dünya Qaçqınlar Gününün Afrika qaçqınlar günü ilə eyni tarixdə qeyd edilməsinə razılıqlarını bildirdilər. Müasir dövürdə dünyada qaçqın və məcburi köçkünlərin əsas hissəsi Afrika, Balkanlarda, Əfqanıstan, Azərbaycan, Ukraynanın, şərqində baş verən silahlı münaqişələr nəticəsində Rusiya qaçqın axını başlamışdır. 2011-ci ilin mart ayında Suriyanın cənubunda Dereov şəhərində hökümət əleyhinə etiraz aksiaları sonradan vətəndaş müharibəsinə çevrildi. Və nəticə etibarı ilə Suriya vətəndaşları Türkiyyəyə, Avropa, ABŞ, Kanadaya kütləvi şəkildə axın etməyə başladılar. Suriyadan olan qaçqınların sayı BMT- Qaçqınlar üzrə Ali Komissarlığı 4.863.684 qeydiyata aldığı Suriyalı qaçqının olduğunu müəyyən etdi.(8-Əbu-Dabi)Suriya qaçqınlarınnın 2.7 milyonu Türkiyədə məskunlaşıb. Türkiyə dövləti Suriyadan olan qaçqınlara isti münasibət bəsləyir və onlara qapılarını ilk açan dövlətdir. BMT-nin Qərbi Asiya üçün İqtisadi və Sosial Komissiyasının apardığı araşdırmalar nəticəsində məlum olub ki, 2011-2015- ci illərdə Ərəb baharı ucbatından Yaxın Şərqdə iqtisadi artıma 614 milyar dollar və ya region üzrə ÜDM-in 6 % həcmində ziyan dəyib. Qlobalaşan dünyanın problemlərin araşdırarkən dinlər arasında dini nifrətin artması, islamafobiyanın, iri dövlətlərin digər dövlətlərdə demokratiyanı, insan hüquqlarını güya bərqərar etmək adı ilə dünyanı yenidən bölmək istəkləri və israrla buna cəhdləri XX əsrin sonralarından daha çox vüsat almağa başladı. Təkcə son 15 il ərzində 45 ölkənin daxili işlərinə qarışmaqla, əksər müsəlman ölkələrində qaçqın və məcburi köçkünlərin sayının surətlə artması ilə nəticələndi. 10 milyondan artıq qaçqın öz yurd –yuvalarını tərk etdi .2001-ci ildə yer kürəsində qaçqınların sayı 171 milyon idisə, bu gün onların sayı 244 milyona çatıb. Statistikaya əsasən yalnız Suriyada geden müharibə nəticəsində 4.5 milyon insan qaçqın düşüb. Qaçqınların min nəfəri dəniz sularına düşüb boğularaq həlak olublar. Dini ayrı-seçkilk, islamafobiya təkə Avropada deyil, bütün xristiya ölkələrində yayılmışdır. Bu səbəblər dövlətlər arasında ikili standartların yayılmasına gətirib çıxarır.

**Ədəbiyyat:**

1. www.qmkdk.gov.az./az/pages/5htm/
2. Əmir Əliyev:Azərbaycan Beynəlxalq Cinayətlər hədəfində: hüquqi təhlil.Bakı, s 176

3. Lətif Hüseynov:Beynəlxalq hquq. Dərslik. Bakı.2014, s367
4. Azərbaycan Resbublikasının Prezidentinin İşlər İdarəsinin Prezident Kitabxanası
5. P.Keprop Patkanov yazıları ön Asiyanın tarixi üçün əhəmiyyəti SPB.1981
6. Rus tətqiqatçısı V.L.Veliçko 4- ci cild. SPB-1904.
7. Azərtac-xüsusi müxbiri-Əbu- Dabi.11 noyabr 2016.
8. legend.az/45504/

**The problem of refugees and IDPs in the globalizing world.**

**Summary**

The world community faced the problem of refugees since the early part of the twentieth century undertook the task of protecting and assisting refugees. In our modern world, people must live in a more secure environment. Yes, they should live. It is very unfortunate that the emergence of wars is the formation of a refugee and internally displaced army, which is one of the global problems of the world. I'm not sure if the problem of refugee and IDPs is the world's worst case. The problem of refugees and internally displaced persons has not been overcome by the Republic of Azerbaijan. Looking back to history, we see that 1905-1918-1920, 1948 and subsequent ethnic cleansing occurred during 1988-1993. As a result of the policy of ethnic cleansing of the Republic of Armenia, hundreds of thousands of Azerbaijanis were expelled from their native lands. More precisely, they are exposed to deportation. The number of refugees and internally displaced persons has increased by 10 per cent over the same period of the last year, with a population increase of 100: 1, reaching a million 200,000

**Проблема беженцев и вынужденных переселенцев в глобализирующемся мире**

**Резюме**

Мировое сообщество столкнулось с проблемой беженцев, так как в начале двадцатого века была предпринята задача защиты беженцев и оказания им помощи. В нашем современном мире люди должны жить в более безопасной среде. Да, они должны жить. Очень жаль, что возникновение войн является формированием армии беженцев и вынужденных переселенцев, что является одной из глобальных проблем мира. Я не уверен, является ли проблема беженцев и вынужденных переселенцев худшей в мире.

Современный мир должен признать армянское государство страной-агрессором. Глобализационные процессы в мире, тесное сотрудничество Азербайджана с Европейским Союзом, принципы международного права и процессы демократизации больше не принимают агрессивной политики. Политика и позиция азербайджанского государства основана исключительно на международных нормах и принципах. Принципы международного права являются частью обычного права.

**Rəyçi: prof. H.Əliyev**

**Xəlilova Şəlalə Elman qızı**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
halilova96sh@mail.ru

# QLOBALLAŞAN DÜNYANIN ENERJİ TƏLƏBATI

***Açar sözlər:*** *Qlobal dünya, Əsrin müqaviləsi, Azərbaycan, kontrakt*
***Key words:*** *The Global world, The contract of the century, Azerbaijan, the contract*
***Ключевые слова:*** *Глобальный мир, Контракт Века, Азербайджан, контракт*

Yanacaq-enerji sərvətlərindən səmərəli istifadə və qlobal yanacaq-enerji kompleksinin inkişafı müasir dünya iqtisadiyyatında mühüm starateji əhəmiyyət daşıyır. Bu sektorda baş verən kataklizmlər, inkişaf meylləri yalnız ayrı-ayrı ölkələrin deyil, bütövlükdə planetin enerji təhlükəsizliyinin təminatına təsir göstərir. Müasir zamanda sivilizasiyanın dayanaqlığını, sosial-iqtisadi dirçəlişi yanacaq-enerji sərvətləri olmadan təsəvvür etmək çətindir. Lakin artan inteqrasiya prosesləri, nəqliyyatın, məhsuldar qüvvələrin inkişafı beynəlxalq əmək bölgüsünü dərinləşməsi ilə müşayiət olunaraq yanacaq-enerji sərvətlərindən də biçimli istifadənin imkanlarını genişləndirir. Bütün bunlara baxmayaraq, yanacaq-enerji sərvətlərinin coğrafi yerləşməsi amili, dünya yanacaq-enerji kompleksinin inkişaf meyilləri geoiqtisadi müstəvidə mühüm prioritet olaraq, həm ölkə, həm də qlobal və regional aspektdə strateji təhlil obyektinə çevrilir. Dünya yanacaq-enerji kompleksinin inkişafının dünya iqtisadiyyatındakı rolunun tədqiqi də aktual məsələ kimi mühüm elmi əhəmiyyət kəsb edir.

İqtisadi ədəbiyyatlarda resursların, istehsal güclərinin yerləşməsi ilə bağlı bütöv bir nəzəriyyənin formalaşdığını görmüş olarıq. "Yerləşmə amilləri" anlayışını elmi tədavülə alman iqtisadçısı Alfred Veber (1868-1958) özünün 1909-cu ildə yazdığı "Sənayenin yerləşməsi nəzəriyyəsi" adlı klassik tədqiqat işi ilə buraxmışdır. Nəzəriyyə görə sənayenin yerləşməsinin başlıca şərtlərindən əsası kimi də təbii sərvətlərin coğrafiyası amili dominatlıq təşkil edir. Tədqiqatçının baxımdan dəyərləndirmələr göstərir ki yanacaq-enerji sərvətlərinin planetimizdə bölgüsü və yerləşməsi son dərəcə qeyri-bərabərliyi ilə səciyyəvidir. Belə vəziyyət yer kürəsində müxtəlif iqlim, textonik proseslərlə, geoloji dövrlərdə faydalı qazıntıların yaranma şərtləri və digər amillərlə bağlıdır. Yanacaq-enerji sərvətləri faktiki olaraq əsas təməl kimi inkişafa təsir edir. Bununla yanaşı, yanacaq-enerji sərvətləri bol olduğu ölkələrdə çox hallarda onlardan israfçılıqla istifadə olunur. Əks qütbdə isə ETT-nin geniş inkişafı nəticəsində resurslardan səmərəli istifadə yeni imkanları yaranmışdır. Yaponiyada, Cənubi Koreya, İtaliya və digər bu kimi ölkələrdə əldə edilmiş iqtisadi tərəqqi buna parlaq misaldır. Elmin nəaliyyətlərinin tətbiqinin, innovasiya fəaliyyətinin genişlənməsinin sürətli inkişafı, xüsusəndə az enerji tutumlu texnologiyaların yaranması, yeni enerji, xammal növlərinin mənimsənilməsi ənənvi təbii ehtiyatlardan istifadənin xüsusi çəkisini aşağı salır. Belə xüsusiyyət isə yalnız azsaylı ölkələrdə xasdır.

Beynəlxalq əmək bölgüsu sistemində bir qayda olaraq inkişaf etmiş ölkələr xammal resurslarının istehlakçısı, inkişaf etməkdə olan ölkələr isə onların istehsalçısı və ixracatçısı kimi çıxış edirlər. Bu da həmin ölkələrdə iqtisadi inkişafın səviyyəsi ilə yetərli şərtliliklə bağlılığı vardır. Misal olaraq qeyd etmək lazımdır ki, ABŞ özünə lazım olan mineral xammalın 15-20 faiz, Qərbi Avropa ölkələri 70 faizə qədərini, Yaponiya 90 faizdən çoxunu idxal edir.

Dünyada təbii ehtiyatlar balansı, onların müasir vəziyyəti və istifadə perspektivləri ayrı-ayrı mənbələrdə qismən müxtəlif verilir. Bir çox yüksək reytinqli beynəlxalq təşkilatlar, elmi idarələrin, analoji mətbuat orqanların və hətta internet şəbəkəsinin məlumatlarında bu balansın ayrı-ayrı elementlərində muəyyən fərqlər müşahidə olunur. BMT-nin Dünya və Avropa bankının, iri maliyyə qruplarının və digər mötəbər təşkilatların hər il nəşr etdikləri hesabatlarda da bu fərq sezilməkdədi. Bununla belə, qeyd etmək lazımdır kı, neft iqtisadiyyatının statistikasına konfedisialıq xasdır. Bəzi göstəricilərin müasir, obyektiv mənzərisini müşahidə etmək çətinliklərlə müşayiət olunur. Belə ki, ayrı-ayrı iri neft inhisarları, neft hasil edən ölkələr müvafiq göstəriciləri nümayiş etdirməkdə o qədər də həvəsli deyirlər. Bir cəhəti də qeyd etmək zəruridir ki, təbii sərvətlər miqyaslı olmasına baxmayaraq əksərən tükənən xassələridirlər. Buna görə də bəşəriyyət bu sərvətlərdən daha ekosivil və biçimli istifadəni əvəz etməlidir.

Beynəlxalq təşkilatların proqnozlarına görə yaxın on ildə ETT-nin inkişafı, əhalinin artımı, istehsalın yüksəlişi, ayrı-ayrı sahələrində texnoloji irəliləyiş, innovasiya və s. ilə bağlı enerjiyə olan tələbat ən azı iki dəfə artacaqdır. Belə inkişaf isə təbii sərvətlərdən optimal istifadəni daha stimullaşdıracaqdır. Ötən müddət ərzində enerji istehsal və istehlak edən regionlar arasında diferensiallaşma və buna uyğun olaraq enerjinin

bütün aspektlərində, xüsusi ilə neft-qaz sənayesində xarici ticarətin əhəmiyyəti də artmışdır. Enerji istehsal və istehlakında ən böyük pay sahibi isə inkişaf etmiş ölkələrdir. Xüsusilə hazırda dünyada elektrik və istilik enerjisi istehsalı və istehlakında ABŞ və Çin liderdir.

Ənənəvi yanacaq növləri - kömür, neft, qaz, torf, yanan bərk suxurların ehtiyatlarının əhəmiyyətli hissəsi - neft və təbii qaza malik olan ərazilərin 30 faizi, kömürün 50 faizdən çoxu, dünya hidroresursların 12 faizi MDB ölkələrinin ərazisində yerləşir. Bununla yanaşı, göstərilən resursların ümumi ehtiyatının 80 faizi Rusiyanın Şərq rayonlarının payına düşür ki, burada əhalinin 20 faizi yerləşmişdir, 30 faiz isə, Avropa hissəsinin payına düşür ki, burada, əhalinin 80 faizi yerləşmişdir.

Son 30 ildə dünyada təxminən 135 mlrd. ton neft, 145-155 mlrd. ton daş kömür və 1600 trln. m3 təbii qaz yandırılmışdır. Digər tərəfdən dünyada kəşf edilmiş yanacaq-enerji yataqları və istifadəyə verilmiş mədənlər hesabına onların ehtiyatı xeyli artmışdır. Bütün bunlar isə müvafiq dövr ərzində enerji istehlakının 38-40 faiz artımına gətirmişdir. Bu artımda təbii qaz 65 faiz, neft 12 faiz, daş kömür 28 faizlik çəkiyə malikdirlər. Ötən vaxt ərzində ilkin enerji resursları balansında təbii qazın xüsusi çəkisi 19 faizdən 27 faizə yüksəlmiş, neft 49 faizdən 40 faizə, daş kömür 30 faizdən 26 faizə enmişdir. Son dövrlərdə enerji daşıyıcılarının xüsusilə neftin qiymətinin yüksəlməsi də ilkin enerji resurslarından istifadənin artmasının qarşısını ala bilməmiş və elektrik enerjisinə olan tələbat da bu müddət ərzində sürətlə artmışdır. Belə ki, əgər 2000-ci ildə enerji daşıyıcılardan istifadə 9,3 mlrd. ton n.e. təşkil edirdisə bu göstərici 2005-ci ildə 10,5 mlrd. ton n.e., 2009-cu ilə 11,2 mlrd. ton n.e., 2010-cu ildə təxminən 12,1 mlrd. ton n.e. bərabər olmuşdur. Məlum olduğu kimi, milyon illər ərzində yerin təkində əmələ gəlmiş bu sərvətlərin son əsrdə sürətlə tükənməsi yüzlərlə faydalı qazıntının ehtiyatlarının da tükənməsi ilə nəticələnir ki, bunlar da iqtisadi inkişafa, insanların maddi vəziyyətinə, iqtisadi munasibətlərin inkişafına təsir göstərən əsas amillərdir. Bu resurslardan səmərəsiz və kor təbii istifadə həm ekoloji mühitə, həm də yuxarıda sadaladığımız amillərə mənfi təsir edir. Bu resursların işlənməsi və geoloji kəşfiyyat işləri, tullantıların zərərsizləşdirilməsi əlavə xərclər və böyük miqdarda vəsait tələb edir. Yeni yataqların kəşf edilməsinin sürəti mövcüd yataqların istifadə sürətini qabaqlamaqla ehtiyatların artımını təmin edir, istismar edilən resursların azalması meylinin sürətlənməsi, onların tükənməsi, müvafiq sərmayə qoyuluşu vasitəsilə yeni enerji resurslarının kəşfini tələb edir və bu da dünyada müvafiq xammal ehtiyatının azalması ilə nəticələnir.

Əslində, ən azı son beş nəsillər üçün geosiyasət neft siyasəti ilə əsasən sinonimik olmuşdur. Neft ehtiyatlarının nəzarəti böyük şirkətlər və onları himayədarlıq edən dövlətlərə görünməmiş sərvət gətirib. Enerji resurslarından istifadəni nəzərə məhrum ölkələr daha da yoxsul olmuşlar.

Bu vəziyyətdə problemin həlli alternativ enerji qaynaqlarının axtarışı və ya enerji istehlakının səmərəliliyinin artırılması ola bilər. Alternativ enerji mənbələrinin təsnifatı üçün əsasən aşağıdakı meyarlardan fərqlənir: 1) bərpa olunan 2) coğrafi.

Alternativ bərpa olunun mənbələrin indiki texnoloji səviyyəsi heç də artan təlabatını ödəyə bilməz: indiyə qədər hətta ən qabaqcıl texnologiyalar Yaponiyaya kimi qabaqcıl ölkədə ümumi enerji istehlakının ümumi hissəsində 2% -dən çox alternativ enerji mənbələrinin istifadəsini təmin etməyə imkan vermir. Bu vəziyyətdə, ənənəvi enerji mənbələrinə alternativ olan yeni enerji mənbələrinin axtarışı və inkişafı ən effektivdir. Yuxarıda göstərildiyi kimi, bir çox hesablamalarına görə Xəzər regionu bu baxımdan ən perspektivlidir.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasının diplomatiya tarixi / M.C.Qasımlı. Azərbaycan Respublikasının xarici siyasəti (1991-2003): 2 hissədə. 11 hissə. - Bakı: Mütər- cim, 2015.
2. Azərbaycan Respublikasının Konstitusiyası. "Qanun". Bakı, 2009.
3. Azərbaycan və Latviya prezidentlərinin mətbuat konfransı. //"Azərbaycan" qəzeti 25 aprel 2013-cü il. URL:
4. "BP-Azərbaycan" Davamlı İnkişaf haqqında Hesabat, arx. 2004, v. 8

**Energy demand of the Global world**

**Summary**

Growing global demand for energy resources and supplies of fuels has played a crucial role in achieving national independence in the history of Azerbaijan. This is confirmed by the signing of "The Contract of The Century" in 1994 and subsequent recognition of the statehood of the Republic of Azerbaijan and strengthening by the world.

**Энергопотребление глобализованный мира**

**Резюме**

Рост глобального спроса на энергоресурсы и поставки топлива сыграл важную роль в истории Азербайджана для достижения национальной независимости. Подписание "Контракта века", подписанного в 1994 году, с последующим признанием и мировым укреплением государственности Азербайджанской Республики

**Rəyçi: s.f.d. E.Mehdi**

**Kərimova Vəfa Şahin qızı**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
vafa_axundova@yahoo.com

## AZƏRBAYCAN-YAPONİYA MÜNASİBƏTLƏRİNİN PERSPEKTİVLƏRİ

***Açar sözlər:*** *Yaponiya, Azərbaycan, İpək yolu, H.Əliyev, Avropa,Asiya*
***Key words:*** *Japan, Azerbaijan, Silk Road, H.Aliyev, Europe, Asia*
***Ключевые слова:*** *Япония, Азербайджан, Шелковый путь, Х.Алиев, Европа, Азия*

Əvvəlcə də qeyd etdiyimiz kimi. Yaponiyanın Xəzər regionda olan maraqları bu ölkənin Baş Naziri R.Xasimotonun 1997-ci ildə elan etdiyi "Avrasiya diplomatiyası" konsepsiyası əks etdirir. Azərbaycan Respublikasının xarici siyasətin qərb vektoru sayəsində və ABŞ-ın dəstəyinilə regionda geosiyasi əhəmiyyətli layihələr həyata keçirmək və regionda öz müstəqil statusunu qura bilməsi faktını nəzərə alaraq, bu regionunda qlobal enerjı təhlükəsizliyin maraqlarını təmin edən yeganə respublika olub. Bunu nəzərə alaraq, rəsmi Tokio "Avrasiya diplomatiyası" konsepsiyasını təşviq etmək üçün əvvəlcədən Azərbaycana güvənir.

Bu konsepsiyaya görə, «soyuq müharibə»nin başa çatması ilə beynəlxalq münasibətlərdə köklü dəyişikliklər baş verib və belə bir məqamda Yaponiya Sakit Okean Asiyaya və Sakit Okean bölgəyə istiqamətlənmiş diplomatiyasını fəallaşdırmalıdır. Söhbət tarixi «ipək yolu»nun keçdiyi bütün ərazilər (Çin, Rusiya, Orta Asiya və Qafqaz) istiqamətində «Avrasiya siyasəti»nin yeridilməsindən gedir. Bu sənəddə Azərbaycana xüsusi yer ayrılmışdır. "Yaponiyanın yeni xarici siyasət doktrinasında bu əlaqələrin inkişafının üç əsas istiqaməti müəyyən olunmuşdur:

- gələcək etibarlı və qarşılıqlı anlaşmanın əsası üçün siyasi dialoq;
- təbii ehtiyatların öyrənilməsi sahəsində iqtisadi əməkdaşlıq;
- nüvə silahının yayılmaması, demokratikləşmə və sabitləşmə vasitəsilə regionda sülhə nail olmaq.

Bu strategiyanı işləyib hazırlayarkən Yaponiya mütəxəssisləri, əsasən, aşağıdakıları nəzərə alırdılar:

- Xəzərin Azərbaycan sektorundakı zəngin neft və qaz resursları Yaponiyanın marağında olan dünya enerji resursları bazarında mühüm amildir;
- Azərbaycan öz kommunikasiyaları ilə Avrasiya regionu, Şimal-Cənub, Qərb-Şərq ölkələri ilə əlaqələrdə körpü rolunu oynaya bilər;
- Mərkəzi Asiyanın suveren ölkələri və Cənubi Qafqaz ölkələrinin dövlət quruculuğu prosesində Yaponiyanın fəal yardımının böyük əhəmiyyəti olacaq, nəticədə Yaponiya nəinki ən yeni müstəqil ölkələr, habelə onların qonşuları – Rusiya Federasiyası, ÇXR, həmçinin Türkiyə və İran ilə XXI əsrdə Avrasiya regionunda özünün siyasi və iqtisadi təsirini əhəmiyyətli dərəcədə genişləndirəcəkdir."

Məhz ona görə də Yaponiya Heydər Əliyevin irəli sürdüyü Böyük İpək Yolunun bərpası təşəbbüsünə fəal dəstək vermiş, bu məsələdə Azərbaycanla Tokionun maraqları tamamilə üst-üstə düşmüşdür. Yaponiya Nazirlər Kabinetinin 1998-ci ilin yanvar ayında qəbul etdiyi Böyük İpək Yolunun Diplomatiyası fəaliyyət Proqramı da "Avrasiya diplomatiyası" strategiyasını ifadə edir. Yaponiya Azərbaycan Respublikasına İpək Yolunun üstündə yerləşən əsas ölkə kimi baxır, Azərbaycanın güclənməsi Avropa və Asiyanın bir çox ölkələrinin ümumi maraq dairəsindədir. Bununla əlaqədar Azərbaycanla iqtisadi və siyasi əlaqələrin inkişafı Yaponiyanın "Avrasiya diplomatiyasında" xüsusi yer tutur.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin ölkəmizə rəhbərliyi dövründə bu xətt daha da inkişaf etdirilmiş, Yaponiya-Azərbaycan münasibətlərində yeni bir dönəm başlanmışdır. 2003-cü il noyabrın 24-də Prezident İlham Əliyev Yaponiyanın xarici işlər nazirinin müavini İçiro Fuçisakeni qəbul edərək Yaponiya-Azərbaycan münasibətlərinin sarsılmaz olduğunu bir daha bəyan etmişdir. Bundan az sonra, 12 oktyabr 2005-ci il tarixində Azərbaycan Respublikasının Yaponiyada səfirliyi açılmışdır. Sonrakı mərhələdə Azərbaycan Respublikasının Prezidentinin 7-10 mart 2006-cı il tarixində Yaponiyaya rəsmi səfəri ölkələrarası münasibətləri yeni səviyyəyə yüksəltmişdir.

Yaponiya dövlətinin regionda əsas strateji tərəfdaşı kimi məhz Azərbaycanı görməsi inkaredilməz reallıqdır. Təsadüfi deyildir ki, 2000-ci ildə Yaponiya höküməti tərəfindən regionda ilk dəfə məhz Azərbaycanda səfirlik öz fəaliyyətinə başlamışdır. Gürcüstanda 9 il sonra 2009, Ermənistanda isə 15 il sonra 2015-ci ildə Yaponiya səfirliyi açılmışdır. Bu birincilik Yaponiyanın Azərbaycana verdiyi önəmin bariz nümunəsidir.

Yaponiya-Azərbaycan münasibətlərində yeni mərhələ İlham Əliyevin Azərbaycan Respublikası Prezidenti seçilməsi ilə başlanmışdır. Yenə da, Yaponiya bu vəzifəsinə seçilməsi münasibətilə gənc Azərbaycan Respublikasının prezidentini ilk təbrik edənlərin arasında idi. Yenə da, Yaponiya bu vəzifəsinə seçilməsi münasibətilə gənc Azərbaycan Respublikasının prezidentini ilk təbrik edənlərin arasında idi. Yaponiyanın hökumətindən təbrik və ən xoş arzularını Yaponiyanın Xarici İşlər Nazirinin müavini İçiro Fuçisaki çatdırdı: "2003-cü il noyabrın 24-də Azərbaycan Respublikasının Prezidenti cənab İ.Əliyev Yaponiyanın xarici işlər nazirinin müavini İçiro Fuçisakeni qəbul edərək Yaponiya-Azərbaycan münasibətlərinin sarsılmaz olduğunu bir daha bəyan etmişdir. Görüş zamanı İ.Fuçisaki Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevə Yaponiyanın baş naziri Y.Koizüminin şəxsi müraciətini çatdırmışdır. Müraciətdə Yaponiyanın gələcəkdə də ikitərəfli münasibətlərin möhkəmlənməsinə çalışacağı və bu münasibətlərin yeni mərhələyə çatdırılacağına səy göstəriləcəyi qeyd olunmuşdur."

Ümummili lider Heydər Əliyevin tərəfindən başlamış siyasətinin davam etdirilməsinə dair qarşılıqlı öhdəliklərə sadiqlik və onun əsasında ölkələr arası münasibətləri yeni səviyyəyə qaldırması 7-10 mart 2006-cı ildə İlham Əliyevin Yaponiyaya səfəri zamanı ifadə edilmişdir. Beləki, Yaponiya Azərbaycanda neft sektorunun inkişaf etdirilməsində, "İpək yolu" layihəsinin həyata keçirilməsində, sosial-mədəni sahələrdə yeni texnologiyaya əsaslanan müasir inkişafın təmin olunmasında yaxından iştirakını təsdiqlədi. Həmin səfər zaman martın 8-də Tokionun "İmperial" mehmanxanasında Azərbaycan-Yaponiya iqtisadi forumu keçirilmişdir. Bu forumda, Yaponiyanın Azərbaycandakı maraqları qeyri-neft sahəsinə genişlənməsi aydın oldu. Forumda iştrak edən cənab Prezident İ.Əliyev bunu da xüsusi qeyd etdi: "Hazırda biz diqqətimizi əsasən infrastruktur sahəsinə, regional inkişaf proqramlarına və yeni iş yerlərinin açılmasına yönəldirik. Bütün bunlar Yaponiya şirkətləri üçün yeni imkanlar açır və onlar iqtisadiyyatın qeyri-neft sektorunda iştirak edə bilərlər. Hazırda bu, bizim üçün prioritet xarakter daşıyır..." .

Xəzər regionunun böyük karbohidrogen potensialı, neft və qaz hasilatın və ixracı həcminin ilbə il artması, Şərq-Qərb və Şimal-Cənub enerji və nəqliyyat dəhlizlərinin gücləndirilməsi və inkişafı bütün Xəzər-Qara dəniz və Aralıq dəniz hövzəkər üçün çox böyük əhəmiyyət kəsb edən geniş miqyaslı regional layihələrin həyata keçirilməsinə böyük töhfə vermişdir. Bu baxımdan, qonşu Xəzəryanı dövlətlər üçün tranzit ölkənin rolu oynayan Azərbaycan üçün Transxəzər neft və qaz boru kəmərlərinin tətbiqi yalnız qarşılıqlı faydalı deyil, milli iqtisadiyyatın inteqrasiyası, ticarət və nəqliyyat kommunikasiyalarının inkişafı və ən əsası, dünya bazarlarına enerji təchizatının diversifikasiyası üçün əsas amillərdən biridir.

Mərkəzi Asiyada artan qeyri-müəyyənliyə baxmayaraq, Azərbaycanın maraqları region ölkələrinin suverenliyini gücləndirmək siyasətini təmin etmək üçün siyasi və iqtisadi infrastruktur yaratmaqdır. Qafqazda, Mərkəzi Asiyada və bütün dünyada əlaqələrin diversifikasiyasının qurulması və strateji perspektivli əlaqələrin qurulması ilə əlaqədar olaraq, Azərbaycan dünyanın əhəmiyyətli demokratik qüvvələri ilə geniş əməkdaşlığın qurulmasında maraqlıdır və Yaponiya bunların arasında mühüm yer tutur. Yapon-Azərbaycan əlaqələrinin xüsusiyyətlərinin nəzərə alınması və təhlili ikitərəfli əməkdaşlıq üçün balanslaşdırılmış bir gündəm yaratmaq üçün lazımdır.

Bu baxımdan, Avropa və Asiyanın qovşağında Azərbaycanın coğrafi mövqeyinin, Xəzər regionundan, ilk növbədə Qazaxıstan və Türkmənistandan Qərb bazarlarına, enerji resurslarının nəqli üçün tranzit imkanlarının istifadəsinin, müstəsna əhəmiyyəti var. Yaradılmış infrastruktur birmənalı olaraq neft və neft məhsullarının daşınmasının iqtisadi səmərəliliyini göstərir,

## Ədəbiyyat:

1. Azərbaycan Prezidenti Heydər Əliyev Yaponiyanın "İtoçu" korporasiyasının nümayəndə heyətini qəbul etmişdir //Azərbaycan.-1996.-12 mart.
2. Azərbaycan Prezidenti İlham Əliyevin Yaponiyaya rəsmi səfəri Tokioda Azərbaycan-Yaponiya iqtisadi forumu. Azərbaycan Prezidenti İlham Əliyevin nitqi /Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin nitqləri, çıxışları, müsahibələri və bəyanatları 2006-cı il. Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsinin Prezident Kitabxanası. S. 67. Elektron resurs URL: http://files.preslib.az/site/ialiyev/2006.pdf
3. Kərimov R. "Azərbaycan - Yaponiya münasibətləri. Tarixi imkanlar və perspektivlər"// Strateji təhlil. 2017-06-21.
4. Talıbov Rza. Asiya ölkələri beynəlxalq münasibətlər sistemində Bakı, «Elm və təhsil», 2015.

**Prospects of Azerbaijani-Japanese relations**
**Summary**

Taking this into consideration, the researchers consider Azerbaijan as a country in the South Caucasus and Central Asia regions, in which Japan is highly interested. This interest is not one-sided, but bilateral. These relations establish great prospects for both countries.

**Перспективы Азербайджано-японских отношений**
**Резюме**

Исследователи называют именно Азербайджан как государство в самом большом интересном регионе Японии и на Южном Кавказе и в регионе Центральной Азии. Этот интерес не односторонний-взаимный. Отношения вызывают большие перспективы для обеих стран.

**Rəyçi: s.f.d. E.Mehdi**

**Səmədov Səbuhi Mətləb oğlu**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
sebuhi_bsu@mail.ru

# SSRİ PARÇALANANA QƏDƏRKİ DÖVÜRDƏ XƏZƏR GEOSİYASİ REGİONUNDA MÜNASİBƏTLƏR

***Açar sözlər:*** *Xəzər dənizi, status, kondominimum, SSRİ, İran, tarix*
***Key words:*** *Caspian Sea, status, condominium, USSR, Iran, history*
***Ключевые слова:*** *Каспийское море, статус, кондоминиум, СССР, Иран, история*

Tarixi sənədlər göstərir ki, XVIII əsrin əvvəllərində Rusiya İranı və Xəzər dənizinin İran hissəsini xarici ərazi kimi qəbul edirdi, Təxminən 1701-ci ildə Böyük Pyotr Artyom Volınski adlı şəxsi İrana səfərə göndərir və ona Xəzər ətrafınan məlumat toplamağı göstəriş verir. Eyni zamanda, Xəzərin şərq sahilinə knyaz Berkoviç-Çerkasskinin başçılığı altında rus ekspedisiyası gəlir. Səfərlərin nəticəsi olaraq, ticarət haqqında saziş imzalanmışdır ki, bu da rus tacirlərinə İranda ticarət etmək hüququ verirdi. O zaman, Rusiya İranın Xəzər sahilinə olan hüququnu tam tanıyırdı və bu ərazilərdə hansısa bir hüquq almaq üçün İranla saziş bağlamağın vacibliyini anlayirdı. 1721-1722-ci illərdə rus qoşunları, əfqan üsyanlarının yatırılması bəhanəsi ilə İranın Xəzərətrafı rayonlarına doğru irəliləməyə başladılar. Rusiyanin İrandakı konsulu Semyon Avraamov göstəriş aldı ki, İrana göstərilən hərbi yardımın əvəzində şərt olaraq Xəzər sahilindəki bəzi ərazilər Rusiyaya verilsin. Aydındır ki, o zaman, Rusiya Xəzərin İran ərazisi olduğuna şübhə etmirdi.

XIX əsrdə Rusiya Xəzərin sahilində öz hakimiyyətini bərpa etmək üçün səylərini davam etdirməyə çalışırdı. Gülüstan müqaviləsinin 5-ci maddəsi (1827-ci ilin oktyabrı) Rusiyaya onun gəmilərinin Xəzər dənizində üzməsi üçün istisna hüquq verdi. 10 fevral 1828-ci ildə bağlanmış Türkmənçay müqaviləsi isə Rusiyaya onun gəmilərinin Xəzər dənizində yerləşdirilməsi hüququnu təsdiq etdi. Gələcək hadisələrin təhlili onu göstərdi ki, Gülüstan və Türkmənçay müqavilələri Xəzərin o zamankı rejimi üçün çox kritik olmuşdur.

Əfqanıstan, İran və Tibet haqqında 18 avqust 1907-ci il tarixli ingilis-rus Konvensiyası İranın razılığı olmadan onu iki yerə - şimali və cənubi vilayətlərə bölmüşdür. Şimal vilayəti Rusiyanın, cənub vilayəti isə Britaniyanın himayəsinə verilmişdir. Bu Konvensiya, Gülüstan və Türkmənçay müqavilələri ilə bünövrəsi qoyulmuş Rusiyanin Xəzərdəki hegemonluğunu gücləndirmişdir.

XX əsrin əvvəllərində vəziyyət radikal olaraq dəyişməyə başladı. Yeni yaranmış sovet hökuməti 1921-ci ildə İranla müqavilə bağlayır. Müqavilədə əsas şərt kimi Xəzərdə gəmiçilik üzərindən İngiltərənin nəzarətini aradan qaldırılması göstərilmişdir. Bu müqaviləyə əsasən Sovet Rusiyası “koloniyalaşdırma siyasəti yeridən hökumət tərəfindən aparılan tiranik siyasətdən əl çəkir”. Çar Rusiyası tərəfindən İran xalqının hüquqlarını tapdalayan İranla bağlanmış bütün müqavilələri və konvensiyaları puç və hüquqi cəhətdən qüvvəsi olmayan sənədlər kimi elan edirdi. Bununla da, Türkmənçay müqaviləsi ləğv edilirdi, tərəflər razılığa gəlirdilər ki, gəmiçilik üzrə eyni hüquqlara malikdirlər və bütün gəmiləri öz bayraqları altında üzməlidir.

Digər dövlətlərə Xəzərdə gəmi saxlamaq qadağan edilirdi, burada ancaq İran və sovet bayraqlarını gəzdirən gəmilər üzə bilərdi. 1921-ci ildəki müqavilənin bu bəndinə əsasən tez-tez bu hal sitat gətirilir ki, Xəzər sovet və İran dənizidir. Lakin bu cümlə əsas müqavilədə deyil, yalnız 1931-ci ildə Təşkilat, Ticarət və Gəmiçilik haqqinda Konvensiyaya əlavə olaraq verilmiş 13 saylı notada özünü büruzə verir. Onun məqsədi ondan ibarət idi ki, Xəzər ümanlarında olduğu zaman xarici fəhlələrin təxribat xarakterli əməllərinin qarşısının alınması haqqinda tərəflərin götürdükləri öhdəliklər yerinə yetirilsin. Və yuxarıda adım çəkdiyimiz "Sovet-İran dənizi" cümləsi öz hüquqi yanaşma kontekstində bu münasibətlərin yenidən bərpasından başqa bir şey ifadə etmirdi.

Bu ifadənin Xəzərin hüquqi statusuna dair müddəa kimi qəbul olunması barədə əlimizdə heç bir sübut yoxdur. Şübhəsiz ki, 1921-ci il müqaviləsi İranın öz şimal qonşusu ilə sərhədlərarası münasibətlərinin stabilləşməsinə öz müsbət təsirini göstərdi. Müqaviləyə əsasən, Xəzər sahili dəniz dövləti kimi İranın statusuna edilmiş dəyişikliklər praktiki olaraq sıfıra bərabər idi. Bununla yanaşı, İran Rusiya ilə sərhəddin o tayında yaşayan xalqlarla dərin və çoxəsrlik etnik və mədəni əlaqələrini də itirdi və bu dezinteqrasiya prosesi İranın şimal qonşusunun getdikcə heç də dost sayıla bilməyəcək bir qüdrətli dövlətə çevrilməsi ilə bərabər surətdə artırdı .

Rusiya ilə bağlanan sonrakı dövlətlərarası müqavilələr İran üçün hüquqi cəhətdən daha məqbul idi. Misal olaraq, Rusiya ilə İran arasında 25 mart 1940-cı ildə Tehranda imzalanmış ticarət və gəmiçilik haqqinda müqaviləni göstərmək olar. Bu müqavilənin 12-ci maddəsinin 4-cü paraqrafında belə deyilirdi:

"Yuxarıda göstərilən məsəllələrə baxmayaraq, hər bir tərəf öz gəmiləri tərəfindən öz sahilyanı sularında sahil xəttinin 10 dəniz mili məsafəsinədək balıqçılıqla məşğul olmaq və öz bayrağı altında üzən gəminin heyəti tərəfindən ovlanmış balığın idxalı üçün təyin olunmuş müəyyən imtiyazlara öz hüququnu saxlayır" .

Öz-özlüyündə bu Əsasnamə müəyyən edir ki, 10 millik xətt istisna olunmaqla, Xəzər dənizinin akvatoriyası azad balıqçılıq üçün açıqdır.

Beləliklə, Xəzər üzrə əldə olunmuş müqavilə təcrübəsi Xəzərdə kondominiumun (beynəlxalq hüquqda ortaq suverenlik yeri, latın sözüdür) və ya hər hansı başqa ümumi sahiblik, yaxud da ümumi yurisdiksiya rejiminin mövcud olmasını fikirləşmək üçün heç bir əsas vermir. Xəzərin statusu beynəlxalq hüququn ümumi qaydalarına əsasən hüququn öhdəsinə düşür. Sərhədyanı rayonlarin quru ərazi sahələri və ya hər hansı məkanında iki və ya daha çox dövlət arasında kondominium təşkil etmək barədə beynəlxalq hüquqda heç bir prezumpsiya yoxdur. Beynəlxalq hüquqda elə bir qayda yoxdur ki, onlara əsasən belə bir status avtomatik olaraq yaransın. Kondominium və yaxud "Ümumi istifadə obyekti" ya müqavilə yolu ilə, ya da ki, iştirak edən dövlətlərin müəyyən təcrübəsinə əsaslanan adi beynəlxalq hüquq hadisəsi kimi təsis olunmalıdır.

Yuxarıda qeyd etdiyimiz kimi, müqavilə təcrübəsi Xəzərin sahilyanı dövlətlər tərəfindən nə vaxtsa kondominium kimi baxılması haqqında bəyanatlarını təsdiq etmir. Ayrı bir tərəfdən, müqavilə təcrübəsinin bəzi məqamları ona dəlalət edir ki, bu heç də belə deyil. İrana birtərəfli qaydada hüquqi sənədlərlə rəsmiləşdirilmiş balıqçılıq hüququnun verilməsində kondominiumun mövcudluğu şəraiti ilə uzlaşmayan bəzi faktlar yer almışdır. İran tərəfdən Xəzər ehtiyatlarına verilən hüquqların ilk izharı 1867-ci ildə Lianozov qardaşlarına Xəzərin cənub hissəsində nərə balığı vətəgələrinə konsessiyanın ayrılması idi. Bu konsessiya 1879, 1886, 1893, 1896, 1906-cı illərdə yenidən bərpa olunmuş və beləliklə də müddəti 1925-ci ilə kimi uzadılmışdir. Sonrakı dövrlərdə bu konsessiya hüquqları sovet hakimiyyətinə verildi, bütün bu müddəalar İran və Rusiya arasında 1927-ci ildə balıqçılıq vətəgələri haqqında bağlanmış 3 saylı Protokolda öz əksini tapmışdır .

1927-ci il konsessiyasının müddəti 1953-cü ildə bitmişdir və 2 fevral 1953-cü il tarixli notada SSRİ hökuməti qeyd etmişdir ki, İran "konsessiyanın müddətini bitirmək üçün öz qanuni hüququndan istifadə etmişdir və müvafiq olaraq, İran balıq vətəgələrini müstəqil istismar etmək hüququnu qazanmışdır". Bunun məntiqi davamı olaraq ortaya bir nəticə çıxır ki, İran bu məsələlərdə yalnız birtərəfli qaydada hərəkət etmişdir və hər zaman Xəzərə İranın şəxsi mülkiyyəti kimi baxmışdır.

İranın bu hüquqların verilməsində səlahiyyətləri həm çar Rusiyası, həm də sovet hökuməti tərəfindən tanımışdır. Bu faktlar həmin dövrdə araşdırdığımız su məkanlarında kondominiumun mövcud olması ilə bir araya gəlmir.

XX əsirdən etibarən Xəzər dənizində İran və Rusiyanın maraqları öz spesifikasını dəyişməyə , zamanla siyasi nifuz dairəsindən çıxaraq iqtisadi maraq dairəsinə keçmişdir.

İndi isə sahilyanı dövlətlərin Xəzərin mineral resurslarına olan münasibətini araşdıraq. Sovet İttifaqı tərəfindən Xəzərdə neft mədənlərinin işlənməsi 1949-cu ildə başlamışdır.

Bu təcrübə onu göstərir ki, nə Sovet İttifaqı, nə də ki İran, Xəzərin mineral ehtiyatlarını ümumi mülkiyyət kimi qiymətləndirmirdilər, bütün bunlara nəinki onları hərəkətləri, hətta hüquqi sənədlər də dəlalət edirdi. "Belə ki, 1966-ci il tarixli beynəlxalq Sovet hərbi-dənizçilik hüquq sorğu-məlumat kitabında Xəzər barədə bunlar yazilmışdır: "Kontinental şelfin dənizdəki resursları hər bir tərəfə (yəni SSRİ və İran) öz zonasının hüdudlari çərçivəsində uyğun olaraq aiddir. Heç bir şübhə yoxdur ki, bu fikir sovet hökumətinin rəsmi mövqeyini ifadə edirdi. Yeri gəlmişkən, sovet neft mədənlərinin fəaliyyətinin tənzimləmək və Xəzər dənizinin çirklənməsinin qarşısını almaq məqsədi ilə SSRİ Ali Sovetinin Rəyasət Heyəti tərəfindən verilmiş Qərar da bunu bir daha təsdiq edir. Düzdür, Qərarın hansı ərazilər çərçivəsində hərəkət etməsi göstərilməsə də, aydındır ki, bu ancaq sovet nazirlikləri, idarələri və gəmilərinə aid olmuşdur və heç bir yerdə göstərilmir ki, bu Qərar haqqında İranla hər hansı bir məsləhətləşmə olmuşdur.

İran təcrübəsinə gəldikdə isə, onu qeyd etmək lazımdır ki, 8 iyun 1955-ci ildə verilmiş kontinental şelfm mineral resurslarının istismari haqqında Aktın 2-ci maddəsinə edilmiş əlavənin Xəzərə aid olan hissəsində göstərilir ki, "İranin sahilyanı bölgəsinə bitişik kontinental şelfə aid olan sualtı ərazilər, dəniz dibindəki təbii ehtiyatlar və resurslar İrana aid olub, olacaq və onun suvereniteti altındadır".

Sahilyanı dövlətlərin son zamanlardakı təcrübəsi ona dəlalət edir ki, Xəzərin mineral ehtiyatlarının birgə istismarı heç zaman olmayıbdır. Azərbaycan və Rusiya hökumətləri arasında bağlanmış 20 noyabr 1993-cü il tarixli Sazişin 2-ci bəndində yazılıb ki, "Azəri" və "Çıraq" yataqları "dənizin Azərbaycan sektorunda" yerləşir. 1996-cı ilin yanvar ayında Prezident Heydər Əliyev və Baş nazir V.Çernomirdin arasında Azərbaycan neftinin Rusiya ərazisindən nəqli barədə imzalanmış dövlətlərarası sazişdə də söhbət "Xəzər dənizindən çıxarılan Azərbaycan nefti"ndən gedir. Bu sazişin 2-ci maddəsində Rusiya tərəfı boynuna alır ki, "o Azərbaycan neftinə sahiblik etmir", yəni ən yüksək dövlət səviyyəsində etiraf edir ki, Xəzər dənizinin Azərbaycan sektorunda çıxarılan neftin sahibi Azərbaycandır. Hər iki halda, danışıqlara heç bir ayrı Xəzəryanı dövlət dəvət olunmamışdır, sazişlər onların iştirakı olmadan imzalanırdı.

SSRİ isə öz daxili qanunları ilə, orta xətt prinsipinə əsasən dörd respublika arasında ; 19% - Rusiya, 29%- Qazaxıstan, 21% Azərbaycan, 16% Türkmənistan olmaqla milli sektorlar müəyyənləşdi və Xəzəryanı dövlətlərin su sərhədləri müəyyən edildi. Beynəlxalq müşahidəçilərin belə hesab edirlər ki, hal-hazirda heç bir zərurət və əsas yoxdur ki, mövcud bölgüyə yenidən baxılsın. Məsələyə yenidən baxılsa belə, köhnə prinsip qüvvədə saxlanılmalıdır ki, nə İran 20% pay istəyə bilsun, nə də Türkmənistan əlavə yataq iddiasında olmasın. Xəzəryanı ölkələrin, 1996-cı il noyabrın 12-də Aşqabadda anlaşmasına əsasən, mövcud hüquqi rejim və anlaşma Konvensiya qəbul edilənə qədər əsas sənəd hesab olunsun. 1991-ci il dekabrın 21-də Almatı Deklarasiyası qəbul edərək,varis-dövlətlər vərəsələrinin bütün mövcud beynəlxalq öhdəlikərini üzərilərinə götürərək Sovet-İran razılaşmasının hüquqi varisliyini də qəbul etmiş olublar

**Ədəbiyyat:**


1. Azərbaycan SSR Konstitutsiyası. Bakı. 1978.
2. Баскин Ю.Я., Фельдман Д.Н. История международного права. Москва. 1989.
3. Советско-иранские отношения в договорох, соглашениях и конвенчиях. Москва., 1967.
4. Hergiz F. İran and Soviet South. The Royal İnstitute of İnternational Affaires. London., 1995.


**Relations in the Caspian geopolitical region the during period before the disperse of the USSR**

**Summary**

XVIII-XIX prisoners of war fought for the interests in the Caspian region between Iran and Russia. At the beginning of the XVIII century, Russia recognized Iran and the Iranian part of the Caspian Sea as a foreign territory. In the XIX century, Russia tried to continue its efforts to restore its power on the coast of the Caspian Sea.

**Отношения в Каспийском геополитическом регионе до распада СССР**

**Резюме**

XVIII-XIX вв. борьба за круг интересов в Каспийском регионе шла между Ираном и Россией. В начале XVIII века Россия воспринимала Иран и иранскую часть Каспийского моря как внешнюю территорию. В XIX веке Россия прилагала все усилия для восстановления своей власти на берегу Каспия.

**Rəyçi: dos. İ.H.Hüseynov**

## SOSİOLOGİYA SOSİOLOGY СОЦИОЛОГИЯ

**Charkazzade Nofal**
İstanbul Aydın University
Nofal.Charkazzade@cpccom.az

# THE LEVEL OF OCCUPATİONAL HEALTH AND SAFETY AFFECTİNG THE MOTİVATİON OF MANAGERS

***Key words:*** *Occupational Health and Safety, Work accident, Motivation, Manager, Expectations of managers, Motivation of managers*
***Açar sözlər:*** *İş Sağlamlığı və Təhlükəsizliyi, İş qəzası, Motivasiya, İdarəçi, İdarəçilərin gözləntiləri, İdarəçilərin motivasiyası*
***Ключевые слова:*** *гигиена труда и техника безопасности, производственная травма, мотивация, менеджер, ожидания менеджеров, мотивация менеджеров*

## İNTRODUCTION

With its management performance, the manager is a visionary and strategic thinker who determines the direction that the business will go in. It is the key name for a company to survive, develop, grow and achieve sustainable success in the competitive environment. People in managerial positions have the opportunity to create an environment in which they will demonstrate their talents and skills and achieve success. Successful and stable organization is a great source of motivation for managers, but it is important to emphasize that they are the first to be held responsible for failure of the company. Managing the majority of the company's general operational lines is the job of the managers. In this context, the motivation of the manager affects the direct work and its decisions. With this study, the level of occupational health and safety of the neglected managers affected by the events, Occupational health and safety of the kind of responses and feedback will give the managers of the interview will try to explain the interview technique. In addition, it was determined by the employer to determine the quality of the health services provided to the employees, to contribute to the solution of the problems encountered and to contribute to the scientific knowledge and to influence the policies related to the health services to be given to the employees. Although there is considerable progress in occupational health and safety, shortcomings in occupational health and safety have been a major problem for many years. These problems sometimes cause major traumas in the studies. The first condition for helping such employees is to determine the extent to which they are affected by such incidents and to identify their problems is expected to be a good key for solutions..

## 2. AN OVERVİEW OF THE OCCUPATİONAL HEALTH AND SAFETY

### 2.1 Historical Development of Occupational Health and Safety

The Ontario Occupational Health and Safety Act (OHSA) was first modeled after the British Factory Act from the 17th century onwards. Ontario introduced the Factory Act of 1884, the first Occupational Health and Safety Act. This law was important because children and women proposed prohibitions on their business activities and proposed working time constraints for all studies. However, it was extremely uncertain in terms of definition and could not be fully implemented. This was a start, but in reality, the Factory Act of 1884 did little to protect the worker. Employers stated that they prefer the Law because it does not intend to limit production but makes production more secure. Occupational Health and Safety (OHS) has become an important issue in the last 30 years. The establishment of the Occupational Safety and Health Administration (OSHA) in 1970 suggests that safety at work is a fundamental expectation for all employees. In the first ages of industrialization, the health problems of the employees have been at a high level, then the security and health understanding has developed and this situation has been parallel with the developments in the working life (Güçlü M, 2007). The concept of occupational health and safety at work places the technical rules about the responsibilities brought to the employer in order to minimize or eliminate the problems faced by the workers at the time of the work (Demircioğlu M, 2002)

### 2.2 Objectives of Occupational Health and Safety

Every employee's safety and health is a high priority. Management is responsible for providing a safe working environment and providing employees with the necessary equipment to comply with standards and practices for doing business. Safety and health will be provided only by teamwork. Everyone should come

**Məmmədli Minəvvər Naib qızı**
Azərbaycan Turizm və Menecment Universiteti

# TURİZMİN SOSİAL-İQTİSADİ İNKİŞAFA TƏSİRİ

***Açar sözlər**: turizm, turizm sənayesi, sosial-mədəni inkişaf , iqtisadi inkişaf, infrastrukturu*
***Key words**: tourism, tourism industry, socio-cultural development, economic development, infrastructure*
***Ключевые слова**: туризм, индустрия туризма, социокультурное развитие, экономическое развитие, инфраструктура*

Azərbaycanda son dövrlərdə turizmin inkişafı nəzərə çarpacaq miqyasda artmışdır. Müasir dövrdə turizm fəal istirahətin geniş yayılan və kütləvi növü hesab olunur. Hər il daha çox insan səyahət həvəskarları sırasına qoşulur və turizm getdikcə daha çox yayılır. Turizm hal –hazırda şəxsiyyətin sosial-mədəni inkişaf vasitəsi kimi çıxış etməklə yanaşı,eyni zamanda ərazinin iqtisadi inkişafı üçün başlıca amil rolunu oynayır, bu və digər regionun müxtəlif istiqamətlərdə inkişafına təkan verir. Qeyd etmək lazımdır ki, turizm xidmətinə iqtisadi inkişaf amili kimi yanaşma ölkənin iqtisadi və maliyyə resurslarının daha səmərəli istifadəsi tələbini formalaşdırır.

Ölkəmizdə turizm mühiti tədricən formalaşır və genişlənir, müasir tələblərə uyğun formada təşkil olunur. Bununla paralel olaraq, turizmin maddi və maliyyə bazası, dövlət himayəsi və idarə edilməsi tələbi ortaya çıxır. Turizm daha çox asudə vaxtın dəyərləndirilməsi və rekreasiya məqsədi ilə istifadə olunan fəaliyyətdir. Ancaq eyni zamanda turizm sənayesi təhsil, tərəqqi və beynəlxalq əlaqələrdə sosial-mədəni inkişafın formalaşdırılmasında ciddi rola malikdir. Turizm fəaliyyəti nəticəsində insani dəyərlər, davranış və daha yaxşı həyat tərzi formalaşır. Həmçinin turizmlə bağlı fəaliyyətlər asudə vaxtın dəyərləndirilməsi imkanını təqdim edərək, insanlara yeni və fərqli istirahət imkanları təqdim edir. Hal-hazırda turizm müasir dünyanın ən böyük sənaye sahəsi və sürətlə inkişaf edən iqtisadi sektorlarından biri hesab olunur. Əksər ölkələr üçün turizm yeni iqtisadi fəaliyyətləri stimullaşdıraraq, regional inkişaf üçün başlıca vasitə kimi qiymətləndirilir. Turizm gəlir balanlaşdırılması, məşğulluq, ümumi gəlir və istehsalatda müsbət iqtisadi təsirə malikdir. Turizmin əlaqədar olduğu üç başlıca aspekt mövcuddur: ətraf mühit, sosial-mədəni və iqtisadi [2]. Ölkədə turizmin sosial-iqtisadi inkişafı turizm sənayesindən asılıdır. Bu sənaye sahəsi xarici valyuta, xarici ticarət balansı, məşğulluq imkanı yaradır. Turizm ölkənin iqtisadi inkişafını və bu sahədən əldə olunan gəliri artırır və digər sektorların inkişafına təkan verir. Bundan əlavə, turizm sənayesində məşğulluq imkanlar yaratmaq ən irimiqyaslı sektorlardan birinə çevrilib.Həmçinin turizm sənayesi ölkənin bir çox bölgəsinə xitab edərək, regionların əhalisi üçün də məşğulluq imkanları yaradır. Nəticə etibarilə, bu sahənin fayda və səmərəsi kənd və şəhər əhalisi arasında bərabərlik yaratmaq imkanı təqdim edir. Turizm sənayesinin inkişafı və yeni turizm bölgələrinin yaradılması yerli əhaliyə öz kiçik bizneslərini qurmaqda kömək edir və daha çox imkan formalaşdırır. Turizmdə kiçik biznеslərin inkişafı əhalinin çox hissəsinin maraqlarına xidmət edir. Burada dövlətin, eyni zamanda yerli əhalinin iqtisadi maraqları, həmçinin sosial-ekoloji maraqlar öz həllini tapır.

Turizmdə kiçik biznesin inkişafı hər kəsin maraqlarına xidmət edir. Burada həm dövlətin, həm yerli əhalinin iqtisadi maraqları, həm də sosial-ekoloji maraqlar öz həllini tapır. Turistlərin gəldikləri regionda pul xərcləmək istədikləri əlavə xidmətlərin, demək olar ki, hamısı kiçik biznesin payına düşür. Məsələn, kəndə gəlmiş turistlərə hədiyyəlik əl işləri istehsal edib satan sənətkarlar, onlara bal-qaymaq və digər milli yeməklər təklif edən fərdi təsərrüfatlar kiçik biznesin təmsilçiləridir. Mövcud dünya təcrübəsinə əsasən, turizm sənayesinin də gəlirləri, əsasən, burada formalaşmalıdır. Belə ki, heç bir böyük turizm firması və turoperator turistlərin istəyinə görə regionun hər yerində bu xidmətləri təşkil edə bilməz. Bu, sadəcə, zaman və məkan şərtlərinə görə mümkün deyildir. Məhz bu səbəbdən turizm xidmətlərində kiçik biznesə verilən dəstək öz nəticəsini regionun ucqarlarında əhali gəlirlərinin artırılmasına imkan verən minlərlə yeni iş yerinin yaradılmasında, regionun sosial-iqtisadi inkişafında göstərir. Turizm sənayesində kiçik biznesin sosial-ekoloji səmərəsi də yüksək qiymətləndirilir. Turistlərin yüksək komfort standartlarına olan tələbinin ödənilməsi baxımından turist qəbul edən ərazidə sosial infrastruktur sahələrinin inkişafına şərait yaranır ki, bu da təkcə turizm sənayesinə deyil, bütün yerli əhalinin sosial maraqlarına xidmət edir.

Turizmin iqtisadi və sosial inkişafda aparıcı rolu və prioritetliyi onun gəlirlərin formalaşmasında yerli və sahibkar, həm də əhali gəlirlərinin artımına təsiri ilə ölçülür. Belə ki, sahibkar üçün iqtisadi cəhətdən əlverişli kompleks sahibkarlıq mühitinin yaradılması birbaşa turizm sferasında da adekvat real imkanlar

yaradır. Turizm idarəetmə obyekti olaraq proqramatik məqsədlər və alternativ imkanların seçilməsi üçün xarakterik rol oynayır. Turizmin inkişafında mülkiyyət münasibətləri, ümumi iqtisadi artıma can atmaq və gəlirlərin bölgüsündə təkrar istehsal və təşəbbüskarlıq mexanizmlərinin nəzərə alınması bu sahənin multipikasiya səmərəsi ilə müəyyənləşir. Bu yanaşmaya uyğun funksional fəaliyyət modelini aşağıdakı kimi təsvir etmək olar.

Turizm bazarının sosial mahiyyəti kənd əhalisinin məşğulluq səviyyəsinin artması, ev təsərrüfatında turistlərin istehlakı üçün məhsullar və xidmətlər göstərilməsi, mənzil kirayəsi, xalça, hədiyyə üçün müxtəlif metal və taxta əşyaları istehsalı ilə müəyyən olunur. Turizmin inkişafının sosial əhəmiyyəti əhalinin asudə vaxtının rasional istifadəsinin təmin olunması ilə bağlıdır. Qeyd etmək lazımdır ki, turizm xidməti yalnız şəxsi istirahət üçün turist marşrutu müəyyən edən insan kontingenti deyil, eləcə də istirahətin digər növlərindən istifadə edən, yaxud spesifik turist xidmətləri qəbul edən əhalini də əhatə edir.

Əhəmiyyətli müsbət iqtisadi təsir məşğulluğu artırır, yeni iş imkanları təmin edir yaşam standartlarını yüksəldir, daha çox investisiya və infrastruktur inkişafını, yeni biznes əlaqələrini və imknalarını özü ilə birlikdə gətirir. Bununla belə bəzi neqativ iqtisadi təsirlər də mövcuddur. Neqativ təsirlərə başlıca olaraq, yüksələn gəlir bərabərsizliyi, ərazi qiymətlərinin vəicarə haqqının yüksəlməsi, mühüm əmtəə və xidmətlərdə qiymət artımı, mövsümi təsirləri aid etmək olar. Həmçinin araşdırmadan belə bir qənaətə gəlirik ki, turizm aktivlərinin və bu sektordakı yüksək maaşlı işlərin əksəriyyəti yerli əhali tərəfindən deyil, başqaları tərəfindən istifadə olunur və yerli əhali turizm sənayesindən kifayət qədər faydalana bilmir.

Müsbət sosial-mədəni təsirlərə başlıca olaraq, turizmin daha çox sosial səviyyədə mədəniyyətlərarası qarşılıqlı əlaqələrə yol açmasını,beynəlxalq əlaqələri gücləndirməsini qeyd edə bilərik. Eləcə də, turistlər sağlamlıq, polis və yanğın departamenti ilə əlaqədar xidmətləri maliyyələşdirərək, xidmət üçün tələbləri artıraraq, ictimai xidmətlərdən istifadə edirlər. Parklar və skamyalar kimi digər ictimai obyektlər ictimaiyyət tərəfindən yaxşı şəkildə istifadə edilərək, turistlərin istifadəsinə təqdim edilir [4].

Qarşılıqlı mədəni əlaqələr nəticəsində mənfi təsirlər yarana bilər. İqtisadi baxımdan mənfi təsirlərə bunu aid edə bilərik ki, yerli əhalinin turist tələblərini qarşılaması tələb olunur və bu da öz növbəsində vergilərin artırılmasına gətirib çıxarır. Bu hal əmlak satın almaq istəyən yerli əhali və ya sabit gəlirə malik digərləri üçün problem yaradır. Digər mənfi sosial-mədəni təsirlərə yerli əhali ilə turistlər arasındakı sosial və mədəni fərqlilikləri nümunə göstərmək olar. Turist və yerli əhali arasındakı əlaqəyə təsir göstərməsindən əlavə, yerli əhali arasında da müəyyən problemlərin ortaya çıxmasına səbəb ola bilər. Turistlərin sayının artması cinayət hallarının yüksəlməsinə də səbəb olur. Buna başlıca olaraq, kobud rəftar, spirtli içkilərdən və qanunsuz narkotik maddələrdən istifadəni aid etmək olar. Bundan əlavə ‘’vaxtını şən keçirmək istəyən‘’ turistlərə görə qumar və əxlaqsızlıq halları yüksəlməkdədir. Eyni zamanda turizmin inkişafı və bunun nəticəsində turistlərin sayının artması əhalinin sayının artmasına və bir çox ərazidə yerli əhalin gündəlik həyatına təsir göstərəcək çoxluğa yol aça bilər [3].

Turizmin iqtisadi töhfəsi birbaşa və dolayı yolla hiss olunur, burada aşağıda qeyd olnan məhsullar satıldıqda birbaşa iqtisadi təsirlər yaranır: yaşayış və əyləncə, yemək və içki xidməti və pərakəndə imkanlar. Turizmin birbaşa iqtisadi təsirlərinin əsas komponenti bundan ibarətdir ki, ölkənin sərhədləri daxilində baş verir və "sakinlər və qeyri-rezidentlər tərəfindən biznes və istirahət məqsədləri üçün həyata keçirilir".

Müvafiq istiqamətlərdə həyata keçirilən sosial-iqtisadi və siyasi tədbirlər nəticəsində regiona turist axını yaranır ki, həmin turizm regionu da gələn qonaqlardan (turistlərdən) qazanc əldə edir və gəlir götürür. Qonaqlara xidmət edilməsindən əldə olunan qazanc ilkin kapital kimi regionun inkişafında mühüm rol oynayır və regionun daimi sakinlərindən alınan gəlirlərdən həcm və mahiyyət baxımından daha çox əhəmiyyətlidir. Belə ki, turizmdən götürülən gəlir dövriyyəyə daxil olur və tezliklə öz səmərəsini verir. Regionda daha çox xidmət satılırsa, bu halda əldə edilən mənfəətin həcmi də yüksək olacaqdır, yəni yerli istehsalın daha da gücləndirilməsi üçün geniş imkanlar yaranacaqdır [1; s.13]. Məsələn, bütün bu qeyd edilənlərə Qəbələ şəhərinin timsalında nəzər saldıqda görürük ki, şəhərin sürətli iqtisadi irəliləyişində nəzərə çarpan uğurlardan biri rayonda turizmin inkişafıdır. Qəbələdə xeyli sayda ailə pansionatları, 20-yə yaxın dünya standartlarına cavab verən böyük turist obyektləri fəaliyyət göstərir. Qısa müddət ərzində Böyük Qafqaz sıra dağlarının ətəklərində sıx meşəliklərin, dağ çaylarının əhatəsində ən müasir tələblərə cavab verən mehmanxanalar,istirahət evləri, pansionatlar ucaldılıb, yolları çəkilib.

Bir sözlə, turizm sənayesini inkişaf etdirmək üçün bütün zəruri infrastruktur yaradılıb. Bütün bu dəyişiklklər, ilk növbədə, şəhər iqtisadiyyatına və şəhər əhalisinin həyat tərzinə müsbət təsir göstərib. Belə ki, turizmin reallaşdırılması başlamazdan əvvəl rayon ölkədə 50 faiz yoxsulluq fonunda kasıb bölgələrdən sayılırdı. Bu gün isə Qəbələdə işsizlik sıfır səviyyəsindədir, işsizlik demək olar ki, tamamilə ləğv edilmişdir. Bunun səbəbi sadəcə cox sayda insanın birbaşa turizm sənayesinin müxtəlif sahələrinə,

obyektlərin tikintisinə, servis xidmətlərinə cəlb olunması deyil. Əsas səbəblərdən biri on minlərlə yerli kənd sakininin konkret olaraq fəaliyyət göstərən turizm obyektləri üçün kənd təsərrüfatı məhsulu istehsal edir.

**Ədəbiyyat:**

1. İ.Hüseynova, N.Əfəndiyeva, Turizmin əsasları
2.http://www.serqqapisi.az/index.php/humanitar/turizm/2330-turizm-izhtisadiyyat-n-bir-sahaesi-aelverishli-biznes-noevudur
3. file:///C:/Users/user/Downloads/70510002.pdf
4. https://en.wikipedia.org/wiki/Impacts_of_tourism

**Influence of tourism on socio-economic development**
**Summary**

The tourism sector in our country is gradually formed and expanded and is organized in accordance with modern requirements. Tourism is considered an activity using for evaluating the leisure time and also recreational purposes. But at the same time, tourism industry plays a significant role in the formation of socio-cultural development in education, progress and international relations. For most countries tourism is regarded as a key tool for regional development, stimulating new economic activities. Tourism has a positive economic impact on the balance of income, employment, general income and production. There are three major aspects of tourism: environmental, socio-cultural and economic. The tourism industry penetrates many regions of the country and offers new employment opportunities for the region's population. The development of small business in tourism serves the interests of everyone. The economic interests of state and local people, as well as socio-ecological interests are solved here.

**Влияние туризма на социально-экономичское развитие**
**Резюме**

Туристический сектор в нашей стране постепенно формируется и расширяется и организуется в соответствии с современными требованиями. Туризм считается видом деятельности, используемым для оценки досуга, а также рекреационных целей. Но в то же время индустрия туризма играет значительную роль в формировании социально-культурного развития в образовании, прогрессе и международных отношениях. Для большинства стран туризм рассматривается как ключевой инструмент регионального развития, стимулирования новых видов экономической деятельности. Туризм оказывает положительное экономическое влияние на баланс доходов, занятости, доходов и производства. Существует три основных аспекта туризма: экологический, социально-культурный и экономический. Индустрия туризма проникает во многие регионы страны и предлагает новые возможности трудоустройства для населения региона. Развитие малого бизнеса в сфере туризма служит интересам каждого. Здесь решаются экономические интересы государства и местного населения, а также социально-экологические интересы.

**Rəyçi: m. S.Əzizova**

**Nəhmətova Zərxanım Çingiz qızı**
Azərbaycan Turizm və Menecment Universieti

# MİLLİ BAYRAMLAR TURİZM POTENSİALI KİMİ

***Açar sözlər:*** *Novruz, bayram, festival, hadisə turizmi, adət-ənənə*
***Key words:*** *Novruz, holiday, festival, event tourism, tradition*
***Ключевые слова****: Новруз, праздник, фестиваль, событийный туризм, традиция*

## Giriş

Turizmin inkişafı üçün ilkin şərt kimi təbii şərait, tarixi mədəni abidələr, zəngin mədəniyyət əsas rol oynasa da bu sahənin genişlənməsi, reklam olunub dünyada öz layiqli yerini tutması üçün də əlavə tədbirlər lazımdır. Daxili və beynəlxalq turizmin inkişafına təkan verən festivallar da bu qəbildəndir. Bölgənin və ya ölkənin beynəlxalq miqyasda tanınmasını təmin edən, turizm destinasiyasının imicinin formalaşmasına və məşhurlaşmasına xidmət edən festivallar və bayramlar turizm fəaliyyətini dəstəkləyən ən mühüm tədbirlərdən biridir. Xüsusilə kənd yerlərindəki turizmi canlandırmaq və bölgənin turistlər üçün daha cəzbedici olmasını ön plana çəkmək məqsədilə keçirilən, içərisində müxtəlif yerli tədbirlərin yer aldığı (oyunlar, tamaşalar konsertlər), əl işlərinin sərgiləndiyi, adət-ənənənin təbliğ edildiyi və bölgənin milli mətbəxinin təqdim edildiyi ənənəvi bayramlar və festivallar bölgələrin tanınmasında çox böyük əhəmiyyət kəsb edir.

## Əsas hissə

Millətləri meydana gətirən təməl ünsürlərdən biri olan mədəniyyət millətllərin maddi və mənəvi dəyərlərinin cəmidir. Dil, din, adət və ənənələr, sənət və ədədbiyyat bir cəmiyyətin keçmiş minilliklərdən süzülüb gələn mədəni dəyərləridir. Bu baxımdan millətlərin var olma səbəblərindən ən önəmlisi, cəmiyyətlərin sosial tələbatı olan mədəni ünsürlərimizdir.

Mədəni və tarixi ünsürlərdən biri olaraq "Bayram" dövlət və millətlərin həyatında ayrılmaz bir parçadır. Bayramlar hər millətin içində var olan, cəmiyyətin bütün fərdləri tərəfindən mənimsənən və o günün bütün imkanlarıyla xalqın qatıldığı ortaq bir dəyəridir. Bu xüsusiyyələrinə görə "Bayram"lar, insanlar arasındakı qarşılıqlı sevgi və hörmətin formalaşdığı gündür. Eyni şəkildə bayramlar, milli və dini duyğuların, inancların, adət və ənənələrin həyata keçirildiyi, sərgiləndiyi bir cəmiyyətdə millət olma şüurunun formalaşdığı, qüvvətləndiyi günlərdəndir. Bildiyimiz kimi bütün bayramlar dini və milli bir inancdan, o cəmiyyəti marağlandıran ortaq bir xatirədən, ənənələrdən, duyğulardan və təbiətdən yaranmaqdadır. Ayrıca bayramlar milli şüurun formalaşdığı və qüvvətləndiyi önəmli zaman kəsiyidir.

Milli bayramlar milli-mənəvi dəyərlərimizin təbliği, doğma Vətənə bağlılıq dünyanın müxtəlif diyarlarında yaşayan soydaşlarmızın yekdiliyi və mütəşəkkillik ideyalarını özündə əks etdirir.

Azərbaycan mədəniyyətinin əsas hissəsi kimi milli bayramlar xalq məişət ənənəsinin göstəricisidir. Adət-ənənələrinin göstəricisi olan milli bayramlarımızın tarixiliyi qədimdir. Azərbaycanda hələ əskilərdən bayramların təşkili müəyyən hadisələrlə bağlı olub. Baharın gəlişi, məhsul yığımı, taxıl biçini, torpaq əkini və başqa gündəlik məişət işləri ilə əlaqədar qeyd edilib.

Xalqın adət-ənənələrini özündə əks etdirən mədəni və milli irs nümunələrinə ənənəvi sənətkarlıq, milli bayram və festivallar, milli kulinariya, foklor nümunələri və s. aid edilir. Mədəni irs nümunələrindən daha çox beynəlxalq turizmdə istifadə olunur.

Mədəni abidələrin və xalq yaradıcılığının turizmdə istifadəsi onların ayrı-ayrı qrupları üzrə aparılır. Mədəni-mənəvi abidələrə etnoqrafiya, xalq yaradıcılığı, suvenir istehsalı, milli mətbəx nümunələri də daxil olduğuna görə onların turizm baxımından birgə istifadəsi mümkündür.

Etnoqrafik abidələrə xalqların adət-ənənələri, milli bayram və dil xüsusiyyətinin müxtəlifliyi daxil edilir. Etnoqrafik abidələr istifadə xüsusiyyətinə görə hər hansı bir xalqın və ya etnik qrupun yayıldığı ərazilərdə, yaşayış məntəqələrində turizm və elmi məqsədli səyahətlərin təşkili ilə bağlı olur.

Etnoqrafik abidələrin turizmdə rolu-mövcud marşrutlarda istifadə olunmasına, kütləvi turizm tədbirlərinin keçirilməsində əhəmiyyətlidir. Belə ki, xalqların milli adət-ənənələrinin, bayramlarının, beynəlxalq və yerli festivalların keçirilməsi kütləvi turistlərin cəlb olunmasına imkan verir. Azərbaycanda belə etnoqrafik abidələr Xınalıq, Basqal, Lahıc, Şəki və Ordubadda yayılmışdır [3, səh 72].

Milli bayramların, festivalların keçirilməsi xarici turistlərin cəlb olunmasında əsas vasitələrdən sayılır. Odur ki, bayram anlayışını dərindən anlamalı, milli bayramlarmızın xüsusiyyətlərini və onun mahiyyətini araşdırıb bundan ölkə turizminin inkişafında istifadə etmək lazımdır. Azərbaycanda milli

bayramların, festivalların keçirilməsi milli turizm irsinin, habelə Avropa, Şimali Amerika və Avstraliyada son dövrlərdə geniş yayılmış hadisə turizminin (event tourism) əsasını təşkil edə bilər. Xüsusilə, Novruz bayramına aid olan tədbirlərin keçirilməsi Azərbaycanın turizmində mühüm rolu vardır. Belə ki, Novruz bayramının 4-5 gün davam etməsi ölkə daxilində bu tədbirlərin genişlənməsinə imkan yaradır. Novruz bayramı günlərində əyləncə tədbirlərinin keçirilməsi, qısa müddətli səyahətin təşkili mümkündür. Novruz bayramı günlərində ölkəyə gələn turistlərin sayının artdığını və bayramla əlaqədar yalnız paytaxta deyil bölgələrə də yeni səyahət marşrutlarının yaranmasına tələbatın mövcudluğu qalmaqdadır.

Baharın gəlişini müjdələyən, xalqımızın qədim tarixə malik milli bayramı olan Novruz bayramı hər il İçərişəhərdə təntənəli şəkildə qeyd olunur. Azərbaycan Respublikası Nazirlər Kabineti yanında "İçərişəhər" Dövlət Tarix-Memarlıq Qoruğu İdarəsi öz ənənəsinə sadiq qalaraq hər il mart ayının 20-dən 23-nə kimi Beynəlxalq Novruz Festivalını keçirir. Dörd gün davam edən Novruz Bayramı festivalında Azərbaycan da daxil olmaqla bu bayramı qeyd edən yeddi ölkənin (İran, Əfqanıstan, Qazaxıstan, Özbəkistan, Türkmənistan və Qırğızıstan) nümayəndələri də iştirak edir [5].

Azərbaycanın birinci xanımının böyük xidmətləri hesabına milli muğam, aşıq, tar ifaçılığı, xalçaçılıq, Lahıc misgərlik sənətləri, çövkən atüstü oyunu, kəlağayı simvolizmi, Novruz bayramı UNESCO-nun qeyri-maddi mədəni irsin reprezentativ və təcili qorunmaya ehtiyacı olan qeyri-maddi mədəni irs siyahılarına daxil edilmişdir.

Turistlərin zövqlərinə uyğun olaraq, müxtəlif növ yeni turizm fəaliyyətlərinin təşkil edilməsi vacib məsələlərdəndir ki, bu istiqamətdə tədbirlərin həyata keçirilməsi üçün Novruz bayramı Azərbaycan üçün vacib turizm imkanıdır. Ümumiyyətlə, Bakı şəhərində hər il "İçərişəhər" Dövlət Tarix-Memarlıq Qoruğu və "Qala" qoruğu ərazisində Novruz bayramı festivalları keçirilməkdədir. Bu bayram regiondakı əksər xalqlar, xüsusən də iranlı turistlər üçün ən vacib bayramlardandır. Bir çox ölkələr bu bayramı ciddi şəkildə dəyərləndi-rərək, əsasən də İranlı turistlərin cəlb edilməsi məqsədilə xüsusi tədbir və proqramlar və bunların təbliğatı üçün xüsusi turist xidmət paketləri işləyib hazırlayırlar. Buna müvafiq olaraq, Novruz bayramı üzrə festivalla bağlı tədbirlərin "İçərişəhər" Dövlət Tarix-Memarlıq Qoruğu və "Qala" qoruğu ilə yanaşı, şəhərin digər yerlərində həmçinin regionlarda Novruz festivallarının keçirilməsi nəticəsində çoxlu sayda turistlərin cəlb edilməsi mümkündür. Bu məqsədlə, Novruz bayramı ilə bağlı xüsusi turist xidmət paketləri hazırlana və bu bayramın qeyd edildiyi ölkələrdə geniş şəkildə təbliğ edilə bilər [2, səh 29].

Bundan əlavə, Azərbaycanın, əsasən də Bakının Novruz bayramı ərəfəsində cəlbediciliyini artırmaq məqsədilə çərşənbə axşamlarında və bayram zamanı açıq hava altında festivallar, Azərbaycan və regiondakı qonşu ölkələrdən folklor musiqi ifaları və Novruz süfrələri ətrafında fəaliyyətlər təşkil edilməli və həmin tədbirlərdə iştirak da bu paketlərə əlavə edilməsi və bu paketlər haqqında xarici kommunikasiya vasitələrilə məlumatlandırılma təmin edilməsi planlaşdırılır. Qeyd edək ki, Novruz bayramı UNESCO-nun qeyri-maddi irs nümunələri sırasına daxil edilmişdir.

Bununla yanaşı regionlarda müxtəlif milli bayramların, şəhərlərin tarixinin qeyd olunması turizm hərəkatının canlanmasına şərait yarada bilər. Belə tədbirlərə misal olaraq, Gəncədə Şəhər günü yubileyinin keçirilməsi, Göyçayda "Nar", Lənkəranda "Çay","Yerli mətbəx" bayramları, Balakəndə "Xurma", Şəkidə "İpək", "Yerli mətbəx" və ya "Gülüş" bayramına aid tədbirlər və s. xüsusiyyətlər turizmin inkişafına, əsasən də qonşu dövlətlərdən böyük turist axınına təkan verə bilər. Belə tədbirlərin ölkənin müxtəlif bölgələrində keçirilməsi mümkündür.

Son illər nəinki respublikamızın paytaxtında, eləcə də Naxçıvan, Qəbələ, Şəki, İsmayıllı, Lənkəran və digər şəhər-rayonlarda keçirilən tədbirlər həm bölgələrin mədəni irsinin, həm də turizm potensialının yerli və beynəlxalq ictimaiyyətə tanıdılması baxımından əhəmiyyətlidir. Bu istiqamətdə Mədəniyyət və Turizm Nazirliyinin "2010-2014-cü illər üçün Xalq Yaradıcılığı Paytaxtları" proqramının əhəmiyyətini xüsusi vurğulamaq lazımdır. Proqram dünyanın qabaqcıl ölkələrinin mədəniyyət siyasətində təcrübələri nəzərə alınmaqla Azərbaycanın qeyri-maddi mədəni irsinin (diyarşünaslıq, folklor, sənətkarlıq) qorunması, dəstəklənməsi, təbliği və təşviqi məqsədilə qəbul edilmişdir. 2010-cu ildən indiyədək icra olunan proqram nəticəsində qeyri-maddi mədəni irsin inkişafı vüsət almış və regionların sosial-mədəni həyatında müsbət dəyişikliklər baş vermişdir.

Proqrama müvafiq olaraq ötən dövrdə illər üzrə müxtəlif bölgələrimiz "Azərbaycanın Əfsanələr Paytaxtı", "Azərbaycanın Folklor Paytaxtı", "Azərbaycanın Sənətkarlıq Paytaxtı", "Azərbaycanın Ədəbiyyat Paytaxtı", "Azərbaycanın Milli Mətbəx Paytaxtı" seçilmişdir. Paytaxt şəhər və rayonlarda müvafiq nominasiyaya uyğun olaraq təntənəli mərasimlər, respublika və beynəlxalq səviyyəli elmi-praktik konfranslar, "dəyirmi masa"lar, konsertlər, müsabiqələr, festivallar, sərgilər, yarmarkalar və s. təşkil

olunmuşdur. Qazax, Lənkəran, Masallı, Gədəbəy, Gəncə, Balakən, Zaqatala, Qax, Xaçmaz, Şəki, Şamaxı, Qəbələ, İsmayıllı, Göygöl, Qusar ötən illərdə bu cür paytaxt seçilən rayon və şəhərlər sırasındadır. Proqram çərçivəsində hər bir şəhər və rayonun çoxsahəli folkloru, rəvayətləri, əsatirləri, əfsanələri, atalar sözləri, xalq tamaşaları, dekorativ və təsviri sənəti, xalq musiqisi və rəqsləri, şifahi xalq yaradıcılığı, adət və ənənələri, bayram-mərasimləri və s. mədəni-mənəvi irsi araşdırılır, dərindən öyrənilir [4].

Bundan əlavə, TÜRKSOY tərəfindən həyata keçirilən "Türk dünyasının mədəniyyət paytaxtı" layihəsi çərçivəsində Şəki şəhəri 2016-cı il üçün türk dünyasının mədəniyyət paytaxtı, Qusar isə Azərbaycanın folklor paytaxtı seçilmişdir. ISESCO-nun müvafiq qərarı ilə Naxçıvan MR-in Naxçıvan şəhəri 2018-ci il üçün "İslam Dünyasının Mədəniyyət Paytaxtı" elan edilmişdir. Əfsanələr paytaxtları Gəncədə 68, Şabranda 57, Gədəbəydə 41, Xaçmazda 59, Qəbələdə 41, Sənətkarlıq paytaxtları Şəkidə 60, Lənkəranda 46, Masallıda 41, Zaqatalada 60, Balakəndə 43, Folklor paytaxtları Qazaxda 64, İsmayıllıda 58, Qubada 37, Göygöldə 41, Abşeronda 39 möhtəşəm tədbir keçirilmişdir. 2015-ci ildə Şamaxı Ədəbiyyat Paytaxtı, Qax Milli Mətbəx Paytaxtı seçilmişdir.

Bu tədbirlər həm də Azərbaycanın bölgələrinin əlverişli turizm potensialının təbliği baxımından mühüm əhəmiyyət kəsb etmişdir. Son illər turizm sahəsində müasir dövrün tələblərinə uyğun işlərin aparılması dövlət siyasətinin əsas istiqamətlərindən birinə çevrilmişdir.

**Nəticə**

Zəngin tarixə və mədəniyyətə malik olan Azərbaycanda milli adət və ənənələrmizi əks etdirən bayramlardan xüsusilə Novruz bayramından turizm potensialı kimi istifadə etmək mümkündür. Dünya praktikasında olduğu kimi Azərbaycanın bölgələrində də milli və ənənəvi bayramları beynəlmilliləşdirərək yüksək səviyyədə təşkil etmək və buraya cəlb olunan turistlərin sayının daha da artmasını təmin etmək olar.

**Ədəbiyyat:**

1. Azərbaycan Etnoqrafiyası III cild
2. Azərbaycan Respublikasında ixtisaslaşmış turizmin inkişafına dair Strateji Yol Xəritəsi. 2016, 98 s
3. Azərbaycanda turizm və onun inkişafı Həbibə Soltanova, Azərbaycan Respubliasında turizm və onun inkişafı. Bakı, 2015
4. http://www.anl.az/down/meqale/ses/2010/sentyabr/133615.htm
5. https://icherisheher.gov.az/

**National holidays as tourism potential**

**Summary**

Novruz holiday is one of the most popular holidays in our country and it is celebrated solemnly. This holiday have a great importance for our country in terms of tourism as well. İf we take into consideration growing number of tourists during Novruz holiday, we can see that there is a need for new travel routes not only in the capital but also in the regions.

**Национальные праздники как туристический потенциал**

**Резюме**

Праздник Новруз является одним из самых популярных праздников в нашей стране и отмечается торжественно. Этот праздник имеет большое значение для нашей страны с точки зрения туризма. Если принять во внимание рост числа туристов во время праздника Новруз, то можно увидеть, что потребность в новых туристических маршрутах существует не только в столице, но и в регионах.

**Rəyçi: dos. B.Bilalov**

## PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА

**Гулиева Эллада Муса гызы**
Бакинский славянский университет

# К ВОПРОСУ ПОДГОТОВКИ КОНКУРЕНТОСПОСОБНОГО ВЫПУСКНИКА В СТЕНАХ ПЕДАГОГИЧЕСКОГО ВУЗА

***Ключевые слова:*** *профессиональная компетентность, педагогическое образование, педагогическая практика, активные методы обучения, дискуссия, деловая игра, научное творчество*
***Açar sözlər:*** *peşəkar səriştə, pedaqoji təhsil, pedaqoji təcrübə, fəal təlim metodları, diskussiya, işgüzar oyun, elmi yaradıcılıq*
***Key words:*** *professional competence, pedagogical education, pedagogical practice, active teaching methods, discussion, business game, scientific creativity*

Образование в условиях современности является ключевым фактором развития личности. Возросший спрос на высшее образование в условиях современности привел к пересмотру концепции развития вузов, расширению их профилей, изменению целей, задач, содержания, форм образования и системы контроля, а также к росту значимости качественного образования. Новые условия предусматривают модернизацию педагогического образования на компетентностной основе. Выход за рамки предметно-знаниевой парадигмы и переход к деятельностной предусматривают подготовку к целостному опыту решения жизненных проблем. Современный вуз призван способствовать подготовке специалистов, успешных как в профессиональном, так и личностном аспектах, формировать выпускника с высоким уровнем личностной и профессиональной компетенций.

В педагогической литературе понятие «педагогическая компетентность» рассматривается как совокупность знаний, умений и профессионально значимых личностных качеств:

«Профессиональная компетентность – интегральная характеристика, определяющая способность решать профессиональные проблемы и типичные профессиональные задачи, возникающие в реальных ситуациях педагогической деятельности, с использованием знаний, жизненного опыта, ценностей и наклонностей» (1, 8).

Программа подготовки будущих учителей в соответствии с требованиями времени призвана обеспечить получение полноценной базовой предметной, научной, общекультурной подготовки; способствовать утверждению общечеловеческих ценностей; межпредметной интеграции обучения; сочетанию обязательных и выборочных курсов; содействовать саморазвитию и самообразованию.

Современный учитель должен быть компетентностным в предмете и методах преподавания; в мотивации обучающихся; в принятии педагогических решений; в реализации образовательных программ и умении принимать решения в тех или иных педагогических ситуациях; в организации учебной деятельности и реализации педагогического оценивания. Учитель должен быть носителем традиционных ценностей страны и гражданского общества, личностью, владеющим психолого-педагогическими знаниями и педагогическими технологиями, способами эффективной коммуникации. Известно, что характер профессиональной деятельности учителя зависит прежде всего от его профессиональной подготовки. Поэтому в вузе следует с первого курса внедрять в учебный процесс элементы профессиональной деятельности, повышать профессиональную мотивацию студентов, учить их осознавать социальную значимость педагогической деятельности, помочь войти в мир педагогической профессии.

Как известно, одни предметные знания не могут гарантировать результатов образования, необходимых для дальнейшей профессиональной деятельности. Выпускнику педагогического вуза необходимы знания базовых компетенций, отражающих специфику профессиональной деятельности; он призван создавать условия для достижения ученикам цели образования (формировать ключевые компетенции учащихся); устанавливать правильное взаимодействие с субъектами педагогического процесса, профессионально самосовершенствоваться.

Современное педагогическое образование призвано формировать у студентов способность к инновационной деятельности в сфере образования. Ныне происходит модернизация содержания педагогических курсов, внедрение инновационных технологий, широкое участие студентов в научно-исследовательской деятельности, введение диалоговых форм учебных занятий. Важное значение

отводится проблемно-деятельностной постановке учебного процесса, самостоятельному приобретению знаний, содействующие развитию аналитического и логического мышления студентов.

В системе профессиональной подготовки будущих специалистов значительное место ныне отводится рациональной организации самостоятельной работы. Целесообразное соотношение обязательных занятий и самостоятельной работы студентов содействует оптимизации интеллектуальной деятельности студентов, творческому освоению знаний. В педагогической литературе представлено множество классификаций видов самостоятельной работы студентов, однако используется в основном классификация, предложенная П.И.Пидкасистым (тренировочные, реконструктивные и творческие самостоятельные работы).

Самостоятельная работа студентов является важным фактором совершенствования учебной, научной их профессиональной деятельности, условием повышения эффективности процесса обучения. В самостоятельной работе, как в двустороннем процессе взаимодействует преподаватели и студенты, она требует организующей и контролирующей роли первых и самореализации вторых. Самостоятельная работа студентов стимулирует развитие их субъектности, содействует раскрытию творческого потенциала, развитию педагогического мышления, формирует самостоятельность как черту характера, которая имеет существенную роль в структуре личности современного специалиста.

Система высшего педагогического образования решает подготовку педагогов, обладающих необходимыми исследовательскими и проектными компетенциями. Исследовательская работа является как средством интеграции науки и образования, так и творческой подготовки специалистов. Элементы научных исследований могут быть включены в лекционные, семинарские, практические занятия, в выполнение курсовых, выпускных работ, в педагогическую практику студентов. Научно-исследовательская работа содействует активизации познавательных возможностей студентов, формированию творческого подхода к будущей профессиональной деятельности, выработке устойчивого интереса к профессии, формированию у будущих педагогов компетенций, наиболее востребованных в современных условиях.

Участие студентов в студенческих научных обществах, научных кружках, научных семинарах и проблемных группах стимулирует как их научный поиск, так и содействует приобретению опыта самостоятельной исследовательской деятельности. Важной формой вовлечения студентов в научно-исследовательскую работу являются научные конференции, конкурсы, выставки-смотры, олимпиады, формирующие практические навыки исследовательской работы и стимулирующие научное творчество.

Эффективность учебных и научно-исследовательских заданий студентов значительно повышается, если учебная и научно-исследовательская работа сочетается с практикой и результаты деятельности получают общественное признание.

Совершенствованию научного творчества студентов содействует разработка актуальных научных проблем с преподавателями кафедр, участие в межкафедральных студенческих кружках, конференциях, диалогах, круглых столах, обсуждениях учебно-методической литературы и пр.

В профессиональной подготовке учителя особая роль принадлежит педагогической практике, которая призвана углубить и закрепить теоретические знания студентов, формировать и развить педагогические умения и навыки, профессионально значимые качества.

В процессе педагогической практики, как известно, студент адаптируется к условиям труда в учебно-воспитательном учреждении, у него формируются творческое мышление, индивидуальный стиль профессиональной деятельности, профессиональная культура. В ходе педагогической практики студент имеет возможность изучить передовой педагогический опыт, те новые педагогические системы, современные технологии обучения и воспитания; развивать свои исследовательские возможности, овладеть умениями планировать и вести внеучебную воспитательную работу, освоить формы внеурочной воспитательной работы, овладеть методами и приемами изучения возрастных и индивидуальных особенностей школьников; проводить самооценку и корректировку собственной деятельности.

Современная модернизация педагогического образования, формирование у будущих специалистов профессиональных компетенций требует нового подхода к организации и проведению педагогической практики. Нам представляется, что кратковременность педагогической практики на выпускном курсе не дает возможности студентам бакалавриата должным образом принять участие в проведении различных видов педагогической деятельности, а именно: в работе методического объединения, педагогического совета, в проведении внеурочных мероприятий, профориентационной

работы, в организации и проведении взаимодействия школы с семьями обучающихся и другими социальными субъектами в целях духовно-нравственного развития и воспитания учащихся.

Задачи, поставленные перед высшей школой, предусматривают вовлечение студентов в активную учебно-познавательную деятельность в ходе учебного процесса. Активные и интерактивные методы обучения побуждают обучаемых к активной мыслительной и практической деятельности в процессе овладения учебным материалом, развивают их творческие способности, повышают профессиональную мотивацию.

Активизации познавательных способностей студентов содействует применение дискуссионного метода, который может быть использован в любых организационных формах обучения в вузе. Дискуссия направляет деятельность студентов на поиск новых знаний, обеспечивает их активное усвоение, формирует навыки критического суждения, умения публично выступать, содействует развитию логического мышления и сознательному усвоению знаний. Дискуссионный метод усиливает развивающий и воспитательный эффекты обучения, обеспечивает взаимодействие обучающихся, развивает коммуникативные навыки студентов.

Среди активных методов обучения особо следует выделить игровые методы, способствующие соединению теоретических знаний с практической деятельностью. Использование игровых форм учебной деятельности, в частности деловой игры дает возможность воссоздать предметное и социальное содержание профессиональной деятельности. В учебном процессе могут быть применены различные модификации деловых игр: имитационные, ролевые, операционные, деловой театр и пр. Деловая игра, являясь методом активного обучения, содействует развитию профессионально-творческого мышления студентов, эффективному взаимодействию с партнерами, раскрытию личностного потенциала.

Формированию профессиональных компетенций студентов, связи теоретических знаний с практикой содействует проблемное, проектное обучение, метод анализа конкретных ситуаций, метод анализа результатов контроля и самоконтроля и пр.

Активные и интерактивные методы обучения позволяют реализовать развивающий и образовательный потенциал обучающихся, осуществить субъект – субъективный подход в организации учебного взаимодействия, повысить эффективность всего учебного процесса в вузе.

Итак, современное педагогическое образование должно быть направлено на качественное развитие содержания педагогической деятельности в соответствии с социокультурными потребностями общества, на обновление знаниевой структуры и общекультурных компетенций и улучшение практической подготовки специалистов.

**Литература:**

1. Компетентностей подход в педагогическом образовании / Под ред. Проф. В.А.Козырева и проф. И.Ф.Родионовой. СПб, 2004, с.8
2. Смолкин А.М. Методы активного обучения. М., 1991.
3. Леньков С.Л., Рубцова Н.Е. Теория и практика психолого-педагогического сопровождения профессионального становления молодежи // Педагогика 2017, №1.
4. Левина М.М. Технология профессионально-педагогического образования. М., 2001.

**Pedaqoji ali məktəb divarlarında rəqabətə qabil məzunların hazırlığı məsələsinə dair**

**Xülasə**

Məqalədə pedaqoji universitetlərin tələbələrinin tədris fəaliyyətinə hazırlığı məsələləri araşdırılır. Məqalədə tələbələrin tədris, elmi-tədqiqat, sərbəst işlərinin, həmçinin məzunların peşə hazırlığında pedaqoji təcrübənin rolu açıqlanır.

Məqalədə tələbələrin zehni fəaliyyətini gücləndirən, öyrənmə motivasiyasını sürtləndirən, fəal öyrənməni, bacarıqları inkişaf etdirən aktiv və interaktiv tədris metodlarını təqdim edir.

**On the issue of competitiveness of graduates in the pedagogical high school**

**Summary**

The article deals with the preparation of students of pedagogical universities for teaching activities.

Revealed the role of educational, research, independent work of students, teaching practice in the professional training of graduates.

Presents active and interactive teaching methods that intensify students' mental activity, reinforce learning motivation, promote active learning, competencies.

**Рецензент: доц. З.С.Меджидова**

**Seyidova Günay Akif qızı**
Azərbaycan Dillər Universiteti

# XXI ƏSR PEDAQOGİKASININ QARŞISINDA DURAN TƏLƏBLƏR

***Açar sözlər:*** *tədris, ənənəvi tədris, aktiv təlim*
***Key words:*** *education, traditional education, active learning*
***Ключевые слова:*** *обучение, традиционное образование, активное учение*

Hər bir cəmiyyətin fasiləsiz dəyişməsi tarixən mövcud olan proses olub, müasir dövr, sosial-iqtisadi sistemin inkişafı, yüksəliş, tənəzzül və inkişaf qanunauyğunluqları ilə bağlıdır. İnkişaf prosesləri tarixi zamanda baş verən kəmiyyət, keyfiyyət və struktur dəyişiklikləri ilə ifadə olunur. Bu da eyni zamanda innovasiyalı proseslərin tədqiqi zamanı müəyyən obyektiv, sistemli qanunauyğunluqların nəzərə alınmasını gündəmin vacib vəzifəsinə çevirir. Belə ki, innovasiyalar, onların yaranması və istifadəsi də cəmiyyətin ümumi inkişaf qanunauyğunluqlarından biri kimi çıxış edir.

Bugün cəmiyyətimiz köklü islahatlar siyasətinin şahididir. Cəmiyyətimizin bütün sahələrində innovasiyaların genişləndirilməsi və istifadəsinin sürətləndirilməsi məqsəd ilə bütün istiqamətlərdə motivasiya edici mexanizmlərin işlənib-hazırlanmasına başlanılmışdır.

Müasir dövrdə tədris proqramları ilə öyrənmə yalnız passiv bir proses deyil, həm də tələbənin öyrənmə prosesində iştirakı ilə fəal, davamlı və inkişaf prosesi kimi müəyyən edilmişdir. Günümüzün təhsil anlayışı şagirdin məlumat səviyyəsinin qiymətləndirilməsindən çox, məlumatın fərd üçün mənalı və əsaslı hala gətirilməsi vacib hala çevirir. Təhsil fəlsəfəsində yaşanan bu dəyişmə, təhsil sistemlərinin yenidən təşkil edilməsini, əhatəli və davamlı müdaxilələrlə davamlı olaraq yenilənməsini zəruri qılmaqda hətta bu yeniləmə və inkişaf etdirmə işlərinin, təhsilin ayrılmaz bir parçası halına gəlməsinə səbəb olmaqdadır.

Ənənəvi biliklərə dayanan təhsil sistemi gələcəyimizi üçün bir təhdidir, çıxış yolu təhsildə köhnə üsulları buraxmaq və yenilikçi düşüncələrdən istifadə etməkdir. Yenilikçi və yaradıcı düşüncənin fəaliyyətə çevrilməsi tələbələrin təhsil və təlimdə arzularını artıracaq bir zehni transformasiya tələb edir. Bunun üçün təhsildə yeni bir yanaşma kəşf etməli, innovasiyalara diqqət yetirməli və yenilikçi ruhu canlı tutmalıyıq.

Tarix boyunca bəşəriyyət özünü və ətrafını yaxşılaşdırmaq üçün daimi bir araşdırma içindədir. Bu axtarış həmişə yeni fikirlər yaratmaqda maraqlı olmuşdur. Yenilikçi ideyaları olan şəxslər hər mövzuda özlərini inkişaf etdirməyi hədəfləyirlər. Dəyişən şəraitə uyğunlaşmaq üçün, sosial, mədəni və iqtisadi mühitdə yeni üsullardan istifadə etməli və yeni fikirlər irəli sürülməlidir.

Müasir dövrdə pedaqogikanın məqsədi fəal təlim metodlarını dərindən bilən, fəal təlimlə keçirilən dərsin mərhələlərini düzgün təşkil edən, dərslərin müasir tələblər əsasında planlaşdırılmasını tətbiq edən, əlavə təlim resurslarının düzgün seçimini aparan, gələcək peşə fəaliyyətinə dair ətraflı bilik və bacarıqlara malik, təhsil sahəsindəki yenilik, innovasiya və texnologiyaların təlim prosesində səmərəli tətbiqinə istər nəzəri, istərsə də praktik cəhətdən hazır olan, dünya təcrübəsini öyrənən və öz təcrübəsində tətbiq edən, kurikulumun əsas prinsiplərindən olan şəxsiyyətyönümlü təhsili təmin edən peşəkar müəllim hazırlığıdır.

21-ci əsr Pedaqogikasının qarşısında duran tələblər:

1. Yüksək intelektuala malik fərd yetişdirmək

Yüksək Səviyyəli Düşüncə Bacarıqları(YSDB)
Tənqidi təfəkkür
Yaradıcı fəaliyyət
Kreativ düşüncə

2. Layihə əsaslı öyrənmə vasitəsilə öyrətmək

Uyğun texnologiyaların birləşdirilməsi
Əməkdaşlıq
Fənlər arası yanaşma

3. Problemlərin həll

Öyrənmə çərçivəsində problemlər
Real dünyəvi problemlər

4. Tələbə qiymətləndirilməsi

Aydın və şəffaf məqsədlər və obyektivlik
Fərdi və qrup qiymətləndirilməsi

5. Texnalogiyaların təmini

Digital alətlər
Elektron materiallar bazası
İKT ilə təhciz olunmuş təlim mühiti

6. Əməkdaşlığa həvəsləndirmə
Effektiv komunikasiya
Komanda bacarıqları
7. Təkrar baxış
Həmkəra təkrar baxış
Özünə təkrar baxış
8. İnkişaf
İnformasiya
Media
Texnoloji səlistlik

Eyni zamanda müasir dövrdə tərbiyə ediləni həyata hazırlayacaq təhsilin məqsədləri aşağıdakılar olmalıdır:

1. Təhsil, tərbiyə edilən insanın duyğu, düşüncə, ehtiyac və problemlərini müxtəlif yollar vasitələrlə izah etməsi üçün ona ünsiyyət kafiliyi qazandırmalıdır.

2. Təhsil öyrədilənin, demokratik yaşayışın tələb etdiyi, digər insanlarla müsbət əlaqələr qura, ortaq məqsədlər üçün birlikdə işləyə bilməsi üçün ona, əməkdaşlıq kafiliyi qazandırmalıdır.

3. Təhsil, təhsil alanın problemlərini həll etməsi üçün lazım olan məlumatı toplaya, bacarıqları qazana bilməsi, problemlərinə müsbət və konstruktiv mövqeylə müsbət həll yolu tapması üçün ona öyrənmə və araşdırma kafiliyi qazandırmalıdır.

4. Təhsil sağlam yaşamaq kafiliyi qazandırmalıdır

5 Təhsil, tərbiyə edilənin özünə və cəmiyyətə xidmət etməsinin əsas elementi olan bir peşəni seçməsi, peşəni uğurla öyrənməsi, qazandıqlarını mövqeli olaraq tətbiq etməsi,dövlət sərvətini öz peşəsi daxilində qiymətləndirməsi üçün ona istehsal kafiliyi qazandırmalıdır.

İnnovativ öyrənmə mühitində təhsil rəhbərləri insan və maddi resurslarını nəzərə almalı, qərar verərkən qrup səylərini istiqamətləndirmək üçün ümumi rəhbərlik nəzəriyyə prinsip və üsullarından istifadə etməlidir. Təhsil rəhbərliyinin digər bir məqsədi isə, əvvəlcədən planlaşdırılmış hədəflərin, davranışların öyrənənlərə planlı, proqramlı olaraq aşılanmasıdır.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. B., "Təhsil" jurnalı, 2013, N-10
2. Zeynalova.N(2017) Müasir Təhsilin Əsasları, "Elm və təhsil". Baku
3. Boud, D. & Feletti, G. (1991). The Challenge of Problem Based Learning, London: Kogan Page.
4. Couros.G (2015) The Innovator's Mindset: Empower Learning, Unleash Talent, and Lead a Culture of Creativity. Kindle Edition. San Diego.
5. Stevens.G (2018). Positive Mindset Habits for Teachers: 10 Steps to Reduce Stress, Increase Student Engagement and Reignite Your Passion for Teaching. Kindle Edition. USE
6. Rogers, E. M. (1962). Diffusion of innovations. Free Press. New York, NY

**Requirements to the 21st Century Pedagogy**
**Summary**

İn modern times, learning with the programs is not passive processes but, by including learners, identified as sustainable, active and developing process. Learning process today is more about making information more meaningful and substantial to learners rather than evaluating learners' knowledge level. This particular change in the education philosophy causes reorganisation of the education systems, leads to continuous renewal through comprehensive and continuous interventions and making these innovation and development jobs an integral part of the education.

**Требования к педагогике XXI века**
**Резюме**

Современные учебные программы - это не только пассивный процесс, но и активный, устойчивый и развивающийся процесс обучения. Концепция современного образования делает более значимым и существенным сделать информацию более доступной для человека, а не для уровня знаний студента. Это изменение в философии образования приводит к реорганизации систем образования и постоянному обновлению посредством всесторонних и постоянных вмешательств, даже превращая эти рабочие места в области инноваций и развития в неотъемлемую часть образования.

**Rəyçi: dos.N.E.Zeynalova**

**Məlikov Məlik Şıxbala oğlu**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
melikmelikov1960 @mail.ru

# PEDAQOJİ ELMİN QURULUŞ ELEMENTLƏRİ

***Açar sözlər:*** *pedaqogika****,*** *quruluş elementləri, elmi fənlər, pedaqogikanın sahələri, pedaqogika elminin bölmələri, elmi istiqamətlər, elmi sahələr, elm cərəyanlar, pedaqoji cərəyanlar, elmi məktəblər, aksiologiya, prakseologiya*
***Keywords:*** *pedagogy, structural elements, scientific subjects, fields of pedagogy, sections of pedagogy, scientific fields, scientific trends, pedagogical trends, scientific scools, axiology, prakseology*
***Ключевые слова:*** *педагогика, структурные елементы, научные отрасли, педагогические науки, научные направления, научные предметы, научные течения, педагогические течения, научные школы, аксиология, праксеология*

Müasir pedaqogikanın bir elm kimi quruluşu haqqında fikrə sahib olmaq üçün, ilk növbədə, onun tərkib hissəsi olan quruluş elementlərinin mahiyyətini araşdırmaq lazım gəlir. Bundan əlavə, elmin quruluşunun anlaşılması üçün hər şeydən əvvəl, elmi fəaliyyətin həyata keçirildiyi və pedaqoji elmi biliklər sisteminin inkişaf etdiyi quruluş vahidlərin tərkibini və onlar arasındakı qarşılıqlı əlaqənin mahiyyətini anlamaq vacibdir.

Müxtəlif mənbələr və kontekstlərdə pedaqogika elminin aşağıdakı quruluş komponentlərinin adlarına rast gəlmək mümkündür: elmi fənlər; pedaqogikanın sahələri; pedaqogika elminin bölmələri; elmi istiqamətlər; elmi sahələr; elmdə cərəyanlar, pedaqoji cərəyanlar;elmi məktəblər.

Sadaladığımız bu anlayışları bir araya gətirərkən, onların istifadəsində bəzi qarışıqlıqları və onların semantik tərkibinin açıq-aşkar qeyri-müəyyənliyi ortaya çıxır. Bir elmi sahəyə həm pedaqogikanın sahəsi kimi, həm elmi fənn, həm pedaqogikanın bir bölməsi kimi, həm də elmi istiqamət kimi istinad edilə bilər. Belə bir qarışıqlıq pedaqogikanın faktiki quruluşu və onun inkişaf tendensiyaları haqqında aydın fikrə malik olmağa imkan vermir.

Bu baxımdan bir sıra suallar yaranır: bütün bu elementləri pedaqogikanın quruluşunda birləşdirmək qanunidirmi? Ümumiyyətlə, bunlar nədir? Onların bir-birindən hansı fərqləri var? Hə kimi əlamətlərə və xüsusiyyətlərə malikdirlər? Bir-biri ilə necə əlaqədədirlər?

Bütün bu suallara cavabın tapılması pedaqogika elminin real qurulşunun bütöv obrazı haqqında təsəvvür yaratmağa imkan verən mövqeni doğruluyacaqdır.

Yəqin ki, başlanğıcda, elmin quruluş elementlərini ifadə etmək üçün istifadə olunan anlayışları aydınlaşdırmaq lazımdır. Siyahıda göstərilən anlayışlar arasında, onların semantik məzmununun tam dəqiqlik dərəcəsi baxımından, dəqiq tərifə malik olanları və daha dəqiq müəyyən edilməmişləri ayırmaq mümkündür. Beləliklə, "elmi sahələr" və "elm bölmələr" anlayışları ən az dəqiq olanlar kimi səciyyələndirilə bilər. Prinsipcə, onlar hər hansı quruluş elementinə daha ümumi anlamda tətbiq olunur, çünkü onlar vasitəsi ilə digərləri müəyyən edilə bilər. Məsələn, "elmi sahə" anlayışı sayəsində elmi sahələrin müəyyən növləri və tipləri təsbit edilər.

Bundan əlavə, seçilmiş anlayışlar məzmun və həcminə görə fərqlənir və buna görə də irearxik şəkildə əlaqələndirilə bilər (subordinativ və koordinasiya olunmuş).

**Elmi fənlər.** Elmşünüslıq mənbələrində daha geniş şəkildə "elmi fənn" anlayışı gözdən keçirilir və vahid elmlər sistemində konkret elmi göstərmək üçün istifadə olunur.Bu və ya digər elmi sahənin fənn kimi tanınması müəyyən əlamətlər əsasında həyata keçirilir. Elmi fənnin ən ümumi xüsusiyyətləri (E.Mirskiyə görə): fənn biliklərinin vəhdəti və onlarla hərəkət etmək yolları; tədqiqatçıların xüsusi hazırlığının ümumi məzmunu və onların müəyyənləşdirilməsi formaları; fənnin fəaliyyətini nizamlayan ünsiyyət vasitələrinin və institutlarının münasib dəstinin yığımı.

Elmi fənlərin əlamətlərini xarakterizə edən daha geniş siyahı təqdim etmək olar: müəyyən həcmdə biliklərin olması; fənnin öyrənilməsinin "qanuni" obyektləri hesab olunan xüsusi kateqoriya, empirik sahə və ya hadisələrin olması;müəyyən analitik və emprik tədqiqat vasitələrinin mövcudluğu(müəyyən öyrənilmə metodikasının və təsvir dilinin olması); tədqiq olunan sahə reallıq səviyyəsinə uyğun bir sıra yanaşmalarin, nəzəriyyə və fərziyyələr olması; bu fənnə dair adi tədqiqat fəaliyyəti üçün qarşılıqlı fəaliyyətin tipik sxeminin müvcudluğu (nəzəri, empirik, eksperiment, müşahidə və s. arasında uyğunluq); bir fənnə dair tədqiqat fəaliyyətinin müvəffəvəqiyyət və uğursuzluqların vahid tarixi və fənnin inkişaf perspektivləri haqqında təsəvvürlərin olması; həmkarları arasında müəyyən ünsiyyət vasitələri və

kommunikasiya kanallarının olması;alimlərin peşə mənsubiyyətinin təsdiqi və xüsusi hazırlıq sahəsi;bir sıra peşəkar institutların, birliklərin, jurnalların və s. olması.

Verilən əlamətləri əldə rəhbər tutaraq deyə bilərik ki, "elmi fənn" anlayışını (elmlər vahid sistemində elmi fənlər biri kimi) yalnız pedaqogika ilə əlaqələndirmək olmaz, həm də pedaqogika elmi daxilində ümumi elmi sahələrə də şamil etmək olar. Məsələn pedaqogikanın strukturuna daxil olan "xüsusi didaktika", "fənlərin tədrisi metodikası" (fizika, kimya, tarix və s. tədrisi metodikası).

Beləliklə, "fənn"terminindən pedaqogikada iki anlamda istifadə olunur.Birinci halda,pedaqogika elmini adlandırmaq üçün, ikincisi halda isə, pedaqogikanın müvafiq əlamətləri olan xüsusi daxili elmi sahələrini adlandırmaq üçün.

Bütöv bir elmi fənn kimi pedaqogikanın, eləcə də digər elmlərin, struktur formalarının fərqləndirilməsinin və xüsusiləşdirilməsinin əsasını onun obyektinin, mövzusunun və yaxud obyektiv reallığın öyrənilməsinə yanaşmanın (metodlar, üsullar, prinsiplər, tədqiqat proqramı və s.) və ya alınan məhsulun (elmi biliklərin səviyyəsi və məqsədi) özünəməxsus xüsusiyyətləri təşkil edir.

Beləliklə, ilk növbədə, pedaqoji tədqiqatın obyektinin xüsusiyyətlərinin tanınması əsasında pedaqogikanın nisbətən böyük quruluş vahidlərinin - onun elmi sahələrinin, xüsusiləşdirilməsi - qanunidir. Başqa sözlə, pedaqoji elm sahəsi o vaxt yarana və inkişaf edə bilər ki, bu zaman obyektiv reallıq pedaqoji fəaliyyətin xüsusiyyətlərindən açıq şəkildə fərqlənsin və araşdırılması üçün xüsusi tədqiqat yanaşmaları, öyrənilmə metodları və biliklərin ümumiləşdirilməsi formaları tələb etsin.

**Elmi sahənin** aşağıdakı xüsusiyyətlərini qeyd etmək mümkündür:pedaqoji təcrübənin xüsusi növü kimi çıxış edən peallığın xüsusi bir obyektin olması; elmi tədqiqat sahəsinin nisbətən konkret sərhədinin olması; quruluş elmi cəmiyyət birliklərinin tədqiqatçıların və alimlərin (kafedralar, laboratoriyalar, institutlar, assosiasiyalar və s.) sistematik fəaliyyəti; sahədaxili quruluşun inkişafı (elmi bilikin və elmi-tədqiqat fəaliyyətinin inteqrasiyası və differensasiyası hesabına);kifayət edəcək qədər xüsusi kateqoriyalar aparatının mövcudluğu;peşəkar praktiklərin (peşə təhsili və ixtisas artırılmasın sistemində)hazırlanması üçün institutların fəaliyyət göstərməsi; "sektoral" dövri nəşrlərin və təlim ədəbiyyatının mövcudluğu.

Müasir dövrdə pedaqogika elminin sahələri kimi qəbul olunur: məktəbəqədər pedaqogika, məktəb pedaqogikası, ali təhsilpedaqogikası, xüsusi (korreksiyaedici) pedaqogika, sosial pedaqogika, hərbi pedaqogika və s. Hər bir sahə də, əlbəttə,bir elmin sahəsi olmasına baxmayaraq, digərlərindən asılı olmadan, sərbəst şəkildə mövcud ola və inkişaf edə, öz növbəsində fənlərə bə bölmələrə də ayrıla bilər.

Pedaqogika elminin inkişaf etmiş sahəsi faktiki olaraq bütövlükdə elmin quruluşunu ifadə edir və onun daxilində elmi strukturların bütün növləri və formaları – ümumi sahələr,elmi fənlər,elmi istiqamətlər, pedaqoji cərəyanlar,elmi-emprik və elmlərarası inteqrativ sahələr və eləcə də elmi məktəblə ola və inkişaf edə bilər.

Məlum olduğu kimi, hər hansı bir elmin, o cümlədən pedaqogikanın quruluşunun formalaşmasında, elmi biliklərin və elmi-tədqiqat fəaliyyətinin differensasiyası və inteqrasiyası prosesləri mühüm rol oynayır. Bu proseslər nəticəsində elmi biliklərin tərkibi, mövcud və inkişaf edən elmi sahələr, elmi-empirik sahələr zənginləşir, yeni elmi sahələr, istiqamətlər və cərəyanlar yaranır. Elmdə nə cərayan adlandırıla bilər?

**"Cərəyan"** anlayışı dinamik xarakter daşıyır və hər hansı bir elmi istiqamətlərdə bəzi dəyişikliklərlə bağlıdır. Bu belə bir anlama gəlməyə imkan verir ki, elmi cərəyan elmdə fikirlərin, istiqamətlərin inkişafında müəyyən bir fikirin təsdiqi əsas, fundamental kimi təsdiqi üçün elmi dəyişiklik baş verir. Bu, əslində, elmi bilik sisteminin bütöv bir konseptual obrazına müvafiq olaraq irəli sürülən ideyanı formalaşdırmaq və inkişaf etdirmə prosesidir. Buna görə də cərəyanları adlandırarkən çox halda bütöv elmin adından- "pedaqogika" (əməkdaşlıq pedaqogikası, zorakılıq pedaqogikası, Waldorf pedaqogikası və s.) hətta metafora şəklində də belə istifadə olunur.

Elmi anlayışlar haqqında ümumi fikirlər əsasında "pedaqoji cərayanlara" aşağıdakı tərifi vermək mümkündür. Pedaqoji cərayan – nəzəriyyə və təcrübədə inkişaf etdirilən orijinal əsas ideya və ya prinsip əsasında qurulmuş, tamamlanmış bir pedaqoji konsepsiyadır. Pedaqoji cərayan, eləcə də, elmin digər quruluş elementləri müəyyən əlamətlərə malik olmalıdır. Bu əlamətlər elm fəliyyətdə və elmi biliklər sistemində baş verən bu və ya digər dəyişikliklər cərayan kimi səciyyələndirilə bilər. Cərayanın belə əlamətlər sırasına aşağıdakıları daxil etmək olar:

1. Göründüyü kimi, cərayanın baş əlaməti kimi pedaqogikanın digər konseptual obrazını yaradan, cərayanın adında da qeyd olunan, aparıcı, açar ideya çıxış edir. Məsələn: Əməkdaşlıq pedaqogikası, Xristian pedaqogikası, Müvəffəqiyyət pedaqogikası, Sosial yaradıcılıq pedaqogikası, Qeyri-zorqkılıq pedaqogikası, Ümumi qayğı pedagogikası və s. Adında əsas elmi biliklərin düzülüşü fikrinin göstərilməsi pedaqoji cərayanı pedaqogikanın adında "pedaqogika" anlayışını daşıyan, lakin elmin obyektini göstərən sahələrindən (məktəbəqədər pedaqogika,korreksion pedaqogika və s.) ayırmağa kömək edir.

2. İstənilən cərayanın həm elmin özündə, həm də təcrübədə tərəfdarları rəqibləri və neytralları mövcuddur. Yəqin ki, tərəfdarların və rəqiblərinin olması cərayanın hər hansı müəllifi tərəfindən analoji formada adlandırılan nəzəri konsepsiyadan (məsələn: O.Q.Prikotun "Eyniləşdirmə pedaqogikası") fərqli yaranması və mövcudluğu əlamətidir. Çox vaxt pedaqogika elmində pedaqoji cərayanın yaranması və inkişafı praktikada pedaqoji hərakatın yaranması və inkişafı ilə bağlı olur.

**Pedaqoji hərakat** (ictimai-pedaqoji hərakat) praktik pedaqoqların və alimlərin, bir məqsəd ətrafında yaranan birliklərin, cəmiyyətlərinin öz professional mövqeyini bildirmək üçün fəaliyyətlərinin məcmusu kimi başa düşmək olar. Nümunə kimi (80-cı illərdə) əməkdaşlıq öedaqogikası (90-ci) və qeyri-zorakılıq pedaqogikası hərakatlarını göstərmək olar.

3. Elmi cərayanın daha bir əlaməti kimi onda biliklərin müxtəlif səviyyələrdə inkişaf etməsini göstərmək olar: nəzəri konsepsiyaların və praktik metodikanın yaradılması qanuniliyinin əsaslandırılması səviyyəsində, yəni, metodologiya səviyyəsində;tarixi səviyyədə-elmi biliklərin inkişafı prosesi və müxtəlif sosial şəraitdə onların həyata keçirilməsi xüsusiyyətləri haqqında məlumatların alınması; nəzəriyyə səviyyəsində-yəni pedaqoji hadisələrin izahı üçün biliklərin alınması; metodika səviyyəsində-effektiv praktiki tədbirlərin instrumental-tətbiqi vasitələrin toplusu (cəmi) kimi; təcrübə səviyyəsində (empirizm) - pedaqoji fəaliyyətin empirik təsviri kimi.

4. Pedaqoji cərayanın xüsusi spesifik xüsusiyyəti kimi onda yaranmış, özünəməxsusluğu ilə seçilən tərəflərin həyata keçirdiyi pedaqoji ünsiyyət dilinin (professional və elmi) olmasını, yəni kateqorial aparatının olmasını və inkişafını göstərmək olar.

Müəyyən pedaqoji cərəyanın anlayışlar aparatı üçün, bir qayda olaraq, yalnız konkret terminlərin olması xarakterik deyil, eyni zamanda ümumi olaraq tanınan terminlərin xüsusi şərhidir. Məsələn: " müəllim və şagirdlərin ümumi yaradıcı qayğısı "obyektiv və subyektiv tərbiyə münasibətlər" (ümumi qayğı pedaqogikası), "özəl və şəxsi nailiyyət", "sistem-orientasion sahə" (müvəffəqiyyət pedaqogikası), və s.

Pedaqoji cərəyanlar alternativ və ya paralel ola bilər (qeyri-alternativ). Əgər əsas fikir (və ya prinsip) elmin müəyyən inkişaf mərhələsində aktual və qəbul olunmuş əsas pedaqoji ideyaya ziddirsə, belə bir cərayan alternativ hesab edilə bilər. Alternativlik özü-özündə elmi cərayanın bir əlaməti deyildir, çünkü onun nisbi olduğu bilinir. Bəzi pedaqoji cərayanlar alternativ kimi yaranıb inkişaf etsə də, müəyyən zaman axarında bu alternaivliyi itirmiş, yəni öz tərəfdarlarının və müvafiq pedaqoji hərakatın deyil, həm də "rəsmi" elm tərəfindən tanınmışlar.

Elmi cərayanların yaranması və inkişafı bir fakt kimi deyil, həm də elmi biliklərin, bütövlükdə elmin inkişafının özünəməxsus bir faktor kimi qəbul edilən psixologiyadan fərqli olaraq, pedaqogikada "cərayan" anlayışının özünə və reallıqda mövcud olan pedaqoji cərayanlara münasibət müxtəlifdir.

Elmlərin quruluşunda elmi cərəyanlar, əgər belə ifadə etmək olarsa, sahələrarası mövqe tutur. Onların meydana gəlməsi pedaqogikanın hansısa bir konkret sahəsi ilə əlaqəli olmasına baxmayaraq, gələcəkdə cərayanın kontseptual ideyaları digər sahələrdə də inkişaf etməyə başlaya bilər. Məsələn, əməkdaşlıq pedaqogikası, məktəb pedaqogikası daxilində formalassa da sonradan öz təcəssümünü və inkişafını məktəbəqədər və sosial pedaqogikada tapdı. Lakin, hər bir sahədə tədqiqat obyektinin xüsusiyyətlərinə uyğun olaraq elmi biliklərin (ideyaların, prinsiplərin, yanaşmaların, metodların və s.) dəqiqləşdirilməsi gedir. **Pedaqogikada elmi istiqamət** adlanan belə quruluş bölmələri öz spesifikliyini mərkəzi, açar anlayışın fərqləndirilməsi ilə ortaya çıxır. Onun vasitəsi ilə reallığın əsas hadisələri izah edilir.

Elmi istiqamət bəzi anlayışlarla bağlı ideyaları təsdiq etmək üçün ortaya çıxır, müxtəlif hadisələri nəzərdən keçirməyi təklif edir və ya müxtəlif kontekstlərdə bu fikrə müvafiq aspekti ayırır. Məsələn: pedaqoji hadisələrin dəyər aspektlərini nəzərdən keçirmək və nəzərə almaq fikri pedaqoji aksiologiyanı elmi istiqamət kimi bizə tanıtdı.

Əslində, xüsusi elmi istiqamətin seçilməsi üçün əsas alimlərin öyrənilməsinə gücünün istiqamətləndiyi tədqiqatın predmet sahəsinin dəqiq sərhədlərinin çəkilməsi, pedaqoji elmin mövzusunda konkret, nisbətən dar aspektin müəyyənləşdirilməsidir. Belə bir aspekt, ətrafında bilik sisteminin qurulduğu mərkəzi anlayış kimi təyin oluna bilər. Məsələn: "innovasiya", "innovasiya fəaliyyəti" anlayışı "pedaqoji innovasiyalar" (S.D.Polyakov, N.R.Yusufbekova et al.) son zamanlar elmi istiqamət kimi; "layihələndirilmə", "layihə" anlayışları pedaqoji layihələndirməni istiqamətlərdən biri kimi inkişaf etdirməyə imkan verir (VA Radionov, ES Zair-Bek); "keyfiyyət" anlayışı (təhsilin keyfiyyəti, fəaliyyət keyfiyyəti) və onun qiymətləndirilməsi yeni pedaqoji istiqamətin əsasını qoyur: "pedaqoji kvalimetriya" (A.I.Subetto); "fəaliyyətin nəticəsi və səmərəliliyi" pedaqoji prokseologiya üçün əsasa çevrilir. (Y.V.Titova); və s.

Hər hansı elmi quruluş elementi kimi elmi istiqamət öz statusunu deklarativ elanlarla deyil, aktuallığı elm və praktika tərəfindən tanınmış müəyyən elmi informasiya kütləsinin toplanması ilə əldə edir. Eyni zamanda, elmi istiqamətin yaranması inkişafı üçün onun necə adlandırılması az əhəmiyyət kəsb etmir.

Bir qayda olaraq, yeni tədqiqat istiqamətlərin yaranmasının səbəbi digər elmi fənlərin-fəlsəfə, metodologiya, sosiologiya, etika və s. yanaşma və kateqoriyalarının pedaqogikaya gətirilməsinin (transferin) nəticəsidir. Elmi bilikləri pedaqogika çərçivəsində öz oxu ətrafında inkişaf etdirən kateqorial ideya "pedaqoji" sözünün artırılması ilə əmələ gəlir Burada "pedaqoji" sözü tədqiqatın spesifik predmetinin pedaqogikanın obyektiv sahəsi və əldə edilən biliklərin inteqrativ xarakter daşıması ilə bağlıdır. Müasir dövrdə pedaqogikanın tərkibində özünü təsdiq etmiş elmi istiqamətlərin sırasına aşağıdakıları aid etmək olar: pedaqoji akiologiya, pedaqoji lahiyələndirmə, pedaqoji innovasiya və s.

Mövcud elmi istiqamətlər inkişaf səviyyəsinə görə fərqlənirlər. Daha inkişaf etmiş, daha aydın və inkişaf etməkdə olan, az inkişaf etmiş, yeni yaranan, yaranması gözlənilən elmi istiqamətlər haqqında danışmaq olar. Sonuncuların sırasına, məsələn, aparıcı kateqoriyaları "fəaliyyətin səmərəliliyi və nəticəliliyi", "fəaliyyətin optimal həyata keçirilməsi vasitəsi" olan "pedaqoji prakseologiya", aid etmək olar.

Aydındır ki, müəyyən bir elmi istiqamətin inkişaf əlamətlərindən biri kimi konkret tədqiqatın aparıcı kateqoriyalarına müraciətin tezliyi hesab edilə bilər. Deyək ki, nə qədər tez-tez və müxtəlif aspektlərdə tədqiqatçılar pedaqoji fəaliyyətin səmərəliliyi probleminə müraciət edərsə pedaqoji prakseologiya pedaqogikanın bir elmi istiqaməti kimi daha geniş və daha intensiv inkişaf edəcək.

Elmi istiqamətlər pedaqogikanın quruluş elementləri kimi öz inkişaf prosesində zamanla az və çox inkişaf etmiş özünün dəqiq cizilmiş predmeti və qurulmuş metodoloji əsası olan elmi sahəyə çevrilə bilər. Onların gələcək inkişafı pedaqogikanın və yaxud onun sahələri daxilində konkret elmi fənnin yaranmasına səbəb də ola bilər. Bir çox istiqamətin inkişafı elmi məktəblərin fəaliyyəti ilə bağlıdır.

Hamıya məlumdur ki, elm həmişə fərdlər və onların qrupları vasitəsi ilə fərdiləşmişdir. Elmi cəmiyyətin ən səmərəli növlərindən biri elmi **məktəb**lərdir. "Elmi **məktəb"** anlayışı pedaqogikaya yaxın zamanlarda daxil olmuşdur. Belə hallarda, adətən, təyinatına görə işlədilmir və qəbul etmək gərəkdir ki, çox vaxt pedaqogika elminin struktur elementinə deyil, sadə metaforaya çevrilir.

M.Q.Yaroşevski elmi məktəb anlayışının mahiyyətini açıqlayarkən diqqəti tarixçilərin ümumi qəbul etdiyi fikrə yönəldir. O qeyd edir ki elmi məktəb birincisi, yaradıcılığa öyrənmənin və tədqiqat prosesinin vəhdətidir, ikincisi,bir qrupun digərlərindən fərqlənən mövqeyidir. [4] V.B.Qasilov qeyd edir ki, "Elmi məktəb–tədqiqatçılıq fəaliyyəti lider rəhbərliyi altında kordinasiya olunan müxtəlif statuslu, müxtəlif səriştəyə sahib və müxtəlif ixtisaslı alimlərin ittifaqı (cəmiyyət) olub tədqiqat proqramının reallaşmasına, inkişafına və proqramın məqsəd və nəticələrinin fəal şəkildə təqdim edilməsinə və müdafiəsinə xidmət edir.

Proqramın ilkin məzmunu və strukturu lider tərəfindən müəyyənləşdirilir. Bu ittifaq qarşılıqlı əlaqəli tərəfdarlar və opponentlər tərəfindən bir bütöv kimi qəbul edilən vəyaxud inkar edilən publikasiyalar toplusu şəklində fəaliyyət göstərir. [5]

Bu tərifdə elmi məktəbin elmin quruluş elementləri kimi əsas əlamətləri çox yaxşı görünür: müafiq keyfiyyətlərə sahib lider-alim; alimlərin kordinasiya olunan ittifaqı; vahid (ümumi) tədqiqat proqramının olması; bir vahid kimi qəbul edilən publikasiyaların qarşılıqlı əlaqəli toplusu.

Beləliklə, elmi məktəbin yaranması üçün nisbətən uzunmüddətli tədqiqat proqramını yarada bilən, müxtəlif statuslu alimlərin (şagirdlərin, tərəfdaşların və davamçıların) tədqiqat işini kordinasiya etmək bacarığı olan lider-alimin əhəmiyyətli (dəyərli) elmi ideyasının və müvafiq keyfiyyətlərinin ortaya çıxması vacibdir.

Elmin quruluşunda elmi məktəb elmi istiqamət kimi mövcud ola və inkişaf edə bilər. Bu çərçivədə, elmi məktəb bəzən müəyyən əlamətlərə, xüsusiyyətlərə, prinsiplərə malik elmdə istiqamət kimi qəbul olunur [6] Ancaq pedaqogikada elmi məktəblər daha tez-tez nəzəriyyələr və ya konsepsiyalar şəklində təyin edilir. Məsələn: L.İ.Novikovanın elmi məktəbi - "uşaq kollektivinin pedaqogikası" və "tərbiyə sistemlərinin nəzəriyyəsi və təcrübəsi"; G.I. Şukinanın elmi məktəbi-şagirdlərin idraki fəallığının inkişafı nəzəriyyəsi və s

Elmi məktəblərin təsnifatı aşağıdakı kimi həyata keçirilir: elmi məktəb üzvləri arasında əlaqələrin növünə görə - elmi cərəyan, elmi qrup; elmi ideyaların statusuna görə - eksperimental, nəzəri; tədqiq olunan sahənin genişliyi üzrə - dar profilli, geniş profilli; hazırlanmış məlumatın funksional məqsədi - fundamental, tətbiqi; şagirdlərin fəaliyyətinin təşkili şəklin görə - fərdi və kollektiv tədqiqat işlərinin təşkili formaları; nəsillər arasındakı əlaqələrin təbiəti - bir səviyyəli, çox səviyyəli; institusionalizasiya dərəcəsinə görə - qeyri-rəsmi, dərnək, institusional; yerləşmə səviyyəsinə görə - milli, yerli, şəxsi. [6, s. 42-43];

Pedaqogika elminin göstərilən quruluş elementləri ilə yanaşı onda yaranan və inkişaf edən müxtəlif növ elmi sahələri də qeyd etmək olar: inteqrativ-aktiv şəkildə digər elmi fənlərin və sahələrin (pedaqoji valeologiya,"məktəb idarəçiliyi nəzəriyyəsi", "muzey pedaqoikası") nailiyyətlərinə və tədqiqat aparatına əsaslanan və pedaqogikanın strukturunda öz elmi statusunu qazanmış sahə; elm sahələri və elmi fənlər daxilində olan elmi-empirik və yaxud instrumental-tətbiqi sahələr.məsələn, "tərbiyə metodikası", "pedaqoji texnologiya" və s. bunlar elmi praktika ilə bağlanmasını təmin etmək üçün vacibdir. Fənlərarası sahələr-pedaqogika və digər elmlərin (fəlsəfə, sosiologiya, psixologiya, tibb və s.) "sərhədində" yaranan müxtəlif elmlərin strukturuna daxil olurlar

Elmi sahələrin hər bir növü öz qanunları əsasında mövcud ola və inkişaf edir. Pedaqogika elmində elmi sahələrin yaranması və xüsusiləşməsinin özünəməxsus "bəhanəsi" ya mümkün pedaqoji tədqiqatların spesifik obyektinin olması (məsələn, mədəniyyət mərkəzlərinin pedaqoji fəaliyyəti-muzey pedaqogikası, teatr pedaqogikası), ya da mövcud olan pedaqoji gerçəklokdə yeni öyrəniləcək predmetin və yaxud aspektin olması (neyropedqogika, psixopedaqogika, pedaqoji valeologiya və s.). Elmi sahələr öz inkişafında yavaş-yavaş xüsusiləşərək, muxtariyyət qazanaraq pedaqogikanın sahələrinə (əgər obyektə görə xüsusiləşərsə) və yaxud elmi fənlərə (əyər xüsusiləşmiş predmeti olarsa) çevrilə bilərlər.

**Ədəbiyyat:**

1. Мирский Э.М. Междисциплинарные исследования и дисциплинарная организация науки. - М.: Наука, 1980. - С.56.
2. Davies W.E. (USA). Цит. по кн.: Мирский Э.М. Междисциплинарные исследования и дисциплинарная организация науки. - М.: Наука, 1980. - С.57.
3. Слободчиков В.И., Исаев Е.И.Основы психологической антропологии. Психология человека: Введение в психологию субъективности. Учебное пособие для вузов. – М.: Школа-Пресс, 1995. – С.49.
4. Ярошевский М.Г. Логика развития науки и научная школа.,Школы в науке. - М.: Наука, 1977. - С. 86
5. Гасилов В.Б. Научная школа - феномен и исследовательская программа науковедения., Школы в науке. - М.: Наука, 1977. - С.127.

**Structural elements of educational science**

**Summary**

The article addresses the problems of the structural elements of educational science. The author wants to find out the peculiarities of concepts, such as scientific discipline, branches of pedagogy, sections of pedagogical science, scientific directions, scientific branches, trends in science (pedagogical trends), scientific schools

**Структурные элементы педагогической науки**

**Резюме**

В статье затрагиваются проблемы структурных элементов педагогической науки. Автор хочет выяснить особенности понятий, как научная дисциплина, отрасли педагогики, разделы педагогической науки, научные направления, научные отрасли, течение в науке (педагогические течения), научные школы

**Rəyçi: dos.T.Ağayeva**

**Fətəliyeva Lalə Əmrah qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
lalefataliyeva97@gmail.com

# YAZILI NİTQİN POZULMA NÖVLƏRİ
## (tezislər)

***Açar sözlər:*** *yazılı nitqin pozulması, disqrafiya, disleksiya*
***Key words:*** *writing disorders, dysgraphia, dyslexia*
***Ключевые слова:*** *нарушения письменной речи, дисграфия, дислексия*

Yazılı nitqdə pozulmalar hal-hazırda təhsil prosesində en çox rast gəlinən problemlərdən biridir. Spesifik yazı pozulmalarına təsir edən amillər kimi prenatal, natal və postnatal dövrlərdəki fərqli ekzogen amillər göstərilir. Lakin bir sıra müəlliflər, xüsusən Kornev yazır ki, yazıda xüsusi pozulmaların baş verməsinə, bir qayda olaraq etioloji faktorlar kompleksi səbəb olur. Yazılı nitq pozulmalarına disleksiya və disqrafiya aid edilir.

Disleksiya oxu prosesinin qismən pozulması deməkdir. Hərflərin tanınmaması, hecalarda və hecaların sözlərdə birləşməsi ilə bağlı çətinliklər oxunun ləngiməsinə, sözün səs formasının səhv əks olunmasına, hətta ən sadə mətnin səhv başa düşülməsinə səbəb olur. Bir çox tədqiqatçılar oxu pozulmalarında irsi faktoru əsas götürürlər (M.Lami, M.Sule, B.Halgren). Reynxoldun fikrinə görə disleksiya çox vaxt valideynlərdən irsi olaraq uşaqlara keçır. Bir sira alimlər isə ətrafdakıların düzgün olmayan nitqi, ikidillilik, böyüklərin uşağın nitqinə laqeyd münasibəti, ünsiyyət azlığı kimi səbəblər qeyd edirlər.

Disleksiyanın təsnif edilməsində rus loqopedi M.E.Xvatsevin müəyyən rolu vardır. O disleksiyanının fonematik, semantik, aqrammatik və mnestik formalarını qeyd etmişdir. R.İ.Lalayeva isə disleksiyanı fonematik, semantik, aqrammatik, mnestik, optik və taktik növlərinə ayırmışdır:

- Semantik- texniki cəhətdən düzgün oxunulan sözlərin, cümlələrin, mətlərin mənasının anlaşılmasının pozulmasında özünü göstərir.
- Fonematik- dilin fonemlər sisteminin funkdiyasının pozulmasına əsaslanır.
- Optik- qrafik cəhətdən oxşar olan hərflərin mənimsənilməsində çətinlik özünü göstərir.
- Mnestik- səslə hərf arasında əlaqənin yaradılması prosesinin pozulması və nitq yaddaşının çatışmazlığı ilə şərtlənir.
- Aqrammatik- sözün qrammatik quruluşunun tam inkişaf etməməsidir. Müxtəlif patogenezli nitq qüsurları olan uşaqlarda daha çox rast gəlinir.
- Taktil - görmə qüsurlu uşaqlarda müşahidə olunur. Brayl əlifbasının taktil qavranılması zamanı hərflərin fərqləndirilməsində çətinlik müşahidə olunur.

Disqrafiya isə yazı prosesinin qismən spesifik pozulmasıdır. Disqrafiya normada yazı proseslərini həyata keçirən ali psixi funksiyaların inkişafsızlığı nəticəsində meydana çıxır. Disqrafiyanln növləri çoxdur. Bir çox prinsiplərə görə analizatorların pozulması, psixi funksiyaların inkişafdan qalması, yazı əməliyyatlarının formalaşması və s. əməliyyatlara görə təsnif edilir. Disqrafiyanın R.İ.Lalayeva tərəfindən verilən müasir təsnifatı belədir:

- Akustik disqrafiya- müvafiq hərflərin oxşar fonematik əlamətləri əsasında hərflərin dəyişdirilməsində özünü göstərir.
- Artikulyator- akustik-uşağın şifahi nitqdə olan qüsurlarının yazıda əks olunmasıdır. Burada hecaların əvəz olunması, hərflərin buraxılması qeyd olunur.
- Optik- görmə qnozisi, təhlil və tərkibi, məkani təsəvvürlərin inkişafsızlığı ilə bağlı olur və yazıda hərflərin təhrifində və əvəzlənməsində özünü göstərir.
- Aqramatik pozuntu- yazıda aqramatizm də əks olunur. Ön və son şəkilçilərin sözdə düzgün yazılmaması müşahidə olunur.

Uşaqlarda oxu və yazı qüsurlarının vaxtında aşkar edilməsi, onların şifahi və yazılı nitqinin düzgün formalaşması prosesində mühüm rol oynayır. Qeyd etmək lazımdır ki, bu qüsurların aşkar edilməsinin əsas məqsədi oxu və yazı pozğunluqlarının mexanizmini, etiologiya və əlamətlərini vaxtında, ibtidai sinifdə üzə çıxarmaq və onları aradan qaldırmaq üçün düzgün korreksiya-loqopedik işi təşkil etməkdir.

Beləliklə, həm disleksiyanın, həm də disqrafiyanın təsnifatları müxtəlif mövqelərdən aparılsa da onların hər birinin özünəməxsus elmi əsasları vardır.

**Ədəbiyyat:**

1. Hüseynova N, Ağayeva T. Loqopediya. Bakı, ADPU, 2018
2. M.E. Хватцет. Логопедия. 2007
3. Беккер К.П. Совак М. Логопедия М, 2001
4. Мазанова Е.В. Коррекция аграммамицеской дисграфии М, 2006

**Rəyçi: dos. S.Aslanova**

**Vəliyeva Səkinə Həbib qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
Sv2015@icloud.com

# NİTQİN ONTEGENETİK İNKİŞAFINDA RABİTƏLİ NİTQİN ROLU
## (tezislər)

***Açar sözlər:*** *nitq, ontogenez, rabitəli nitq, dialoji nitq, monoloji nitq, nitqin inkişafı, sosial mühit, sosial funksiya, həyatın ilk ili*
***Key words:*** *speech, ontogenesis, communication speech, diologic speech, monologue speech, speech development, social environment, social function, the first year of life*
***Ключевые слова:*** *речь, онтогенез, коммуникативная речь, диалогическая речь, монологическая речь, развитие речи, социальная среда, социальная функция, первый год жизни*

Əgər biz "Ontogenez" anlayışını daha dar çərçivədə gözdən keçirəriksə görərik ki, ondan ilk səsin yaranmasından başlamış geniş kontekstli nitqin yaranmasına qədər olan dövrü göstərmək üçün istifadə olunur.

Nitqin "Ontogenez" inkişafı dedikdə insanın nitqinin formalaşdığı bütün dövr, onun nitqinin ilk inkişaf anından etibarən mükəmmələşmə səviyyəsinə qədər, yəni ana dilinin tam şəkildə ünsiyyət və təfəkkür vasitəsinə çevrildiyi dövr nəzərdə tutulur.

Nitq inkişafının qanunauyğunluqları haqqında biliklər imkan verir ki, bu prosesdə yayınmaları vaxtında və düzgün şəkildə qiymətləndirə bilək, nitq patologiyalarının aşılması üçün korreksion-tərbiyə işini elmi şəkildə qura bilək.

Tədqiqatçılar uşağın nitqinin inkişafını müxtəlif sayda mərhəllərə bölmüş və müxtəlif cür də adlandırmışlar. A.N.Leontyev nitqin yaranmasının dörd mərhələsini müəyyələşdirir:

1-ci hazırlıq - bir yaşa qədər;
2-ci məktəbəqədərdən əvvəlki dövr – dilin mənimsənilməsinin başlanğıc dövrü;
3-cü məktəbəqədər dövr altı yaşa qədər;
4-cü məktəb dövrü

D.B. Elkoninə (1958) görə uşağın nitq inkişafına kömək edir:

1. Uşaq yeni hadisələrin, obyektlərin və hərəkətlərin əlamətlərinə cavab verəndə lüğət zənginləşir.
2. Böyüklərin nitqi və uşaqlarla olan ünsiyyəti.
3. Uşağın böyüdüyü sosial mühit.

D.B.Elkonin uşaqların əqli inkişafını 3 dövrə ayırmışdır:

1. Erkən uşaqlıq dövrü (0-3 yaş)
2. Uşaqlıq dövrü (3-11 yaş)
3. Yeniyetməlik dövrü (12-17 yaş)

Uşaq tərəfindən ana dilinin mənimsənilməsi müəyyən ardıcıllıqla və sinir-əzələ aparatının yetişməsi ilə baş verir. Yaşam dövrünün ilk aylarında uşaqda eşitmə, görmə və hərəki –kinetik analizatorlar intensiv inkişaf edir. Sübut olunmuşdur ki, sensor inkişaf prosesi, yəni nitqin qavrayışı zamanı, hərəki impulsların iştirakı ilə həyata keçirilir. Hərəkətin inkişafı, yəni kiçik ümumi motorikanın, artikulyasiya aparatının inkişafı uşağın danışmağa başlamasına stimulyasiya amili kimi baxılır.

Uşağın artikulyator aparatı anotomik cəhətdən inkişaf etsədə nitqin ayrı-ayrı səslərini tələffüz etməsi üçün o uzun hazırlıq dövrü keçir. İlk səslər daxili və qıcıqlandırıcılara xarici göstərilən reaksiyalardır-qışqırıqlardır. İlk dövr uşağın bir yaşına, ilk sözlərin yaranmasına qədər davam edir.

Bir yaşdan üç yaşa qədər ki dövrdə nitqdə uzlaşma elementləri əmələ gəlir, cümlələrdə sözlər qarşılıqlı tabeçiliyə keçir. Praktik cəhətcə isimlərin tək və cəm formalarından, felin zamanlarından şəxs formalarından və bəzi hal şəkilçilərindən istifadə olunur. Rabitəli nitqin inkişafı müxtəlif aspektlərdə bir çox pedaqoqlar (K.D.Uşinski, E.İ.Tixeyeva, E.A.Flerina), psixoloqlar (L.S.Vıqotski, A.A.Leontyev, D.B.Elkonin), loqopedlər (T.B.Filiçeva, T.A.Tkaçenko) tərəfindən öyrənilmişdir.

Rabitəli nitq ardıcıl, sistematik geniş ifadə xarakteri daşıyır və iki formada həyata keçirilir. Nitq patologiyası olmayan uşaqlarda rabitəli nitqin inkişafı tədricən təfəkkürün,fəaliyyətin və ünsiyyətin inkişafı ilə baş verir.

Rabitəli nitq inkişafı dedikdə, birinci növbədə, uşağın öz fikrini səlis, aydın, ardıcıl, yığcam və təsirli şəkildə ifadə etməsi nəzərdə tutulur. Uşaq gərək əvvəlcə ifadə edəcəyi fikri yaxşı mənimsəsin, sonra isə onu

dil cəhətdən doğru ifadə edə bilsin. Demək, rabitəli nitq hər bir məzmunun özünəmüvafiq forma ilə ifadə edilməsindən ibarətdir.

Beləliklə, rabitəli nitqin inkişafı mürəkkəb və müxtəlifyönlü prosesdir. Uşaqlar dilin leksik-qrammatik quruluşuna, sözdəyişmələrinə, söz yaradılmasına, səslərin tələffüzünə və heca quruluşuna dərhal yiyələnmirlər. Bəziləri yazı işarələrini daha tez, bəziləri isə daha sonra mənimsəyirlər.

Ümumiyyətlə, linqvistik qabiliyyətin ontogenezi mürəkkəb qarşılıqlı təsir olub, bir tərəfdən böyüklər və uşaq arasındaki ünsiyyət prosesini, digər tərəfdən, əşyavi və idraki fəaliyyətin inkişafı prosesi təşkil edir.

**Ədəbiyyat:**

1. Hüseynova N.T., Rüstəmova L.H. – "Xüsusi pedaqogika." B.,2006.
2. Qasımov S.Ə., Tılıbov Y. – Anomal uşaqların əlahiddə pedaqogikanın əsasları. B.2000.
3. Qasımov S.Ə., "Xüsusi məktəblərdə anomal uşaqların nitq inkişafı" Bakı, 1999
4. Гиабалина З.П. Первый год - самый трудный. М, 1990. – с. 94.
5. Кольцова М. М. Ребенок учится говорить. М., «Сов. Россия», 1973. –160 с.

**Rəyçi: p.f.d. S.R.Aslanova**

**Əliyev Əli Umud oğlu**
ADPU-nun Ağcabədi filialı

# ELMİ DÜNYAGÖRÜŞ, ƏQLİ TƏHSİL, ƏXLAQİ SAFLIQ QLOBALLAŞAN DÜNYAMIZIN ATRİBUTU KİMİ

***Açar sözlər:*** *müasir, ədəbiyyat, esteti zövq, nürk birliyi, nürk dünyası, inam birliyi, düşüncə birliyi*
***Key words:*** *Chagdash, literature, aesthetic enjoyment, Turkic unity, the Turkic world, the unity of the faith, unity of thinking*
***Ключевые слова:*** *Чагдаш, литература, эстетическое наслаждение, тюркское единство, тюркский мир, единство веры, единство мышления*

Ümummilli liderimiz Heydər Əliyev gənclərin vətənə məhəbbət, dövlətə və dövlətçiliyimizə sədaqət, milli-mənəvi dəyərlərimizə hörmət ruhunda tərbiyə edilməsini müasir təhsil sistemimizin qarşısında duran ən mühüm və başlıca vəzifələrdən biri hesab etmişdir. Ulu öndər demişdir: “Məktəbdə insanın mənəvi keyfiyyətlərinin əsası qoyulur, onun baxışları, arzu və istəkləri formalaşır, onun rəhbər tutduğu mənəvi meyarlar bir çox cəhətdən müəyyənləşir.” (1, 227.)

Gündən-günə inkişaf edən, yeniləşən və qloballaşan dünyamızın əsas atributu olan təhsil sahəsində bir sıra irəliləyişlər vardır. Lakin müasir şəraitə uyğun inkişaf sürəti hələ də tam qənaətbəxş deyildir. Müasir şəraitdə orta ümumtəhsil məktəblərində tədrisin keyfiyyətini yüksəltmək üçün kompleks yanaşma metodu tətbiq edilməlidir. Bu kompleksdə tədrisin xüsusi yeri vardır. Amma tədrisi bu kompleksdən ayrı təsəvvür etmək mümkün deyildir. Odur ki, təlim-tərbiyə və elmi biliklər anlayışının vahidlik prinsipi əsasında kompleks şəkildə tətbiq olunması tədrisin keyfiyyətini yüksəltməyə xidmət edən amildir.

Məktəbə ilk qədəmlərini qoyan şagirdlərə başlanğıc olaraq müəllim qaydalara düzgün riayət etmək vərdişləri aşılayır ki, bu da tərbiyənin ilkin olduğunu və elmi biliklər anlayışının qavranılması üçün şəraitin yaradılmasıdır. Tədrisin keyfiyyəti təlim və tərbiyənin, ciddi rejimin yüksək tərzdə təşkilindən asılıdır. Həmçinin şagird müəyyən mənada məktəbə ağ lövhə şəklində gəlməlidir ki, müəllim onun canlı beynində naxış aça bilsin. Təəssüflər olsun ki, bəzi hallarda birinci sinifə daxil olan uşaq cənnət və cəhənnəmdən, o dünyadan danışır. Orta ümumtəhsil məktəblərində cənnət və cəhənnəm ideyalarına köklənən şagirdlər ali məktəblərə gəldikdə xurafatçı, fanatik olurlar. Məsələn, şagirdlərin bir qismi Sarı Aşiqin aşağıdakı bayatılarını bayağı bir sayaqlama sayır və xurafata meylli olduqları üçün bu bayatıları qəbul etmirlər. Həmçinin Sarı Aşiqi din düşməni hesab edirlər.

Mən aşiq o yar mənim,
Qəm bağrım oyar mənim.
Məkkəmdir, Mədinəmdir,
Qibləmdir o yar mənim.

Aşiq, min ayə gələ,
Qurban Minayə gələ,
Sənsiz qərarım gəlməz,
Göydən min ayə gələ.

Hətta bəzi şagirdlər İ.Nəsiminin, M.F.Axundovun, S.Ə.Şirvaninin, C.Məmmədquluzadənin, M.Ə.Sabirin, Ə.Haqverdiyevin və s. xurafatı, fanatizmi tənqit etdikləri üçün onları dinin düşməni hesab edirlər və millətin əsas amilini dində axtarırlar. Elə düşünürlər ki, milləti millət edən onun dinidir. Buradan göründüyü kimi dini aludəçilik gəncliyin uçuruma yuvarlanması təhlükəsini gücləndirə bilər. Sevginin aludəçisi—Məcnun, içkinin aludəçisi—alkaqol(alkaş), dinin aludəçisi isə xurafat, fanatizmdir. Müasir gəncliyin geridə qalan bir hissəsi xurafat, fanatizm burulğanına qərq olaraq məhvə doğru irəliləyir. Bu gün bu barədə həyəcan təbili calınıb, tədbir görülməsə, gələcəkdə Azərbaycanda təriqətçilik geniş yayıla, dini ədavət toxumunun səpilməsi ehtimalı güclənə bilər.

Məktəbdə dini anlayışların şagird şüuruna yol tapmasına imkan verilməməlidir. Elmlə din uşaq aləmində bir araya sığmaz. Elm o zaman dinlə birləşə bilər ki, elmdə də, dində də kamil biliklər əldə edilmiş olsun, insan kamillik zirvəsini fəth etmiş olsun. Uşaq aləmi bu zirvəni fəth edə bilmir, bundan kənarda qalır.

Son vaxtlar hicablı şagirdlərin, tələbələrin məktəbə gəlmələri və bu formada gəlmək üçün təkid göstərmələri bəzi gənclərin xurafat, fanatizm burulğanına qərq olmalarından xəbər verir. Bu baxımdan həmin gəncliyi işıqlı gələcək deyil, zülmət qaranlıq dünya, avamlıq gözləyir. Min illər boyunca bəşər övladı bu

dərdlərə mübtəla olmuş, lakin qurtuluş yolunu reallığın dərkində tapıb həyat həqiqətlərinə qovuşmuşdur. Bu gün yenidən qaranlıq dünyaya qayıdış kimə lazımdır?! Hansı qüvvələrə sərf edir?!

Gənclərimizin müəyyən hissəsinin şüurca geridə qalmasından, az bir qisim ailələrin maddi vəziyyətinin zəif olmasından istifadə edən xristian dini missioner təşkilatları və cəmiyyətləri belə gəncləri maddi cəhətdən maraqlandırmaqla, müxtəlif dini kitabları hədiyyə etməklə gənclərimizin arasında xristianlığın yayılmasına çalışırlar.

Bütün bunları nəzərə alaraq müasir şəraitdə orta ümumtəhsil məktəblərində şagirdlərdə elmi dünyagörüşünün formalaşmasını təmin etmək və tədrisin keyfiyyətini yüksəltmək üçün aşağıdakı tələb və pinsiplər əsas götürülməli və əməli fəaliyyətə tətbiq edilməlidir:

— Müasir tələblərə cavab verə bilən yüksək ixtisaslı müəllim kadrlarının hazırlanması;

— Şagirdlərdə elmi dünyagörüşünün inkişaf etdirilməsində şüurluluq və fəallıq prinsipinin təşkili;

— Şagirdlərin adət-ənənələrə hörmət, milli-mənəvi dəyərlərimizin qorunub saxlanması və inkişaf etdirilməsi ruhunda tərbiyə edilməsi;

— Demokratik Azərbaycan cəmiyyətində dinin dövlətdən ayrı olmasını aşılamaq, şagirdlərdə başqa dinlərə münasibətdə tolerantlıq hisslərini tərbiyə etmək;

— Cənub qonşularımızın bəzi dövlət rəsmiləri səviyyəsində "Səhər" telekanalı və digər kütləvi informasiya mənbələri vasitəsi ilə dini təbliğatın son zamanlar gücləndirilməsini nəzərə alıb əks təbliğatın forma və vasitələrini artırmaq;

— Şagirdlərin müasir İKT-dan səmərəli istifadəsini gücləndirməklə dini fanatizmin gənclər arasında geniş yayılmasının qarşısının alınmasına nail olmaq;

Hərtərəfli şəxsiyyət yetişdirməyin əsas amillərindən biri və başlıcası şagirdlərdə elmi dünyagörüş formalaşdırmaqdır. Bunun üçün birinci növbədə şagirdlərin beynində obyektiv gerçəklik toxumları səpmək lazımdır. Odur ki, elmi dünyagörüşə sahib olmaq, əqli təhsilə yiyələnmək gənc nəslin, hər bir vətəndaşın məcburi yolu olmalıdır."Əqli təhsil sistemli şəkildə tədris müəssisələrində aparılır. Böyüyən nəsil müxtəlif fənlərin tədris prosesində müxtəlif təbiət hadisələrinin mahiyyətini öyrənir, öyrənilmiş biliklərə müvafiq bacarıq və vərdişlərə yiyələnirlər... Elmi məlumatlara yiyələnmiş hər bir adam quruculuq işində daha fəal iştirak edir, öz fəaliyyətini elmi əsaslar üzərində qurmağa çalışır, yaradıcılıq göstərir. Əqli təhsil mənəvi zənginlik yaratmaqla, əxlaqi saflığın da əsasını qoyur... Əqli təhsil zehni qabiliyyətlərin, idrak proseslərinin, xüsusən də təfəkkürün inkişafına imkan yaradır." (2, 31.)

Bununla da dərin biliyə, inkişaf etmiş təfəkkürə malik olan hər bir şəxs boş xülyalara inanmaz və həyatda doğru yol tutar, cəmiyyət üçün yararlı şəxsiyyət olar. Qloballaşma şəraitində çağdaş uşaq ədəbiyyatının milli və bəşəri ideya istiqamətləri də düzgün istiqamətdə formalaşsa, gənclərimiz bundan yararlanıb yeni həyata yeni prizmadan yanaşarlar.

Məlumdur ki, dili və ədəbiyyatı olmayan xalq, millət mövcud deyildir. Odur ki, qloballaşma şəraitində ictimai şüurun tam humanistləşməsi müasir dünyamızın əsas amilidir. İctimai şüuru humanistləşdirən sosial-siyasi elmlərlə yanaşı bütün sahələrdə cəmiyyətin inkişafına təkan verən, bəşəriyyətin ən vacib ünsiyyət vasitəsi olan dilin və ədəbiyyatın rolu böyükdür. Dilçilər və ədəbiyyatşünaslar ölkədə baş verən yeniliklərin aparıcı qüvvəsinə çevrilməklə qloballaşma şəraitində ictimai şüurun humanistləşməsi sahəsində öz bacarıqlarını zaman kontekstində ortaya qoymalıdırlar. Bütün bunlar Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik Ramiz Mehdiyevin "İctimai və humanitar elmlər: zaman kontekstində baxış" məqaləsindən irəli gələn ideologiyaya əsaslanır.

Qloballaşma və inteqrasiyanın genişlənib reallaşması, xalqımızın millilik xüsusiyyətlərinin qorunması, milli dəyərlərimizə, soy kökümüzə daha da dərindən bağlanmaq, ictimai və əxlaqi şüurun millilik kontekstində gənclərə aşılanması yolunda, dilçi və ədəbiyyatşünas alimlərimizin əməyi müqabilində millətimizin gələcəyi görünür.

Biz gələcəyimizi daha parlaq və gözəl görmək istəyiriksə, yüksək intellektə malik nəsil yetişdirməliyik. Bu sahədə ən qüdrətli silah ədəbiyyatdır. Uşaq ədəbiyyatı yazarlarının ideyası ilə tədris edənin məqsədi bu prosesdə ust-ustə düşməlidir. Türk dünyasının böyüklüyü və bütövlüyü təbliğ olunmalı, Azərbaycançılıq ideyası, özünəməxsusluğu qorunub saxlanılmalıdır. Milli ideyalar, adət-ənənəyə bağlılıq, vətənə sədaqət hisləri aşılamaq üçün yaradıcı təfəkkürə malik olan yazarlar qarşısında məqsəd və vəzifələr qoyulmalıdır. Bu baxımdan çağdaş uşaq ədəbiyyatının ideologiyası müəyyənləşməlidir. "Uşaq ədəbiyyatının başlıca vəzifəsi böyüməkdə olan nəslin etik və estetik tərbiyəsinə istiqamət vermək, milli və bəşəri ideyalara hörmət və sədaqət, vətənpərvərlik, humanizm, əməksevərlik, dostluq, yoldaşlıq, düzlük və doğruluq, özünə qarşı tələbkarlıq kimi mənəvi-estetik keyfiyyətlər aşılamaqdır." (4,3). Bütün bunlarla yanaşı, məncə, çağdaş uşaq ədəbiyyatının vəzifələri dedikdə ilk öncə aşğıdıkıları nəzərdə tutmaq önəmli sayılmalıdır:

1.Mən kiməm, hansı vətənə, millətə, dilə, adət-ənənələrə malikəm?! Mənim dostum və düşmənim kimdir?!

2.Mən bir fərd kimi etik və estetik zövqə malik olmalıyam.

3.Milli dəyərləri sevməli və qorumalı, milli dəyərlər fövqündə bəşəri ideyalara hörmətlə yanaşmalı.

4.Dosta dost, düşmənə düşmən ideyası təbliğ olunmalı, Türk xalqlarının ortaq dəyərlərinin daim diqqətdə olması əsas məqsəd kimi qrşıya qoyulmalıdır.

5.Yüksək intellekt sahibi olmaq üçün (fəaliyyət növünün bütün sahələrində) oxumaq, öyrənmək və tətbiq etmək bacarıqları uğrunda daim mübarizə aparmaq ideyası tərbiyə etmək və s.

Bu günə qədər humanizm deyə-deyə 410 min kv.km. ərazimizin 83%-ni itirmişik. Nə qədər dəhşətli olsa da reallıq budur ki, tarixi ərazilərimizin hal-hazırda 17%-nə sahibik. Lakin qüdrətdən yanan ocağı heç kəs söndürə bilməz. Böyük Türk dünyası bir sıra xalqların formalaşmasında (rus, erməni) mənbə olmuşsa da, onu bir başlanğıc od kimi söndürməyə, parçalamağa çalışmışlar. Lakin qüdrətədn yanan ocağı söndürmək mümkün olmadığı kimi, Böyük Türk dünyasını, türkçülük ideologiyasını parçalasalr da onu məhv etmək, söndürmək mümkün deyildir.Uzun illərdən bəri tüstülənə-tüstülənə tarixə yoldaşlıq edən Türk dünyası XXI yüzillikdə alovlanacaq və əvvəlki mənbə ocağına çevriləcək. Mən buna əminəm. Vaxtilə türklər rusların, ermənilərin soy kökünün formalaşmasında az rol oynamamışlar. Biz bunu mərhum professor Ziya Bünyadovun tədqiqatlarında, İlhami Cəfərsoyun “Türklər rusların soy kökündə” və s. əsərlərdən aydın görə bilərik. Ruslar cəngavərliyi türklərdən öyrənmiş və “baranovlar” mübariz, döyüşkən kimi formalaşmışlar. Bizim xalqımız isə uğurlardan xumarlanmış, uyumuşdur. Bu uyqu Oğuz elinin genindədir. “Oğuz igidlərinə nə bəla gəlsə yuxudan gəlir”. Bu eli ayıltmaq lazımdı. Özünə qaytarmaq, soy kökünə tapınmaq kimi ideyalara səsləmək lazımdır:

Nə yatmısan, qoca vulkan, səninləyəm. Ayağa dur, Azərbaycan, səninləyəm! (M.Araz)

Bu eli elə ayıltmaq lazımdır ki, din pərdəsi altında qanımızı sormağa, vətənimizi məhv etməyə, dilimizi əlimizdən almağa daimi meyilli olan tarixi düçmənlərimizi birdəfəlik tanısın və gələcək nəsillərə də tanıtsın. Tanıtsın ki-“Qarı düşmən dost olmaz, keçsə də min il”.

Bu xalqı elə ayıltmaq lazımdır ki, daim tikan kimi yarağını hazır tutsun ki, gülü, Azərbaycan kimi cənnət məkanını əlində saxlaya bilsin. Nəhayət, bu xalqı elə ayıltmaq lazımdır ki, soy kökünü unutmasın və tarixin əbədi yaddaşında yaşaya bilsin. Bu hüququ bizə heç kəs verməyəcək, bunu özümüz, hər birimiz qazanmalıyıq. Təsadüfi deyildir ki, sərkərdə igid babamızın adı Qazan olmuşdur. Bu adın leksik anlamı da bir daha soy kök hüququmuzu qazanmağa səsləyir. Odur ki, qarşımıza məqsəd qoymalı, Azərbaycana və milli dəyərlərimizə qarşı yönəlmiş hər bir ideologiyanın aşkarlanmasına çalışıb, düşmənin iyrənc xüsusiyyətlərini bəşər övladının diqqətinə çatdırmaqla yanaşı, düşmənə qarşı barışmaz olmalıyıq. Bununla da yaddaşımızın silinməməsinə çalışıb, düşməndən intiqam və qisas almaq üçün xalqımızı və eləcə də Bütün Türk dünyasını mübarizəyə səsləyirik. Biz çalışmalıyıq ki, mübarizə ruhumuz artsın, bizdə düşmənə qarşı barışmaz mif formalaşsın,yaddaşsızlıq bəlamıza son qoyulsun. Biz Nəsiminin soyularkən dözümlülüyünü deyil, ona edilən zülmün dərəcəsin, işgəncənin ölçüyə sığmazlığını təbliğ etməliyik. Çünki dözümlülük, səbirli olmaq (baxır məqamına) ideyasının təbliği köləlik fəlsəfəsindən irəli gələn ideologiyadır. Qoy bizim qəhrəmanlığımızı başqaları söyləsin, biz özümüz-özümüzü öydüyümüz bəsdir. Özünü tərifləmək, öyünmək Oğuz qəhrəmanlarına xas olan xüsusiyyət deyil.”Salur Qazan dutsaq olub oğlu Uruz çıxardığı boyu bəyan edər” boyunda Qazan xandan tələb edirlər ki, onları (düşmənləri) öysün. Qazan xan isə qopuzunu çalır və onlardan qorxmadığını (“Öyünən ərənləri xoş görmədim” (8,143) — söyləyir. Həmçinin özünün nə qədər igidlik ğöstərdiyini sadalayır, amma özünü tərifləmir, bildirir ki, “Onda dəxi ərəm, bəyəm deyü öyünmədim, Öyünən ərənləri xoş görmədim”(8,143). Dədə-Qorqud ənənələri çağdaş uşaq ədəbiyyatının ideya istiqamətlərinin əsas daşıyıcısı olmalıdır. Nə qədər əzilir, döyülürüksə də qəhrəmanıq deyirik. Gör necə qəhrəmanıq ki, ermənilər Qarabağda at oynadır, biz isə moizə oxuyuruq.

Uşaq ədəbiyyatının ideya istiqamətlərindən başlıcası Azərbaycan Türk millətinin soy kökünə qayıdışı, özünü dərk edib, tarixi bütövlüyünə qovuşmasıdır. Odur ki, bu sahədə örnək olan, ədəbi-fəlsəfi bir məktəb keçib və özündən sonra böyük irs qoyub əbədiyyətə qovuşan, Asif Ata adı ilə məşur olan şəxsiyyətimizin dərin mənalı və bu günümüz üçün aktuallıq kəsb edən milli ideologiyasını bu gün məqsəd və vəzifə kimi qarşıya qoymağımız işıqlı gələcəyimiz deməkdir. “Milli ideologiya hər bir xalqın milli maraqlarını, milli mənafeyini, milli və tarixi ənənələrini, milli düşüncəsini, milli psixologiyasını və milli dünyagörüşünü ifadə edən baxışlar sistemidir. Hər bir xalqın milli ideologiyasında, şübhəsiz ki, onun milli mənafeyi və milli maraqları aparıcı yerdə durur. Bu milli mənafe və maraqların içərisində milli və tarixi ənənələr yaşayır. Eyni zamanda, milli ideologiyaların bazasında ümummilli düşüncələri birləşdirən milli psixologiya dayanır. Milli ideologiyanın bütün daxili mexanizmi milli dünyagörüşü formalaşdırır. Hər bir milli ideologiya, bütövlükdə, öz xalqına və millətinə xidmət edir.” (9,112).

Asif Ata bəsirət gözü açılmış, hadisələri öncədən görə bilən, Dədə Qorqud xislətli nəcib bir dühadır. Onun söylədiyi aforizmləri, əvvəlcədən xəbər verdiyi hadisələri çoxları dərk etmir və ona görə də Asif Atanın dərk olunması ləngiyir. Asif Atanın fikir dünyasını, məqsədini, amalını sadə dillə oxuculara çatdırmaq ehtiyacı yaranır. Odur ki, burada, Asif Atanın "Türklüyümüz" adlı toplusunda söylədiyi fikirlərə dirsəklənib, onun fikir süzgəcindən keçənləri sadə dillə, açıqlamaqla çağdaş uşaq ədəbiyyatının milli və bəşəri ideya istiqamətində formalaşması üçün yazarlarımıza və gənclərimizə Böyük Türk dünyasının dərk olunmasını arzu edirik.

Türklüyümüz dərk olunmalı, türk birliyi, türk dünyası, ümumiyyətlə, nəhəng - türkçülük ideologiyası yaradılmalıdır. Asif Atanın ideyası, mübarizəsi, amalı, fəlsəfəsi, bütün varlığı türklüyümüzün dərk və bərpası olmuşdur. Ona görə də o, türkü günahlandırır ki, Böyük Hikmət yaratdı, Böyük Sənət yaratdı, Böyük Səltənət yaratdı, Böyük Vəhdət yaratmadı (Burada sözlərin böyük hərflə yazılması dərin rəmzi məna daşıyır və incə çalara malikdir).

Biz o zaman xırdalandıq ki, Türk əvəzinə azərbaycanlı türkü (bu ifadəni də itirmişik), osmanlı türkü, özbək, qazax, qırğız, türkmən adı altında ilkin soyadımızdan uzaqlaşdıq. Vahid dəniz əvəzinə-müxtəlif səmtə axan çaylara, arxlara çevrildik.

Dəniz idik, ləpə olduq,
Dağ idik, təpə olduq.
Xırdalana-xardalana,
Kiçik bir qəlpə olduq.

Bizə türk birliyi gərəkdir:
İnam, birliyi, İdrak birliyi, Mənəviyyat birliyi, İradə birliyi.

Azərbaycan İdrakında, Mənəviyyatında, İradəsində nə varsa, Osmanlı İdrakında Mənəviyyatında, İradəsində nə varsa, Qıpçaq İdrakında, Mənəviyyatında, İradəsində nə varsa-Türk İdrakı, Türk Mənəviyyatı, Türk İradəsi sayılmalıdır. Türkləşmə -millətləşmə deməkdir. Soy kökə qayıdışdır. Millət kimi formalaşmaq üçün "kommunizm yorğanı" olan "azərbaycanlı" adı altından çıxıb Azərbaycan türkünə qovuşmaq və Asif Ata ocağının başına yığışmaq, - o ocağın istisinə qızınmaq lazımıdr.

Əgər, Türklərin Türklərlə Ruhani görüşü-Birliyi baş tutsaydı, dünyamız başqa Dünya olardı: Zərdüşt İşığı, qaranlıqları yarardı, Babək yenilməzliyi, mutiliyi yenərdi, Dədə Qorqud Ağsaqqallığı hərcayilliyə qənim kəsilərdi, Hürufi İnsaniliyi Antiinsani Cəhaləti qovardı, Füzuli Eşqi Şəhvəti sındırardı, Muğam Ehtizazı Həqarəti susdurardı. Saz Cuşu Mənəvi Buzları əridərdi-Dünya Dəllala, Siyasətbaza, Riyakara, Fitnəkara qalmazdı-qərb özü durulardı.

Türk Türklə vaxtında görüşə bilsəydi, birləşə bilsəydi Cəlaləddin Rumilər, Nəimilər, Nəsimilər, Füzulilər birliyi yaranacaqdı.

Türk Türklə birləşsəydi- Türk Dünyada bu dərəcədə, bu səviyyədə Təklənməzdi; Türk Türkə əl qaldırmazdı; "şiə-sünnü türkləri" yaranmazdı; miskin yağılar azğınlaşmazdı. (bu deyilənlər Asif Atanın "Türklüyümüz" kitabındandır .(7, 1-16).

Avropa mədəniyyətinə inteqrasiya, Avropalaşmaq Avropa sayağı olmaq deyildir. Özümüzün nəyi varsa Avropa səviyyəsinə qaldırmaq, qayda və qanunlarımızı işlək formadan avtomatik vəziyyətə çatdırmaq lazımdır. Hər hansı qanun və ya milli adəti bilmək azdır, ona riayət etmək, icra etmək lazımdır. Özünü insan cildindən çıxarıb bayağı Avropa adətini icra etməkdənsə, milli kökə, milli atributa, adət və ənənəyə, davranış qaydalarına sığınıb, onları milli çərçivədə inkişaf etdirmək hər birimizin ümdə vəzifəsidir.

Soy kökümüz bir olan türk qardaşlarımız Avropa sayağı o qədər bayağılaşıblar ki, ona görə də Asif Ata "özümlü şərqliyimiz"i Türklüyümüz qədər önəmli sayır və osmanlılar kimi bayağı Avropalaşmağı rədd edir. Özümüzəməxsusluğu müqəddəs bilməli, məkan və zamandan asılı olmayaraq doğma olan özümlüyümüzü (namusumuzu) unutmamalıyıq.

Ürəyim Türk dünyasınına məxsuvsdur və Türk dünyasının bir payıdır.Odur ki, Türk dünyası ilə nəfəs alıram. Uğurları ilə fəxr edir, şad oluram, Türk dünyasını bütöv görmək istəyirəm.Yumruğu yaradan barmaqlardır, hər barmağın öz adı vardır. Qoy Türk xalqlarının da hər birinin öz adı,öz müstəqil dövləti olsun, amma lazım gəldikdə yumruq kimi birləşib sözünü deməyi bacarsın. Türk xalqları soy kökünü dərk edib kökə bağlansa, göy kimi gurlayıb, ildırım kimi çaxar, atomsuz atom olar. Soy kökümüz bizim üçün o zaman onqon olar ki, biz onu namusumuz, qeyrətimiz, qürur və iftixarımız sanaq. Hər bir azərbaycanlı məni biz olmağa səsləyirəm. Biz biz olsaq, düşmənə nizə, dosta dayaq olarıq. Dərk etməliyik ki, bəsdir cılızlaşmağımız, cılızlaşa-cılızlaşa parçalanır, xırdalanırıq. Xırdalana-xırdalana yox oluruq. Göl olmaqdansa, okean olmaq, sızqa bulaq olmaqdansa, gur sulu çay olmaq, təpə olmaqdansa, dağ olmaq daha yaxşıdır. Xırdlanıb sinə dağına çevrilməkdənsə, uca dağ olub fəxarət hissi yaratmaq lazımdır.

Yuxarıda söylənilənlərdən bu nəticəyə gəlmək olur ki, qloballaşma şəraitində çağdaş uşaq ədəbiyyatı nın milli və bəşəri ideyası ali məqsədlər fonunda, bütöv Azərbaycançılıq çərçivəsində formalaşmalıdır ki, gənclərimizdə də düzgün elmi dünyagörüş, əqli təhsil və mənəvi saflıq aşılaya bilək. Bu yolda bütün təhsil işçilərinə uğurlar diləyirəm.

**Ədəbiyyat:**

1. Heydər Əliyev.Təhsil, bilik, məktəb, Bakı,2006.
2. Əliyeva Zərifə. Pedaqogika, Bakı, 2004.
3. Ramiz Mehdiyev. "İctimai və humanitar elmlər; zaman kontekstində baxış", "Azərbaycan" qəzeti 8 dekabr, 2009.
4. Qara Namazov. Azərbaycan uşaq ədəbiyyatı, Bakı, 2007.
5. Əli Əliyev. Laçın qədim Oğuz yurdu. Bakı, 2009.
6. "Azad Hüquqşünas" qəzeti, №10, 17-30-12-2009.
7. Asif Ata. "Türklüyümüz".
8. Kitabi-Dədə Qorqud,Bakı,1962.
9. Namiq Abbasov. Müasir şəraitdə Azərbaycan dövlətinin mədəniyyət siyasəti və mənəvi dəyərlərin inkişaf amilləri, Bakı, 2008.

**Scientific outlook, intellectual education, moral purity as an attribute of our globalizing world**

**Summary**

If we want to see our beautiful and prosperous future, we must raise the inheritance in the spirit of higher intelligence. In this area the most active instrument of this literature.

One of the ideological orientation of children's literature is a return to the fundamental foundation of the Azerbaijani-Turkic people, the self-consciousness of the unity of the historical integrity.

**Научное мировоззрение, умственное образование, моральная чистота как атрибуты глобализации**

**Резюме**

Если мы хотим видеть наше будущее прекрасным и процветающим, то должны воспитать наследство в духе высшего интеллекта. В этой области самое активное орудие это литература.

Одной из идейной направленности детской литературы является возврат к коренным основам Азербайджанско-тюркского народа, самосознание, единство с исторической целостностью.

**Rəyci: dos. M.M.Səlimov**

**Erdem Abdullah**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
erdem.abdullah @ yahoo.com

# İNTELLEKTUAL POZULMALARI OLAN UŞAQLARIN NİTQİNİN MÜAYİNƏSİ
## (tezislər)

***Açar sözlər:*** *intellektual çatışmazlıq, sensor qavrayış, psixo-pedaqoji müayinə, loqopedik iş*
***Key words:*** *intellectual deficiency, sensory perception, psycho-pedagogical research, speech therapy work*
***Ключевые слова:*** *интеллектуальный дефицит, сенсорное восприятие, психо-педагогическое исследование, логопедическая работа*

İntellektual çatışmazlığı olan uşaqlarda nitq çatışmazlıqlarının korreksiyaşı üzrə işin təşkili birinci növbədə onların hərtərəfli müayinəsini tələb edir. Müayinə sistemli xarakter daşıyaraq korreksiya təsir işinin bütün istiqamətlərini əhatə edir və ozundə tibbi, psixoloji-pedaqoji və loqopedik istiqamətləri birləşdirir. Nitq butun psixi proses və funksiyalarla əlaqədar olduğu ucun onun muayinəsi zamanı aparılan psixoloji-pedaqoji istiqamət loqopedik muayinə üçün boyuk əhəmiyyət daşıyır. Vaxtında aparılmış psixoloji-pedaqoji müayinə loqopedə nitq qusurlarının strukturunu, inkişaf dinamikasını izləməyə, onu düzgün diaqnozlaşdırmağa, uşağa nitq çatışmazlıqları ilə bağlı keyfiyyətli xidmət gostərməyə imkan verir. Psixo-pedaqoji-müayinə vahid bir sistem olub, ozundə kiliniki, psixoloji və pedaqoji araşdırmaları birləşdirir. Muayinə uşağın aparıcı fəaliyyəti prosesində: əşya-əməli, oyun və ya təlimi zamanı başlanır. Aparılan muayinə özunun istiqamət, məqsəd və vəzifələri ilə fərqlənir. Tibbi muayinə anamnezdəki kliniki məlumatlar əsasında nitq catışmaz lığının ontogenez və dizontogenez mənzərəsini aydınlaşdırmağa imkan verir. Tibbi muayinə terapevt, nevropatoloq, oftalmoloq, otolorinqoloq və digər mutəxəssislər tərəfindən aparılır.

Psixoloji müayinə uşağın idrak fəaliyyəti, emosional -iradi, nitq, davranış və şəxsiy yət xüsusiyyətlərini oyrənib, onları nəzərə alaraq loqopedik işi təşkil etməyə xidmət edir. Muayinə zamanı uşağın davranış motivasiyası, insan və hadisələrə munasibət, ünsiyyət prosesində qarşılıqlı emosional əlaqələrin xususiyyətləri, şəxsiyyət sterio tipləri aydınlaşdırılır. Psixoloji muayinə zamanı muşahidə, test, eksperement və digər metodlardan istifadə olunur.

Pedaqoji muayinə uşaqların yaşına uyğun bilik, bacarıq və vərdişlərə yiyələnmə və başa düşmə səviyyəsini muəyyən etməyə imkan verir. Pedaqoji muayinə uşaqlarda aşağıda qeyd edilən məsələləri aydınlaşdırmağa komək edir:

1) pedaqoji səhlənkarlığın səviyyəsini, psixi inkişafın və psixi inkişaf ləngiməsinin həmsərhəd vəziyyətini muəyyənləşdirməyə və fərdi tipoloji imkanların aşkarlan masına xidmər edir.

2) uşağın getdiyi təhsil muəssisəsinin tədris proqramına uyğun olaraq təlim vərdiş və mənimsəmə səviyyəsini muəyyənləşdirmək.

3) uşaq inkişafının dinamikasını (hər şeydən oncə yaxşı nəticələr əldə etmək ucun vacib olan psixi xususiyyətləri) qiymətləndirmək.

4) loqopedik iş ərzində «muəllim -uşaq » arasında hər ikisinin fərdi -tipoloji xusu siyyətləri əsasında onların optimal qarşılıqlıəlaqəsini təşkil etmək.

5) valideynlərlə konsultasiya işini aparmaq.

6) alınmış nəticələr əsasında gələcək işləri planlaşdırmaq.

Müayinə metodları uşağın komunikativliyindən, yeni şəraitə adaptasiya çətinliyin dən, narahatlığından, sensitivliyindən və digər fərdi xususiyyətlərindən, o cumlə dən hər bir muayinə mərhələsinin məqsəd və vəzifələrindən asılı olaraq secilir. [2].

### Ədəbiyyat:

1. N.Hüseynova və L. Rüstəmova "Xüsusi pedaqogika" Bakı., 2006.
2. Çələbiyev N.Z. Uşaq psixologiyası Bakı: ADPU- nun mətbəəsi, 2005,
3. S.Qasımov və E.Kərimova "Əqli və fiziki inkişafı ləngiyən uşaqların diaqnostikası və korreksiyası", Bakı,2004
4. Т.А.Власова, М.С.Певзнер. О детях с отклонениями развития –М.,1973

**Rəyçi: dos.N.T Hüseynova**

**Elyasova Nərmin Rafət qızı**
Bakı Slavyan Universiteti

# QLOBALLAŞAN DÜNYADA MULTİKULTURAL TƏHSİL

***Açar sözlər:*** *multikulturalizm, təhsil, multikultural təhsil*
***Key words:*** *multiculturalism, education, multicultural education*
***Ключевые слова:*** *мультикультурализм, образование, мультикультурное образование*

Qloballaşan dünyada baş verən dəyişikliklər bizə bütün sahələrdə dəyişikliklər etməyə, uğurlu gələcək üçün düzgün addımlar atmağa sövq edir. Bu sahələrdən biri və birincisi təhsil sektorudur. Təhsil insanların həyatına toxunmaq üçün ən təsirli vasitədir. Uğurlu gələcək bir – birini sona qədər dinləməyi bacaran, bir – birinin mənəvi – mədəni dəyərlərinə hörmət etməyi bacaran, tolerant, hörmətcil şəxslərin əlindədir.

Multikultural təhsil, şagirdlərə, tələbələrə sürətlə dəyişən demoqrafik göstəriciləri səbəbi ilə yaranan bir çox problemlərə cavab verən və müəllimlərə yardım etmək üçün hazırlanmış bir təhsil strategiyasıdır. Tələbələrə müxtəlif qrupların, birliklərin tarixi, mədəniyyəti və fəaliyyətləri barədə məlumat verilir, onlarla birgə gələcək cəmiyyətin plüralist olduğu qənaətinə gəlinir. Bu istiqamətdə inklüzivlik, müxtəlifliklik, demokratiya, bacarıqların əldə edilməsi, araşdırma, tənqidi düşüncə, bərabərlik kimi prinsiplər təbliğ edilir. Bu tədris metodunun immiqrantlar arasında tətbiq olunması təhsil müvəffəqiyyətlərinin artırılmasında təsirli olduğu aşkarlanıb.

Multikultural təhsil 1960-cı illərdən, vətəndaş azadlıqları hərəkatlarından inkişaf etmişdir. Məktəb rəhbərliyi elə dərslər təşkil edirdi ki, şagirdlər müxtəlif etnik qruplar haqqında öyrənə bilsinlər. Bu zaman informasiyanın çoxunu müxtəlif etnik qrupların bayramları, adət-ənənələri haqqında təşkil edirdi. Multikultural təhsil əsas olaraq dini, sinfi, irqi ayrı-seçkilik anlayışlarını özündə ehtiva edir. Multikultural təhsil "etnik, irqi mənsubluğundan, sosial sinfindən, mədəni xüsusiyyətlərindən asılı olmayaraq bütün şagirdlərin bərabər təhsilalma hüquqları vardır" ideyasını özündə daşıyır. Əgər məktəblərdə bütün bunlar düzgün şəkildə həyata keçirilərsə, şagirdlərdə müxtəlif, fərqli tarixi, mədəni qruplar haqqında müsbət qavrayış formalaşacaq. Bu yolla multikultural təhsil tələbə və şagirdlər üçün öz kimliklərindən qürur duymaq və bundan daha inamlı olmağa dəstək verən bir alətdir.

Etnik, dini ayrı – seçkilik zaman – zaman təhsil sisteminə də öz mənfi təsirini də göstərib. Məsələn, 1994 – cü ilə qədər Cənubi Afrikanın təhsil sistemi irqi ayrı – seçkilik siyasəti əsasında idarə olunub. İrqi, etnik dil qruplarına görə müxtəlif məktəblər, kolleclər fəaliyyət göstərib. Qara dərili insanlar Bantu məktəblərində, hindlilər Hind təhsil sistemi əsasında təhsil alıblar. Ağ dərili insanlar isə xüsusi məktəblərdə oxuyublar. Bu fərqlilik məktəblərin maliyyələşdirilməsində, idarə olunmasında və şagirdlər üçün yaradılan tədris şəraitində də özünü biruzə verirdi.

Multikultural təhsil, təhsil sistemində müxtəlif irq, din, xalqların mədəniyyətlərinin tədrisi üçün hazırlanmış təhsil və təlimatla bağlıdır. Tədrisə və öyrənməyə istiqamətlənmiş bu yanaşma irqçi cəmiyyətlərdə mədəni plüralizmin inkişafına əsaslanır.

Ümumiyyətlə, çoxmədəniyyətli təhsil, bütün mədəniyyətlərdən asılı olmayaraq, bütün mədəniyyətlər üçün vahid ədalət prinsipinə əsaslanır və müxtəlif mədəni fərqlilikdən olan tələbələr üçün müvəffəqiyyətə aparan yolda maneələri aradan qaldırmağa çalışır. Təcrübədə pedaqoqlar fərqli mədəni fərqliliklərə qarşı ayrı-seçkilik edən və ya kifayət qədər əhatəli olmayan təhsil siyasətlərini, proqramlarını, materiallarını, dərslərini və təlimatlarını dəyişdirə və ya aradan qaldıra bilər [5].

Çoxmədəniyyətli təhsil müxtəlif millətlərin nümayəndələrinin eyni vaxtda təhsil alması üçün nəzərdə tutulmuş təhsil formasıdır. Bu təhsil forması zamanı eyni sinifdə olan şagirdlərin irqi, dini, rəngi və adətlərinə görə bir-birindən fərqləndirilməməsi əsas götürülür. Şagirdlər qarşılıqlı anlaşma, bir-birinə hörmət, digər irqlərin və dinlərin nümayəndələrinin qarşılıqlı anlaşması təmin olunur. Çoxmədəniyyətli təhsilin keçidində müəllimlərin əsas vəzifələri var. Təbii ki, bu işin uğurla yerinə yetirilməsi üçün öyrədən tərəf – müəllimlərin bu formada təhsilə müsbət münasibəti əsasdır. Bütün şagirdlərin eyni hüquqa malik olması, öyrətmə və öyrənmənin dini, irqi, rəngi olmaması və əksinə belə bir mühitin şagirdlərin daha da inkişaf etməsinə, digər mədəniyyətləri öyrənməsinə kömək etdiyini müəllimlər unutmamalıdırlar.

YUNESKO-nun təşəbbüsü olan "Hamı üçün təhsil" (Education for All, EFA) strategiyasının əsas müddəaları 1990-cı ildə Tailandın Comtyen şəhərində keçirilən "Hamı üçün Təhsil – Ümumdünya Konfransında" irəli sürülmüşdür. Konfransda qəbul edilmiş Hamı üçün Təhsil haqqında Ümumdünya Bəyannaməsində vurğulanırdı ki, "təhsil dünyanın hər yerində hamının, yaşından asılı olmayaraq bütün qadın və kişilərin təməl hüququdur... təhsil daha təhlükəsiz, sağlam, inkişaflı və ekoloji təmiz dünya üçün zəmin yaratmalı və eyni zamanda sosial, iqtisadi və mədəni tərəqqiyə, dözümlülüyə və beynəlxalq

əməkdaşlığa yol açmalıdır... təhsil şəxsi və ictimai təkmilləşmənin zəruri şərtidir.” Hamı üçün Təhsil Konfransı və Comtyen Bəyannaməsi dövlətlərin milli inkişafı üçün, eləcə də gənclərin 21-ci əsr cəmiyyətlərində fəal və məhsuldar həyata hazırlığı üçün təhsilin həlledici rolunu ön plana çıxardı [2].

Azərbaycan müxtəlif etnik və dini qrupların ənənəvi dözümlülük və harmonik birgəyaşayışı üzərində qurulmuş və həyata keçirilən milli siyasətin aparıldığı çoxmillətli və çoxdinli ölkədir. Qanun mənşəyindən, milliyyətindən, dinindən və dilindən asılı olmayaraq hər kəsin hüquq və azadlıqlarının bərabərliyinə təminat verir.

Azərbaycanda yaşayan etnik qruplara doğma münasibət onların sosial – iqtisadi inkişafı üçün bütün sahələrdə özünü göstərir.

**Maddə 5. Təhsil hüququna dövlət təminatı**

5.1. Dövlət hər bir vətəndaşın təhsil alması üçün müvafiq şəraitin yaradılmasına təminat verir və təhsilin hər hansı pilləsindən, səviyyəsindən və formasından məhrum edilməsinə yol vermir.

5.2. Dövlət cinsindən, irqindən, dilindən, dinindən, siyasi əqidəsindən, milliyyətindən, sosial vəziyyətindən, mənşəyindən, sağlamlıq imkanlarından asılı olmayaraq, hər bir vətəndaşa təhsil almaq imkanı yaradılmasına və ayrı-seçkiliyə yol verilməməsinə təminat verir [3].

Müasir Azərbaycan cəmiyyətində multikulturalizmin əhəmiyyəti böyükdür. Hal – hazırda orta ümumtəhsil məktəblərində azərbaycanlılarla yanaşı, müxtəlif xalqların nümayəndələrinin uşaqları da təhsil alır. Onlara qarşı heç bir ayrı – seçkilik, radikal münasibət göstərilməyib. Şəxsiyyətin formalaşmasında üç əsas amil, irsiyyət, mühit, tərbiyə əsas rol oynayır. Hansı amilin üstünlük təşkil etməsi əsrlər boyu mübahisələr doğurmuşdur. İnsanın inkişafında və onun bir şəxsiyyət kimi formalaşmasında ünsiyyət, mühit və tərbiyə amilləri qarşılıqlı surətdə mühüm əhəmiyyət daşıyır. Mənim fikrimcə, şəxsiyyətin formalaşmasında daha çox rol mühitin üzərinə düşür. Bu tərəfdən yanaşsaq, şəxsiyyətin formalaşmasında ailənin rolu böyükdür. Ailə insan üçün mədəni məişət şəraiti yaradır, emosional həyat sahəsinə təsir edir, ilk sosial və mədəni təsəvvürlərin formalaşmasında, xarakterin təşəkkülündə vasitə rolunu oynayır. Uşaq böyüyür, məktəbə gəlir, onun həyatında yeni dövr başlayır. Müəllim də, valideyn də uşağa böyük təsir göstərir. İbtidai təhsil bütün orta təhsilin, hətta bütün təhsil həyatının bünövrəsini təşkil edir. Əgər şagird artıq kiçik yaşlarında ayrı – seçkiliyin şahidi olarsa, bu zaman bünövrə düzgün qurulmaz.

## Ədəbiyyat:

1. Azərbaycan Respublikası Təhsil Qanunu. Bakı, 2009
2. https://www.undp.org/content/dam/azerbaijan/docs/publications/sustainabledevelopment/HDtextbook/5.pdf
3. http://www.e-qanun.az/alpidata/framework/data/18/c_f_18343.htm
4. UNICEF Working Papers. Defining Quality in Education. The International Working Group on Education, Florence, Italy, June 2000
5. https://www.edglossary.org/multicultural-education/

## Multicultural education in a globalizing world

**Summary**

Multicultural education is a set of educational strategies developed to assist teachers when responding to the many issues created by the rapidly changing demographics of their students. It provides students with knowledge about the histories, cultures, and contributions of diverse groups; it assumes that the future society is pluralistic. Multicultural education relates to education and instruction designed for the cultures of several different races in an educational system. This approach to teaching and learning is based upon consensus building, respect, and fostering cultural pluralism within racial societies. Multicultural education acknowledges and incorporates positive racial idiosyncrasies into classroom atmospheres.

## Мультикультурное образование в мире глобализации

**Резюме**

Мультикультурное образование – это статегия образования, направленная на оказание помощи педагогам в решении проблем, возникающих на фоне меняющихся со скоростью демографических данных студентов. Студентам передается информация о истории, культуре и деятельности различных общественных групп, что в свою очередь формирует их представление о плюрализме в обществе. Подобное образование основано на образовательных установках, расчитанных на различные культуры и рассы. Это непосредственно направлено на развитие плюрализма в обществах, где имеются элементы рассизма и подчинения.

**Rəyçi: dos.A.Axundova**

**Hüseynov Səfər Məzahir oğlu**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti

# TƏHSİLDƏ TEXNOLOGİYANIN ROLU

***Açar sözlər:*** *təhsil, inkişaf, texnologiya, İEÖ*
***Key words:*** *education, development, technology, developed countries*
***Ключевые слова:*** *образование, развитие, технология, развитые страны*

Hazırki dövrdə Azərbaycanda texnologiyanın inkişafına və həmin inkişafın təhsilə aid olan bölməsi üzərində təhsil sahəsində tətbiqinə böyük ehtiyyac vardır. İstər yeni dərsliklər sisteminin yaradılması istərsə də təhsil proqramlarının müasir dövrdəki inkişaf prosedurları əsasında hazırlanması Azərbaycan Respublikasının təhsil sistemində yenilik yaradacaqdır. Müasir dövrün texnologiya dövrü olması və həmçinin dünyada baş verən qloballaşma ilə əlaqədar olaraq, Avropa təhsil sisteminə inteqrasiya yeni texnologiya təlimlərinin tətbiqini tələb edir.

Təhsil bir ölkənin iqtisadi, siyasi və sosial inkişafında əsas kök sayılır. Müasir dövrdə ölkəmizdə təhsilin cari vəziyyətindən savayı, təhsilin necə bir formada özünün optimal səviyyəyə çatdırılması müzakirə olunmaqdadır. Əvvəlki dövrlərlə müqayisədə dünyanın bir çox İnkişaf Etmiş Ölkələrində olduğu kimi, Azərbaycan da texnologiyanın inkişafı özünü açıq formada bəyan edir. Komputerlərin və internetin cəmiyyətin istifadəsinə verilməsi ilə bir çox fərqli sahələrdə o cümlədən təhsil sahəsində bir çox rahatlıqlar yaratmışdır.

Kompyuterlər və internet o dərəcədə inkişaf etdi ki, təhsilin o sahədən geridə qalması mümkün deyildi. İnsanların həyatında çox vacib sahəyə çevrilən texnologiya bəlkə də bir daha insanların həyatından çıxmamaq şərti ilə daxil olmuşdur. Texnologiyanın inkişafının təhsil sahəsində tətbiqi ilə "uzaqdan təhsil" xüsusi bir əhəmiyyət qazanmışdır. Bu mərhələlərdən sonra ədəbiyyatda, canlı öyrənmə, senxrion öyrənmə, tədqiqatlı öyrənmə kimi terminlər ortaya çıxmışdır.

## Texnologiyanın əhəmiyyəti

Hər kəsə məlumdur ki, XXI əsr texnologiya ən geniş yayılmış sahədir. Müasir dünyada insanların ən yaxın dostu olan kompyuter texnologiyası, o cümlədən internetin insanlara təsiri ilə bərabər təhsilə, mədəniyyətə və s. təbəqələrə də təsiri danılmazdır. Bu mövzuda fikirlər ikiyə bölünür:

Birinci tərəflər bildirirlər ki, kompyuterin təhsilə xeyrindən çox zərəri vardır. Bu kimi insanlar daha çox Sovet təhsil sistemi dəstəkləyənlərdir. İkinci tərəfdə olan fikirlər isə kompyuterin təhsildə daha çox xeyirli olduğunu düşünürlər. Onların fikrincə kompyuter texnologiyası təhsil sahəsində istifadə edilməyə başladıqdan sonra bir sıra yeni metodlar ortaya çıxmış və dərslərin tədrisinə müsbət təsir etmişdir. Bu fikri irəli sürənlər daha çox Qərb dünyası təhsil sisteminə üstünlük verənlərdir.

Təhsil texnologiyası elə bir sistemdir ki, bu sistem daxilində müasir texnologiyanın tətbiqi təhsilin keyfiyyətini daha da artırır. Təhsil prosesinin icrası və qiymətləndirilməsi, tədris və tədrisin konseptuallaşdırılması həmçinin müasir tədris metodlarının tətbiqi sistematik bir üsuldur. Təhsildə texnologiya təlim materialları, metodlar, iş və əlaqələrin təşkili, yəni bütün iştirakçıların təhsil prosesində davranışlarını özündə cəmləşdirir. Texnologiya sözü "techno" yunan sözündən olub, elmdən, sözdən, öyrənmədən, zehni vəziyyətdən irəli gələn bilik, bacarıq, məlumat, qayda, alətlər və "loqotiplər" deməkdir.

Təhsil sistemində texnologiyanın rolu və yerini müzakirə etmək üçün texnoloji biliklər kifayət deyil. Buna görə də texnologiya dörd anlayışın işığında müzakirə edilir. Bunlar: müxtəliflik, davamlılıq, yenilik və çeşidləmə. Texnoloji yeniliklərin sürətlə artması və iqtisadiyyatda mühüm paya çevrilməsi də təhsilin texnologiyadan istifadəsini məcbur edir. Bununla belə, texnologiyanın sadəcə avadanlıq olaraq tədris mərkəzlərinə daxil olması onun effektiv istifadəsi üçün kifayət deyil. Mühüm olan müəllim, tələbə, ailə və rəhbərliyin texnologiyanı öz məqsədlərinə uyğun istifadə edə bilməsi, təlim-tədris prosesində fayda təmin etmək, özünə yetərli olmaq, məktəb mədəniyyətinə daxil olmaq və növbəti yeniliklər üçün əsas ola bilməkdir.

Yenilik konsepsiyası son illərdə ölkələrin əsas siyasət və strategiyalarında baş verən mühüm konsepsiyalardan biridir. Yeni konsepsiyalardan biri də innovasiyadır. İnnovasiya yenilik tətbiq prosesi kimi bir nəticə verir. İƏİT-ə əsasən, yenilik bir məhsulu, onun xidmətini, yeni və təkmilləşdirilmiş istehsalı, paylama metodunu və ya yeni bir sosial xidmət metodunu dəyişdirməkdir. Lakin eyni söz həmçinin bu transformasiya prosesinin sonunda ortaya çıxan təkmilləşdirilmiş məhsul, metod və ya xidmətə aiddir. Başqa sözlə, yenilik texnologiyanı sosial və ya iqtisadi mənfəətə çevirir.

Bu gün müxtəlif sahələrdə mütəxəssislərin informasiya və kommunikasiya texnologiyaları ilə işləmək və onlardan düzgün istifadə etmək bacarığına çox böyük önəm verilir. Bu isə informasiya və kommunikasiya texnologiyaları (İKT) sahəsində biliklərə yiyələnməyi zəruri edir. Bunun ən yaxşı yolu orta məktəbdən başlamaq lazımdır. Orta məktəbdən İnformasiya və kommunikasiya texnologiyaları –(İKT)-nin tədrisini başlamaq, bu biliyə mükəmməl yiyələnməyin ən yaxşı yolu hesab edilə bilər.

Universitetlər informasiya istehsal edən, qoruyan, genişləndirən və bu məlumatların tətbiqindən geniş istifadə edən qurumlar olaraq cəmiyyətdə çox mühüm rol oynayırlar. Bu mənada ali təhsil müəssisələrinin baş verən bu sürətli dəyişikliklərdən xəbərdar olması da, təlim-tərbiyə keyfiyyətinin yüksəlməsi üçün lazım olmuşdur. Universitetlərin təlim-tədris fəaliyyətlərində texnologiyadan istifadə etmə və inkişafda nümunə olmaları, insanların yeni texnologiyalara uyğunluğu informasiya çağı cəmiyyətinin yaradılması üçün əhəmiyyətlidir. Müasir cəmiyyətlərdə informasiya texnologiyalarındakı vasitələri məharətlə işlədən, məlumat toplama, şərh etmə və bu məlumatları istifadə etmək bacarığı olan, müvafiq informasiya texnologiyaları resurslarından istifadə edərək iş görə bilən fərdlər yetişdirmək qarşıda duran mühüm vəzifələrdən biri olmuşdur.

Təhsildə texnologiyaların istifadəsinin fərziyyələri və qiymətləndirilməsi

Təhsildə texnologiyaların istifadəsinə nəzər saldıqda ilk öncə texnologiyanın istehsal edildiyi ölkələrdə başlıca olaraq təhsildə istifadə edildiyi faktı çıxır. ABŞ başda olmaq üzrə müxtəlif texnologiya istehsalçıları olan ölkələr texnoloji prosesləri təhsildə geniş istifadə edirlər.

Təhsildə texnologiya istismarın müxtəlif mərhələləri aşağıdakı kimidir:

- I və II Dünya Müharibələrində hərbi məqsədli filmlərlə təhsildə vizual material istifadə edilmişdir.
- 1950-ci illərdə təhsil məqsədli televiziya istifadə edilməyə başlamış və universitetlərdə vizual-audio texnologiya bölməsi yaradılmağa başlamışdır.
- 1950-1960-ci illər intervalında ABŞ-da Ford Fondu televiziya vasitəsi ilə təhsilə dəstək vermişdir.
- 1967-ci ildə Amerika Tədqiqat İnstitutu "Ehtiyaca Görə Öyrənmə" adı verilən fərdi maarifləndirici proqramlar inkişaf etdirmişdir.

Texnologiya istifadəsi təhsili xarakterli hala gətirir. Keyfiyyətli təhsil üçün texnologiya olduqca vacibdir. Texnologiya istifadəsi təhsildə bərabərlik təmin edilməsinə kömək olacaqdır. Çünki eyni məzmuna malik proqram hər bir tələbəyə qüsursuz bir şəkildə çatdırılacaqdır.

Texnoloji imkanları yetərsiz olan bir məktəbə görə bu imkanlara malik məktəbin təhsil imkanları fərqli olacaqdır. Bu da bərabərlik təmin etməsi bir yana başlı başına bərabərsizlik istehsal edən bir mövqeyə uyğun gətirəcəkdir. Varlı və yoxsul məktəblərin də texnologiyaya çatmaq şansları bir-birindən fərqli olacağına görə bu hal təhsildə bir neçə quruluşa səbəb olacaqdır.

Texnologiya istifadəsi ilə təhsildə sonsuz bir kitabxanaya addım atılır və öyrənmə vasitələri günü-gündən zənginləşir. Əslində burada ortaya atılan sonsuzluq düşüncəsi mövcud tədris proqramı ilə müqayisə edildikdə şagird və müəllimlərdə sonsuz informasiya ilə qarşı-qarşıya olmaq qorxusunu da bərabərində gətirir. Mövcud proqram sıxlığı səbəbiylə tənqid edilərkən bir tərəfdən də bu sıxlığı daha da başa düşülməyən hala gətirəcək sonsuzluq hissi yaradılması təhsildə fərz edilən inkişafa kömək edəcək kimi görünmür. Burada internet ilə birlikdə istənilməz biliklərin də prosesə qatılması və bu məlumatların nəzarətinin demək olar ki, qeyri-mümkün olması da bir problem kimi qarşımıza çıxır.

Müəllimlərin verdikləri fundamental biliklər, təkcə pedaqogika və psixologiya sahəsində deyil, həm də yeni texnologiyalardan müvəffəqiyyətlə istifadə etdikdə təhsil prosesini xeyli sadələşdirir, onu dinamik və çevik edir. "Müəllim-şagird-dərslik" tədris modelinə kompüterin də əlavə edilməsi tədris prosesini fərdi proqram üzrə təşkil etməyə, uşağın dərsə marağını stimullaşdırmağa imkan verir. Kompüterlə aparılan dərslər uşaqlar üçün çox cəlbedici və yaddaqalan olur. Multimediya vasitələri, avtomatlaşdırılmış öyrədici sistemlər, kompüter tədris proqramları, animasiya, qrafika, rəngarəng illüstrasiyalar şagirdlərin idrak aktivliyinə müsbət təsir göstərir və olimpiadalarda, müxtəlif intellektual yarışmalarda nəticələri xeyli yüksəldir.

Texnoloji yeniliklərdən istifadənin artırılması təhsil sisteminin məqsədlərini reallaşdıracaq davranışlar hasil edəcəkdir. İnnovasiyalardan istifadənin artırılması bu davranışlardan başqa nəticələr də verəcəkdir ki, bunlardan birincisi onsuz da illərdir təhsilə çətinlik verən obyekt və avadanlıqlar üçün ehtiyat axtarışında olacaqdır. Məktəblər bu prosesdə məcbur qalaraq dövlət maliyyələşdirilməsi olmayan yeni yollara əl atıb vəsait axtaracaqdır. Bunlarla yanaşı, təhsilin ticarətləşməsi və gəlir fərqinin yaranacağı təchizat tarazlığı da qarşımıza çıxacaq.

Texnologiyanın təhsildə geniş istifadə edilməsi ilə hər istənilənin texnologiya tərəfindən qarşılanacağı xətasının tərəfdar tapması insanlarda tənqidi düşünmə qabiliyyətlərinin tükənməsinə səbəb olur. Hər istənilən

məlumatın olduğu, içində hər şeyin var olduğuna dair fikirlərin günü-gündən gücləndiyi internet faktının bunun kimi nəticələr hasil edəcək olması heç də təəccüblü deyil.

Texnologiya dəstəkli cəld öyrənmə modelinin üstünlükləri

Modelin verdiyi mühüm dəyişikliklərdən və üstünlüklərdən biri öyrənmə prosesinin fərdiləşdirilməsidir. İnternet mühitdə təqdim olunan video kimi məzmunlar sayəsində təhsil prosesində elastiklik təmin etməklə, tələbələr öz öyrənmə, stil və sürətlərinə uyğun olaraq verilən məzmunu öyrənir. Bu baxımdan tələbə fənn məzmunları ilə bağlı video materialları izləyərkən öz sürətinə uyğun şəkildə nizamlama edə, başa düşmədiyi vaxt geriyə qayıda, yaxşı bildiyi bir məsələdə isə videoya sürətli baxa, anlamadığı bir nöqtə varsa lazımlı yeri saxlayıb daha sonra müzakirə edə bilər. Bu yolla öyrənmə prosesində öyrənən insanların xüsusiyyətlərinə uyğun elastiklik təmin olunur.

İnternet istifadəsinin genişlənməsi bəzi mübahisələri də bərabərində gətirmişdir.

Günümüzdə internet istismarın müsbət və mənfi cəhətləri ilə bağlı bir çox məqam, mübahisə vardır. Bu məsələlərdən biri də internet, xüsusilə də sosial media istifadəsinin, insanlararası əlaqəyə mənfi təsir etməsi və fərdlər arası qarşılıqlı təsirin azalmasıdır. Bu vəziyyət öyrənmə prosesinə "online" bir ölçü iştirak edən Texnologiya Dəstəkli Öyrənmə modeli ilə yaxından əlaqəli bir məsələdir. Bu nöqteyi nəzərdən fənn məzmunlarının video kimi vasitələrlə virtual mühitə köçməsinin insanlar arasındakı qarşılıqlı təsiri azaldacağı, tələbələrin sosiallaşma prosesinə mənfi təsirlər edə biləcəyi fikrini ortaya qoyur.

Texnologiya dəstəkli cəld öyrənmək metodunun effektivliyini göstərən bir çox işin yanında modelin təsirli olmadığını ortaya qoyan fikirlər də var. Digər tərəfdən, bəzi pedaqoqlara görə isə modelin əsasında da ənənəvi yanaşmada olduğu kimi, didaktik və fənn yönümlü bir məntiq var. Bu baxımdan bu öyrənmə modelini yalnız "pisin yaxşısı" hesab etmək olar.

Təhsildə texnologiyaların istifadəsinə dair təkliflər

- Təhsildə texnologiyanın istifadə edilib edilməyəcəyi deyil, necə istifadə ediləcəyi, təmin olunacağı, bölüşdürüləcəyi problemi üzərində durulmalıdır.
- Texnologiyanın fərdi deyil, fərdin texnologiya yönəltməsi vacibliyi nəzərə alınmalıdır. Xüsusilə dərs içərisində müəllimləri çox məşğul edən və vaxtını məhdudlaşdıran texnoloji materialların istifadə edilməsində lazımi tədbirlər alınmalıdır.
- Texnologiyanın nəzarət edilə bilən olması üçün milli tətbiqlər qoymalı və sistemli bir şəkildə tətbiqlərə əməl edilməlidir.
- Texnologiya istifadədə təhsil imkanlarından daha az istifadə edənlərə müsbət ayrıseçkilik keçiriləcək şəkildə siyasətlər aparılmalıdır.
- Təhsildə texnologiyadan istifadə edərkən ortaya çıxan xərcin mənbə problemi də düşünülərək qarşısının alınması lazımdır. Xüsusilə xarici mənbələrə üz tutaraq həm vaxt, həm də əmək göstərən məktəb rəhbərliklərinin problemləri bu yolla həll olunmalıdır.
- İstifadə edilən texnologiyada ictimai üstünlüklərə uyğun istehsal və satma təmin olunması lazımdır. Bu yolla texnologiya istifadə edilərkən təhsil sistemində tələbələr və cəmiyyət üçün də bir məna olacaqdır.

**Nəticə**

İctimai inkişafda bilik mühüm göstəricidir. İnformasiya əldə etməyin və istifadə etməyin yolu isə informasiya və kommunikasiya texnologiyalarının səmərəli şəkildə istifadə edilməsindən keçir. Bunun üçün də informasiya texnologiyalarını araşdırıb, inkişaf etdirən, istehsal edən və istifadə edən bir cəmiyyət, yəni informasiya cəmiyyəti olmaq lazımdır. İnformasiya cəmiyyəti olmağın yolu da təhsildən keçir. İctimai dəyişmə və inkişaf etmələri həm başlayan həm də istiqamətləndirən bir qurum kimi təhsil müəssisələri texnoloji prosesləri izləmək, bu texnologiyaları istifadə etmək və texnologiyaların istifadəsini öyrətmək məcburiyyətindədirlər.

Məktəblərdə verilən təhsilin yaxşılaşdırılması və inkişaf etdirilməsi səylərində müəllimin rolu və məsulliyəti olduqca vacibdir. Cəmiyyətin dirçəlməsində mühüm amillərdən biri olan inkişaf etmiş insan kapitalına qovuşmağın yolunun yaxşı məktəblərdə mümkün olduğunu düşündükdə, müəllimlər tərəfindən verilən təhsilin keyfiyyətli olmasının əhəmiyyəti daha yaxşı aydın olur. Müəllimlərin texnologiya səlahiyyətləri onların təqdimat xidməti keyfiyyətinə birbaşa təsir göstərir. Texnologiyanın məhsuldar bir formada istifadəsinin təmin olunması prosesində də ilk növbədə müəllimlər texnoloji biliklə təmin olunmalı və qazandıqları bacarıqları tətbiq edəcəkləri uyğun mühitlər təqdim olunmalıdır. Bu məqsədi həyata keçirərkən, cəmiyyətdə baş verən bu sürətli dəyişiklik prosesində büdrəmədən inkişaf etməsi üçün müəllimə "texniki işlər, tədris planı, material inkişaf etdirmək" və s. kimi məsələlərdə dəstək olunmalıdır. Üstəlik, bu dəstək davamlı olaraq təmin olunmalıdır ki, müəllim özünü həm fərdi olaraq, həm də peşəkar baxımdan

inkişaf etdirsin. Çünki müəllim işində təsirli və səmərəli olduğu zaman hər kəs qazanclı çıxar, təbii ki, ən çox da tələbələr.

**Ədəbiyyat:**

1. Akpınar.Y., "Öğretmenlerin yeni bilgi teknolojileri kullanımında yüksek öğretimin etkisi" The Turkish Online Journal of Educational Technology, 2003, sayfa 11.
2. Aksoy, H. Hüseyin, "Eğitim Kurumlarında Teknoloji Kullanımı ve Etkilerine İlişkin Bir Çözümleme", Eğitim Bilim Toplum. Güz 2003, sayfa 4-23.
3. Aleksinac Serbia, International Journal of Cognitive Research in Science, Engineering and Education Vol. 3, No.1, 2015, page 111.
4. Johnson, G.B."Student Perceptions of the Flipped Classroom." Yayınlanmamış yüksek lisans tezi, The University of British Columbia, 2013
5. Prof. Dr. Süleyman Sadi Seferoğlu, "Okullarda Teknoloji Kullanımı ve Uygulamalar: Gözlemler, Sorunlar ve Çözüm Önerileri", Hacettepe Üniversitesi, 9 Nisan 2015, sayfa 123.

**The role of technology in education**

**Summary**

All planned education-related activities are used to achieve certain goals. There are different ideologies about education goals. They can change according to the time, society and the ethnicity of the peoples. At the same time, the main requirement of the modern era is the development of new technology and, most importantly, its application. The development of advanced technology, as well as in many areas, shows its dynamics in the field of education. Thus, in comparison to former century, in вthe twentieth century, many innovations in the field of education have been discovered and confirmed. The role of the introduction of new technologies in the development of human capital in education centers is very significant.

**Роль технологии в образовании**

**Резюме**

Все запланированные образовательные мероприятия используются для достижения определенных целей. Существуют разные идеологии в отношении целей образования. Они могут меняться в зависимости от времени,общества и этнической принадлежности народов. В то же время, основным требованием современной эпохи является разработка новых технологий и, самое главное, их применение. Развитие передовых технологий, как и во многих областях, показывает их динамику в сфере образования. Таким образом, по сравнению с прошлым столетием, в двадцатом веке многие инновации в области образования были обнаружены и подтверждены. Роль внедрения новых технологий в развитие человеческого капитала в образовательных центрах очень значительна.

**Rəyçi: dos. A.Cəbiyeva**

**İsgəndərova Südabə Nəsrəddin qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# TƏTBİQİ TƏDQİQAT İNKLÜZİV TƏHSİL MODELİ KİMİ

***Açar sözlər:*** *inklüziv təhsil, tətbiqi tədqiqat, təcrübəyə əsaslanan öyrənmə, reflektiv bacarıq*
***Key words:*** *inclusive education, application of research activities, method of teaching based on practice, reflective skills*
***Ключевые слова:*** *инклюзивное образование, прикладная исследования, обучение на основе опыта, навыки рефлексии*

İnklüziv komponentli siniflərdə salamlıq imkanları məhdud uşaqların təlim prosesindən kənarda qalmaması üçün müəllimin tədris prosesinə yeni istiqamətdə yanaşması vacibdir. Müəllim dərs prosesində problemlə qarşılaşarkən nə edəcəyi haqqındada düşünməli, situasiyanı təhlil etməli, digər müəllimlərin oxşar problemlər zamanı necə addım atdıqlarını öyrənməli, dəyərləndirməli, müxtəlif yanaşmaları tətbiq etməyi bacarmalıdır. 1970-ci illərdən başlayaraq təhsildə müəllim-tədqiqatçı və elmi işçi- müəllim arasında əməkdaşlığa əsaslanan təcrübi tədqiqat modeli geniş tətbiq olunmağa başlamışdır. Təcrübi tədqiqat müəllimlərə öz təlim praktikalarını başa düşməyə və onu təkmilləşdirməyə imkan verir. Təcrübi tədqiqat məhz təcrübəçi tərəfindən həyata keçirildiyinə görə ona tətbiqi tədqiqat da deyilir.

Tətbiqi tədqiqat haqqında bir sıra mütəxəssislər müxtəlif fikirlər söyləmişlər. Parsons və Braun özlərinin “Müəllim reflektiv təcrübəçi və tətbiqi tədqiqatçı kimi” (2002) adlı kitablarında tədbiqi tədqiqata belə tərif vermişlər: “Tətbiqi tədqiqat sinifdə üzləşdikləri problemləri həll etmək və peşəkar təcrübələrini artırmaq məqsədilə müəllimlər tərəfindən hazırlanmış araşdırma formasıdır. Tədqiqatın bu növü tətbiqi tədqiqatçı tərəfindən refleksiya, qərar vermə və eləcə də daha keyfiyyətli dərs metodlarının hazırlanması məqsədilə müntəzəm istifadə olunan müşahidələr və məlumatın toplanmasıdır.”

Kristin Miller (2007) -ə görə, “tətbiqi tədqiqat tədris prosesinin təbii bir hissəsidir. Müəllimlər şagirdlərin qavramasını, eləcə də sinif və məktəb mühitini inkişaf etdirmək məqsədilə davamlı olaraq şagirdlərə nəzarət edir, məlumat toplayır və istifadə etdikləri metodlarda lazımı dəyişikliklər edirlər. Tətbiqi tədqiqat şagirdlərin necə, niyə və nə vaxt daha yaxşı öyrənməsini anlamaq üçün müəllimlərin enerjisini düzgün istiqamətə yönəldən bələdçidir.”

Pineyə görə tətbiqi tədqiqata cəlb olunmuş tədris işçiləri yeni ideyalara açıq olurlar və vəziyyətə daha tez uyğunlaşırlar ( 1981).

Tətbiqi tədqiqat şagirdlərin və müəllimlərin öyrənmə prosesinə müxtəlif yolla kömək etmək məqsədilə istifadə oluna bilən tədris, öyrənmə və qərar vermə prosesidir (Kemmis, 1981; Stenhouse, 1975). Tətbiqi tədqiqat şagirdin müvəfəqqiyyətini və o cümlədən, məktəb idarəçiliyini inkişaf etdirmək üçün bir metoddur (Kohen & Manion, 1980; Elliot, 1991). Little (1981) tərəfindən aparılan araşdırmalarda tətbiqi tədqiqatın əməkdaşlıq, ünsiyyət və şəbəkələşməyə müsbət təsir etdiyini görmək olar.

Deməli, tətbiqi tədqiqat öz fəaliyyətini nəzərdən keçirməyin praktiki üsuluna dair bir yanaşmadır. Bu tədqiqat növü öz fəaliyyətin barədə düşünmək və onun üzərində refleksiya tələb etdiyindən, tətbiqi tədqiqatı həmçinin reflektiv tədris də adlandırmaq mümkündür. Reflektiv tədris zamanı müəllim yeni ideyalar və anlayışlar yaradaraq tədris praktikasını zənginləşdirir, innovativ düşünmə şəraiti yaradır. Bunun üçün müəllim şagirdlə öz arasında düzgün münasibət yaratmağı, problemin həlli üçün öz fərziyyələrini yoxlamağı, şagirdin düşüncələrini nəzərə almağı bacarmalıdır. Belə düşünərək öyrətmə zamanı müəllim sanki tədqiqat aparır. Bu tədqiqat biliyin yaranması ilə nəticələnən elmi araşdırmalara əsaslanmalıdır [ 1 ; 25-73].

Müəllim tətbiqi tədqiqatla bağlı bir sıra səriştələrə malik olmalıdır. Tətbiqi tədqiqat sorğu, refleksiya və dialoq tələb edən peşəkar inkişaf modelidir. Tətbiqi tədqiqatın əsas ideyası ondan ibarətdir ki, təhsildə bu və ya digər məsələlərin müəyyən olunması və həll edilməsi məhz tədris prosesində həyata keçirildiyi zaman daha səmərəli olur. Tədqiqatı mövcud tədris mühitinə daxil etmək, eləcə də bu mühitdə olan iştirakçıları tədqiqat işlərinə cəlb etməklə, problemlərin daha tez həlli və nəticələrin dərhal tətbiq olunmasına nail olmaq mümkündür. Tətbiqi tədqiqat müəllimlərə yeni bacarıqlar aşılayır, onların analitik qabiliyyətlərini gücləndirir. Araşdırma layihələri çərçivəsində müəllim öz bacarıqlarını inkişaf etdirməklə yanaşı, digər həmkarları ilə ünsiyyətə girmək və təcrübələrini bölüşmək imkanı qazanır. Tədbiqi tədqiqat vasitəsilə müəllimlər həm özləri, həm şagirdləri, həm də həmkarları haqqında öyrənir və davamlı inkişaf üçün yollar axtarırlar. O, müəllimlərə öz işlərinin keyfiyyətini qiymətləndirmək üçün meyarlar, standartlar müəyyənləşdirməyə imkan yaradır. Müəllimlər daim yenilikləri öyrənib, tətbiq etməyə can atır və bu da öz növbəsində şagirdlərin dərslərində müvəfəqqiyyət əldə etmələrinə kömək edir.

Komanda şəklində işləyən müəllimlərdə peşəkar münasibətlərin formalaşmasına imkan yaranır. Tətbiqi tədqiqat məktəb və ya məktəəbəqədər təhsil səviyyəsində aparıldığı zaman bölmələr, fənnlər, siniflər və müəssisələr arası əməkdaşlıq da inkişaf etmiş olur. Beləliklə, təhsildə tətbiqi tədqiqat modelinin aşağıdakı müsbət xüsusiyyətlərini müşahidə etmək olar:

1. Tətbiqi tədqiqat layihələri məktəbdə hər hansı dəyişiklik, yenilik etmək üçün ən əlverişli vasitələrdən biridir. Bu da müəllimin peşəkar inkişafına yardım edir.
2. Müəllimlər tətbiqi tədqiqata cəlb olunduqları zaman, təkcə öz siniflərinə aid deyil, həmçinin məktəbə aid problemlərə də daha yaxından diqqət yetirməyə başlayırlar. Bu da müəllimlər arasında əməkdaşlığı inkişaf etdirir.
3. Tətbiqi tədqiqat özünün və həmkarlarının işlərini refleksiya etmək, təhsil sahəsinə yeni yanaşmalar və dəyişikliklərin gətirilməsi imkanı yaradır.
4. Tətbiqi tədqiqat real şəraitdə problemin həllinə yönəlir. Bu zaman praktik problemlərin müəyyənləşdirilməsinə və onların həllinin axtarılmasına çalışılır. Bu da mövcud problemləri həll etmə imkanı yaradır.

Tətbiqi tədqiqat modeli şagirdin təcrübə əsasında öyrənməsinə əsaslanır. Kurikuluma görə tədris prosesində tətbiqi tövsiyə olunan təlim metodları içərisində açıq fəza, akvarium, alqoritm, beyin həmləsi, beynəlxalq kafe, debat, dəyirmi masa, diskussiya, disput, konkret halların təhlili, kiçik qruplarda iş, mövzuların qabaqcadan sərbəst öyrənilməsi, problemin öyrənilməsi, qərarlar ağacı, rollar və işgüzar oyunlar, sual-cavab, tənqidi düşüncənin inkişafı metodları ilə bərabər təcrübə əsasında öyrənmə metodu da xüsusi yer tutur. Təcrübə əsasında öyrənmə - dərk edilməyərək başlanan öyrənmədir. Belə öyrənmə şagirdlərin şəxsi təcrübəsinin öyrənilən predmetlə əlaqələndirilməsi hesabına dərketmə fəaliyyətinin aktivləşdirilməsidir və tsikli xarakter daşıyır. Optimal öyrənmə o zaman yaranır ki, şagirddə sərbəst hərəkət etmək imkanı yaranmış olsun. Fəaliyyət zamanı şagirdlərin etdikləri oxuduqlarına, eşitdiklərinə və gördüklərinə nisbətən daha çox yadda qalır. Sağlamlıq imkanları məhdud uşaqların dərketməsinin çox aşağı səviyyədə olduğunu nəzərə alsaq fəaliyyətdə yerinə yetirdikləri hərəkətlər onları həm motivasiya edir, həm də əməlləri yerinə yetirərkən bu, analiz-sintez prosesinə təkan verir. Nəticədə sağlamlıq imkanları məhdud uşaqlarda potensial imkanına görə müəyyən səviyyədə dərketmə baş verir. Təcrübə əsasında öyrənmənin dörd tsiklik fazası vardır:

1. Təcrübə fəaliyyətdə hərəkət vasitəsi ilə əldə edilir.

2.Təcrübənin mənimsənilməsi və təsvir edilməsi, yəni refleksiyası keçmiş hadisələrin, hərəkətlərin təhlili və qiymətləndirilməsi ilə əldə edilir. Eyni zamanda fəaliyyət prosesində olan səhvlər və nümunələr əsasında öyrənmə baş verir.

3. Bilik və bacarıq təcrübə əsasında çıxarılan nəticə, onun təhlili və təsviri vasitəsi ilə dərk edilir. Bu mərhələdə təəssüratların təcrübədən qaydalara, hipotezlərə, modellərə, nəzəriyyəyə keçirilməsi baş verir.

4. Yeni ideyaların eksperimentlərdə yoxlanılması, yəni hərəkət üsullarının yeni vəziyyətdə sınanması təcrübə əsasında öyrənmənin sonuncu mərhələdir. Bu zaman tətbiqlə əlaqədar yeni qərarlar qəbul edilir.

Təcrübə əsasında öyrənmə təlim metodu pedaqoqdan yüksək peşəkarlıq tələb edir. Müəllimin təlim-tədris prosesini düzgün qiymətləndirməsi üçün aşağıdakı reflektiv bacarıqları olmalıdır:

1. şagirdin təlim problemlərini müxtəlif yollarla həll etmə bacarığı;
2. problemin müxtəlif həlli yollarını modelləşdirmək bacarığı;
3. problemin həlli zamanı meydana çıxacaq ziddiyyətləri əvvəlcədən intiutiv hissetmə bacarığı;
4. problemi düzgün təhlil edib daha əlverişli yolların seçilməsi;
5. problemin həlli ilə yanaşı eyni zamanda səhvləri görmək və aradan qaldırmaq bacarığı;
6. öz fəaliyyətini təhlil etmək bacarığı:
   a) Müəllim tədris fəaliyyətinə daxil olan şəxsi davranışını təhlil edir;
   b) Müəllim öz davranışının səbəbini axtararaq eyni zamanda müvəffəqiyyət və səhvlərini də təhlil etmiş olur;
   c) Əvvəlki məlumatları ümumiləşdirir, təhlil və sintez edir. Buna əsasən özünün gələcək tədris fəaliyyətini qurur;
7. “Mən konsepsiyası” baxımından özünü analiz etmə bacarığı [2; 37-83].

Beləliklə, inklüziv təhsildə tətbiqi tədqiqat modeli və bu modelə uyğun olaraq təcrübə əsasında öyrənmə metodunun tətbiqi sağlamlıq imkanları məhdud şagirdlərin tipik inkişaf etmiş şagirdlərlə birgə təhsilini həyata keçirməyə imkan verəcək.

**Ədəbiyyat:**

1. Andrew Pollard. Reflective teaching in the primary school : a handbook for the classroom. London ; New York : Continuum, 2001. -442.
2. O.C.Сазонова.Дис:Формирование рефлексивных умений в процессе профессиональной подготовки педагогов–психологов.Чебокс:2006,216 с.
3. N.T.Hüseynova "İnklüziv təhsil", Bakı-2014
4. İnklüziv Təhsil / Z.Sayadova, M.Rəhimovanın redaktəsi ilə. Bakı: İndiqo, 2010, 181s.
5. Daniel E.R. Stafford K. Xüsusi hazırlıq siniflərinin təşkili / Addım-addım uşaqlar və alilələr ücün proqram. Bakı: Mütərcim, 2001, 245s.
6. Kiçik məktəb yaşlı uşaqların təhsili sahəsində tətbiqi tədqiqatlar: Müasir tendensiya və metodlar / Açıq Cəmiyyət İnstutu-Yardım Fondu. Bakı: Yeni Nəsil, 2003, 98s.

**Application of research activities as the inclusive education model**

**Summary**

For effective training of students with limited health, all problems in the educational process must be solved in class. Currently, the research application model is widely used in inclusive education. According to this model, the teacher must have reflective skills. The teacher should be able to control the perception and behavior of students. At the same time, teachers work together and try to solve problems together. A widely used method of teaching in the application of research activities is a method of teaching based on practice. At this stage, students take experience in the activity. At the same time, they learn from mistakes and examples in the course of action.

**Применение исследовательской деятельности как модель инклюзивного образования**

**Резюме**

Для эффективного обучения учеников с ограниченными возможностями здоровья, все проблемы в учебном процессе должны быть решены на уроке. В настоящее время модель исследовательской деятельности широко используется в инклюзивном образовании. Согласно этой модели, учитель должен иметь умение рефлексировать. Учитель должен контролировать восприятие и поведение учащихся. В то же время учителя сотрудничают друг с другом и пытаются решать проблемы вместе. Основанный на практике это метод-метод обучения в применение исследовательской деятельности широко используется в инклюзивном образование. Именно в процессе деятельности ученики на основе практических ошибок и примеров учатся осваевать знание и умение.

**Rəyci: dos. S.R.Aslanova**

Bu növdə olan tapşırıqların digər əsas əhəmiyyəti ondan ibarətdir ki, onlar tələbələrə cümlə qurmağı öyrədir. Tələbələr bir çox terminoloji sözlərin mənasını heç öz ana dilində də bilmirlər, və yaxud bilsələr də onları izah etməkdən ötrü cümləni qura bilmirlər. Hələ nəinki termin, hətta adi gündəlik məişətdə işlənən sözləri belə cümlədə işlədə bilmir, və yaxud öz fikirlərini doğru-düzgün formada çatdıra bilmirlər. Bəzi deməzdim, bir çox tələbələr nəinki xarici dildə, hətta öz ana dilində cümlə qura bilmirlər. Bunu tələbəyə öyrətmək müəllimin qarşısında duran mühüm vəzifələrdən biridir.

Başqa bir tapşırığın şərtinə əsasən tələbələr yeni leksik materialın söz və ifadələrini cümlələrdə və müxtəlif situasiyalarda işlətməlidirlər. Çünki söz özünün əsas mənasını cümlədə nümayiş etdirir. Bu çalışma da fikrin formalaşması və cümlədə müvafiq söz sırasına uyğun olaraq cümlə üzvlərinin düzgün sıralanması baxımından çox əhəmiyyətli və faydalıdır. Yuxarıda qeyd etdiyimiz kimi, tələbələr cümlə qurmaqda çox çətinlik çəkirlər. Onların bir çoxunun kifayət qədər söz ehtiyyatı var. Lakin onlar həmin sözlərin sıralanmasında bir çox problemlərlə üzləşirlər. Baxmayaraq ki, hələ orta məktəbdə xarici dil dərslərinin ilkin mərhələsində cümlədə söz sırası tədris olunur, ana dilindən xarici dilə tərcümə edərkən tələbələr adətən heç fikirləşmədən cümləni bildikləri sözlə başlayırlar. Cümlə qurarkən tələbələri cümlədə sözlərin düzgün sıralanmasına alışdırmaq da müəllimin qarşısında duran digər mühüm vəzifədir.

Əlbəttə ki, xarici dildən ana dilinə tərcümə zamanı həmçinin müəyyən problemlər üzə çıxır. Hər hansı dili qavramaq üçün ilk növbədə cümlə daxilindəki sözləri bilmək lazımdır. Sözlər üç əsas istiqamətdə qavranılır: görülən, eşidilən və tələffüz olunan formada. Nəticədə ümumiləşmiş şəkildə tərcümə alınır.

Ümumiyyətlə leksik material müəyyən terminologiyanı bütövlükdə əhatə etməlidir. Tədrisin birinci mərhələsində məişətlə bağlı leksika, xüsusi işlək sözlər tədris olunur: *everyday objects, food and drink, jobs, leisure activities, household goods, countries and languages, relationships, shops and shopping, city and country nouns and adjectives, clothes, feelings etc.*

Daha yuxarı mərhələlərdə ali məktəbin spesifikasına uyğun olaraq terminologiyanı tədris etmək zəruridir. Məsələn, incəsənət təmyüllü ali məktəblərdə aşağıdakı terminologiyanın tədrisi məqsədəuyğundur:

- *terms on art (art genres, genre painters, equipment of an artist, works of art according art genres);*
- *cinema (cinema genres, cast, equipment for film production);*
- *theatre (theatrical genres, stage equipment, troupe of the theatre, parts of a literary work);*
- *music (music genres, performers, musical instruments,) etc.*

**Ədəbiyyat:**

1. Wilkins, D.A. Linguistics in Language Teaching. London, 1972
2. Lewis, Michael. The Lexical Approach. 1993

## Work at vocabulary in art schools

**Summary**

The process of teaching any foreign language is hard enough. Students must be taught the work at vocabulary. In order to achieve effective results in learning new lexical material work at vocabulary should be done on the base of certain tasks. First of all new words must be translated by means of the taught language. New words should be fastened by means of questions and answers. Then students can make up sentences using new words. At the beginning level it is taught household vocabulary. Then texts and vocabulary should be chosen according the specialty.

## Работа над словарем в ВУЗах с художественным уклоном

**Резюме**

Процесс преподавания иностранного языка достаточно сложный. Студентов необходимо приучить к работе со словарем. Для того, чтобы добиться эффективных результатов для закрепления нового лексического материала работу со словарем можно проводить на основе определенных заданий. Прежде всего необходимо дать перевод пройденного лексического материала посредством изучаемого, а не родного языка. Закрепление новых слов следует осуществить посредством ответов на вопросы. Студенты могут использовать новые слова в предложениях. На начальном этапе обычно преподается бытовая терминология. Впоследствии тексты и соответствующие слова следует подбирать по профилю.

**Rəyçi: dos. S.S.Əhmədova**

## SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУСТВОВЕДЕНИЕ

**Abbasova Türkan Feyruz qızı**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
turkan.abbasli@mail.ru

# ƏLİ VERDİYEV YARADICILIĞINDA MƏİŞƏT JANRI

***Açar sözlər:*** *rəssam, məişət, janr, əsər, Əli Verdiyev, bədii*
***Key words****: painter, way of life, genre, work, Ali Verdiyev, artistic*
***Ключевые слова:*** *художник, быт, жанр, Али Вердиев, художественный*

Əli Verdiyev yaradıcılığının yüksək bədii-məziyyətini özündə əks etdirən amillərdən biri də çəkdiyi əsərlərin mövzu və janr rəngarəngliyidir. Rəssamın yaradıcılığında yer alan məişət janrlı əsərlərinin də özünəməxsus bədii məziyyətləri vardır.

"Əgər şərti olaraq bu janr öz başlanğıcını neolit dövründəki qaya rəsmlərindən götürüb desək, onda onun bu günə kimi davam edən inkişafını uzun bir dövr hesab etmək olar. Sonradan təsviri sənətin aparıcı janrlarından olmaqla dünyada mövcud olan bütün cərəyanlarda sənətkarların davamlı olaraq tapındıqları bədii-estetik vasitəyə çevrilmişdir. Məişət səhnələrinin bilavasitə insanların gündəlik həyatı ilə sıx bağlı olması onun geniş yayılmasını şərtləndirmişdir. Çoxəsrlik Azərbaycan təsviri sənətində onun ən yaxşı nümunələrini həm qədim miniatürçülər (Sultan Məhəmməd, Məhəmmədi, Mir Seyid Əli və b.), həm də sonrakı dövrlərdə Usta Qənbər Qarabaği, M.Q.İrəvani, A.Hüseyni, B.Kəngərli, Ə.Əzimzadə, M.Abdullayev, V.Səmədova, Ə.Məmmədov, A.Cəfərov, B.Əliyev, N.Əbdürrəhmanov, A.Hacıyev və başqaları yaratmışlar" [1, 56].

Yuxarıda adlarını qeyd etdiyimiz görkəmli Azərbaycan rəssamlarının yaradıcılığında olduğu kimi Əli Verdiyevin də yaradıcılığında məişət mövzusunda yaradılmış kompozisiyalar özünəməxsusluğu ilə seçilir. Onun "Tikiş tikən qadın" (1965), "Bulaq suyu" (1986), "Buza satan" (1996), "Fayton dayanacağı" (1996), "İstanbul" (1996), "Kiçik bazar" (1997), "İstirahət" (1989), "Yatmış Aylin" (2003), "Restoran" (2003), "Park" (2004), "Ayna qarşısında" (1976), "Yeni binanın pəncərəsi" (1994), "Mətbəx" (1997), "Eyvan" (2011) kimi rəngkarlıq və qrafika əsərləri bu qəbildəndir.

Qeyd edək ki, istər mövzuların müxtəlifliyi, onların bədii həlli, istər kompozisiya, bədii forma, milli ənənələrə bağlılıq, istərsə də yaradıcılıq axtarışları nöqteyi-nəzərindən Əli Verdiyevin yaradıcılığı olduqca rəngarəngdir. Rəssamın yaradıcılığında maraq doğuran cəhətlərindən biri də bədii axtarışlarla real həyatın, dövrün, eyni zamanda fantaziya ilə təbiiliyin dəqiq sintezinin üstünlük təşkil etməsidir. Bu cəhət rəssamın bir çox əsərlərində mövzusundan asılı olmayaraq, özünü hər zaman büruzə verir.

**Rəssamın yaradıcılığının erkən dövrünə aid məişət janrlı əsərləri:**

Rəssamın 1965-ci ilə aid qrafik səpkidə bədii həllini tapmış "Tikiş tikən qadın" əsəri onun məişət mövzusunda yaradılmış ilkin əsərlərindəndir. Təkfiqurlu kompozisiyada başını aşağı salaraq nəzərlərini əlində tikdiyinə yönləndirən qadın təsviri öz əksini tapmışdır. Profildən təsvir olunmuş qadının silueti ağ-qara cizgilərin təzadı nəticəsində yaranan işıq-kölgə oyunu ilə olduqca maraqlı baxılır. Belə ki, rəssam burada qrafik icranın bütün potensialını nümayiş etdirməklə, ümumi təsvirin cəlbedici və təsirli alınmasına nail olmuşdur. Təsviri səciyyələndirən ümumi siluetin duyğulandırıcı alınması da, şübhəsiz ki, müəllifin yüksək sənətkarlığının əyani göstəricisidir.

1986-ci ildə yağlı boya ilə çəkilmiş "Bulaq suyu" əsərində bulaqdan su içən azyaşlı oğlan uşağı bədii görüntüyə gətirilmişdir. Olduqca real səpkidə işlənilmiş əsərdə istər yerin fakturası, istər obrazın özü, istərsə də suyun özü, sözün əsl mənasında olduqca təbii baxılır. Realizm ənənələrinə söykənən tabloda "sərt üslub"un da işartılarını görməmək qeyri-mümkündür. Belə ki, əsərin bədii-texniki həllinə diqqətlə fikir versək, yaxıların sərt, eyni zamanda lirik-romantik ovqatda olduğunu müşahidə etmiş olarıq. Əsərin rəng həlli də olduqca sadədir. Azyaşlı uşağın bilavasitə ağ rəngli köynəkdə verilməsi məhz kompozisiyanın işıq mənbəyini xarakterizə edir. 1989-cu ildə çəkilmiş "İstirahət" əsərində otaqda uzanaraq istirahət edən qadın təsviri öz əksini tapıb. Üzərindən tablo asılmış divarın dekorativ – yaşıl fon-yerlikdə ağ nöqtələrlə dekorasiya edilmiş üzlüyü otağın döşəməsində olan milli həndəsi ornamentlərlə bəzədilmiş xovsuz xalça məmulatının bir arada verilməsi interyerin daha rəngarəng baxılmasında vacib rol oynayıb. Tablonu diqqətlə izləsək, rəssamın milli-mənəvi dəyərlərimizə və xalça sənətimizin incəliklərinə böyük ustalıqla bələd olduğunun

şahidi olarıq. Belə ki, kilimin üzərindəki qara, qırmızı, sarı rənglərin hormonik birləşməsi, həssas kontur, sadə perspektiv həlli, eləcə də ornamentlərin ahəngdarlığı, yumşaq ritm – bütün bunlar Əli Verdiyevin bilavasitə milli yaradıcılıq ənənələrindən qaynaqlanmasının açıq göstəricisidir.

Rəssamın "İstirahət" (1989) əsəri ilə yaxınlıq təşkil edən digər istirahət motivli bir əsəri isə "Yatmış Aylin" adlanır. 2003-cü ildə ərsəyə gəlmiş bu kompozisiyada yuxuya qərq olmuş azyaşlı qız – Aylin təsvir olunub. Kompozisiyanın kolorit həlli olduqca maraqlı düşünülüb. Belə ki, çəhrayı, bənövşəyi və firuzəyi rəngin birgə yaratdığı ahəngdarlıq kompozisiyanın tamaşaçıya xoş təəssürat bağışlamasının əsas səbəblərindən biridir.

Əli Verdiyevin yaradıcılığında məişət janrının digər janrlara nisbətən az olmasına baxmayaraq, bu janrda yaradılan əsərlər bədii-məziyyətlərinə görə heç də zəif baxılmır, əksinə öz tamaşaçılarına daha maraqlı və yeni forma-biçimdə təqdim olunur. Elə bu yeni özünüifadəni fərdi yaradıcılıq simasının təravətli qalmağına yönəltməyi bacarmağının nəticəsidir ki, onun ərsəyə gətirdiyi məişət tabloları özünəməxsus bədii tutuma malik olduğunu sərgiləməkdədir.

**Əli Verdiyev yaradıcılığının Türkiyə dövründə məişət janrına müraciəti**

Əli Verdiyevin yaradıcılığında Türkiyənin məişətini özündə əks etdirən bir neçə küçə və bazar həyatı da öz bədii ifadəsini tapmışdır. "İstanbul" (1996) və "Kiçik bazar" (1997) əsərləri bu qəbildəndir.

1996-ci ildə çəkilmiş "İstanbul" əsərində gediş-gəlişi çox olan mərkəzi küçələrdən biri canlandırılıb. Hər dəfə təsvir etdiyi ovqatyaradıcı məqamları ustalıqla rənglərlə ifadə etməyə nail olan Əli Verdiyev özünün Türkiyə səfərindən aldığı təəssüratlarını bu kompozisiyada canlandırıb. Rəssamın izdiham olan məkanda buralar üçün çox səciyyəvi olan və bir qədər də xoş təəssürat oyadan İstanbulküçələrindən birini görüntüyə gətirməsi yəqin ki, təsadüfi deyil. O, buralarda bu cür mənzərələrə tez-tez tuş gəlməyin mümkünlüyünə tamaşaçısını inandırmaq istəyib. Elə İstanbulun izdihamlı küçəsinin günəşli hava ilə qovuşaqda tamaşaçısına xoş ovqat yaşadacağı birmənalıdır. Arxa fonda olan binanın üzərindəki işıq-kölgə effekti, xüsusən günəş şüasının parlaqlığı da bütünlükdə tablonun duyğulandırıcı koloritini şərtləndirmişdir. Bunu da qeyd edək ki, Əli Verdiyev üçün önəmlisi heyrətləndiyi məqamlardakı duyğuları qanadlandırmaq gücünə malik olan rəngli dünyanı başqalarına da aşkarlamaqdır.Bu əsərin kompozisiya və rəng həllinin məkana məntiqli müəllif münasibətindən qaynaqlanması da səbəbsiz deyil. Görünür bu rəssamın Türkiyədə yaşadığı müddət ərzində müşahidə etdiklərinə, xüsusən də onların məişət həyatına biganə qalmadığının göstəricisidir.

Rəssamın "Kiçik bazar" (1997) əsəri Türkiyədəki kiçik bazarlardan birinə bədii tutum verilməsi baxımından maraq doğurur. Ənənəsinə sadiq qalan rəssam bu dəfə də bazarı zaman baxımından günorta vaxtı təqdim etməklə, onun cəlbediciliyinə nail olmuşdur. Kompozisiyanın ön planında xırdavat dolu piştaxta arxasında alıcısını gözləyən gənc satıcı təsvir olunub. Kompozisiyanın mərkəzi hissəsini isə xeyli müştəri kütləsi təşkil edir ki, Əli Verdiyev bu üsulla kompozisiyanın canlılığını əldə etmişdir. Rəssam bir qədər arxa fonda Türkiyə İş Mərkəzi binasını bədii görüntüyə gətirib, ancaq əsas diqqətin mərkəzi plana yönəldildiyi birmənalıdır. Günəş şüalarının yaratdığı işıq-kölgə oyunu tablonun cəlbedici görünməsini şərtləndirir. Bunu şərtləndirən səbəblərdən biri də müəllifin hər bir fiqur üçün ifadəli siluet tapa bilməsidir. Onu da qeyd edək ki, uzun illər ərzində insanların alış-veriş yerinə çevrilən bu kiçik bazarıtəsvir edən rəssam onu daşıdığı tutumuna müvafiq bədiiləşdirməyə çalışıb. 1996-cı ilə aid "Buza satan" məişət tablosunda çiynində səhəng, əlində kiçik su qabı olan və milli türk geyimli buza (darı, mərci və arpadan çəkilən yüngül içki) satan gənc təsvir olunub. Rəssamın Türkiyənin küçə və meydanlarda buza satanlara tez-tez rast gəlinməsi görünür onu bu görüntünü fırçaya almağa həvəsləndirib. Odur ki, zamanın təzadlarla dolu axarında rəssam müşahidə etdiyi bu obraza bədii görkəm verməklə, məişət əsərlərinin daha da zənginləşməsinə nail olmuşdur. Belə ki, burada buza satan gənc oğlan sarı və mavi fon-yerlikdə təsvir olunmuşdur. Çiynində buza dolu qabı gəzdirən satıcının bu cür yerlikdə görünməsini rəssamın fiquru cizgi təzadları ilə təqdim etməsi şərtləndirmişdir.

Əli Verdiyevin Türkiyədə müşahidə etdiyi maraqlı görüntülərdən biri də bir neçə faytonun bir yerdə cəm olmasıdır ki, bu da öz əksini rəssamın 1996-cı ildə çəkilmiş "Fayton dayanacağı" əsərində tapmışdır. Açıq havada gün altında bir araya gətirilən faytonların bədii görüntüsü müəllif tərəfindən uğurlu kompozisiya və rəng həlli ilə gerçəkləşmişdir. Odur ki, tablonun isti rəng çalarlı örtüyünün əsərin yaddaqalan ovqatyaradıcılığının əldə olunmasında mühüm rol oynamasını da qeyd etmək lazımdır.

Yaşadığı dövrün aynasına çevrilmək arzusunda olan yaradıcıların gördüklərini mənalandırmaqda ifadə vasitələri duyulası dərəcədə müxtəlif olmuşdur. Məhz Əli Verdiyevin də bədii görüntüyə gətirdiyi hər hansı hadisə və ya predmet kətan üzərində yağlı boya ilə və yaxud da qrafik səpkidə – bəyaz vərəqdə ağ-qara cizgilərlə özünəməxsus forma-biçimdə təqdim olunmuşdur. Məhz buna görədir ki, onun müxtəlif janr və

mövzulu əsərlərində yaxı-cizgi və rənglərin müxtəlif çalarlarından alınan xoşovqatlı görüntülər birmənalı şəkildə duyğulandırıcıdır.

Əli Verdiyevin yaradıcılığı boyu "sərt üslub"dan qaynaqlanan lirik-romantik ovqatlı məişət janrında yaratdığı əsərlər içərisində məzmun baxımından bir-birinə yaxın olan əsərləri də mövcuddur. "İstirahət" (1989) və "Yatmış Aylin" (2003), "Restoran" (2003), "Park" (2004), əsərləri bu mənada yaddaqalan maraqlı nümunələrdir.

Uğurlu rəng seçimi sayəsində Əli Verdiyevin müxtəlif rənglərin harmonik birləşməsinə üstünlük verdiyini söyləmək yerinə düşərdi. Rəng baxımından demək olar ki, onun əsərləri bir-birilə həmahənglik təşkil eidr. Bəlkə də ona görədir ki, rəssamın müxtəlif janr və mövzulu əsərlərində də ümumi oxşar elementlər mövcuddur. Rəssam öz əsərlərində bədii təsvir vasitələrindən, müxtəlif rəng çalarlarından ustalıqla istifadə edib. Lakin rəssamın bir xüsusiyyətini də qeyd edək ki, Əli Verdiyevin yaradıcılığında kolorit həlli onun rəsmetmə istedadından zəifdir ki, yüksək deyil. Onun rəsmlərinin hər biri bitmiş bir fikri, hər hansı bir ideyanın orijinal həllini, rəsmə daxil edilən əlavə detalların incəliklə işlənməsini göstərir. Bu cür bədii üsul isə rəsmin artıq yükləmədən azad olmasını şərtləndirir.

2003-cü ilə aid olan qarışıq texnikada işlənilmiş "Restoran" əsərində restoranın interyeri bədii görüntüyə gətirilmişdir. Qeyd edək ki, tabloda əksini tapmış hər bir detalın bədii təqdimatında realizmə üstünlük verən rəssam bu dəfə ümumiləşdirici təsvir vasitəsinə üstünlük vermişdir. Bunu məkanda yerləşən bir neçə masa arxasında əyləşən insanların şərti təsvirindən aydın görmək olar. Əsərin şaquli formatda (40x30 sm) olması rəssam üçün interyerdə perspektivin göstərilməsinə daha münasib imkan yaradıb. Ümumilikdə daxili görüntünü işıqlı verən rəssam, yaranmış kölgənin bədii həllində boz rəngin müxtəlif çalarlarından istifadə etmişdir ki, bu da təsvir olunan məkanın daha təbii baxılmasını şərtləndirir.

2004-cü ildə rəssamın ərsəyə gətirdiyi "Park" əsərini də onun məişət janrında yaradılmış tablolar qalereyasına yaddaqalan töhfə saymaq olar. Çoxfiqurlu kompozisiyadan ibarət olan tabloda Əli Verdiyev maraqlı bir istirahət səhnəsi yaratmağa nail olmuşdur. Buradakı görüntünü parkda istirahət edən müxtəlif yaş təbəqəsindən olan insanlar təşkil edir. Kompozisiyanın diqqət çəkən məqamlarından biri də odur ki, burada təsvir olunan surətlərin hər biri məhz qadın obrazlarıdır. Onlardan ikisi ayaq üstə, digərləri isə skamyada əyləşən vəziyyətdə əks olunub. Kompozisiyaya iki azyaşlı uşağın daxil edilməsi isə öz növbəsində əsərin diqqətçəkənliyini səciyyələndirir. Müasir dövrdə Bakı küçələrində oxşar mənzərəyə tez-tez rast gəlinir.

Rəssamın adi məişət həyatını əsərlərinin əsas məna-məzmun daşıyıcısına çevirməsi də ilk növbədə onun incə müşahidə qabiliyyətinə malik olmasının görüntüsüdür. Bu mənada onun müxtəlif illərdə yaratdığı "Ayna qarşısında" (1976), "Yeni binanın pəncərəsi" (1994), "Mətbəx" (1997), "Eyvan" (2011) əsərlərinin adlarını çəkmək olar. Qeyd edək ki, adlarını sadaladığımız bu əsərlərin kompozisiya quruluşunda kifayət qədər oxşarlıqla yanaşı əsərdə öz əksini tapmış müxtəlif yaş təbəqəsinə mənsub olan qadın obrazlarının duruş mövqeyi də demək olar ki, eynilik təşkil edir. Obrazlar tamaşaçıya arxası dönük vəziyyətdə təsvir olunmuşdur. Belə ki, "Ayna qarşısında" (1976) rəngkarlıq tablosunda əsərin adında olduğu kimi ayna qarşısında gözəlliyinə diqqət yetirən, "Yeni binanın pəncərəsi" (1994) əsərində çoxmərtəbəli binanın pəncərəsindən baxan, "Mətbəx" (1997) adlanan tabloda masa üzərində paltar ütüləyən, eləcə də "Eyvan" (2011) əsərində çoxmərtəbəli binanın eyvanından aşağıya doğru baxan qadın obrazı dediklərimizin əyani göstəricisidir. Qeyd edək ki, son iki əsərdə ("Mətbəx" və "Eyvan") rəssam öz həyat yoldaşını bədii görüntüyə gətirmişdir.

## Nəticə

Əli Verdiyev əsərləri ilə hər zaman dövrünün nəbzini tutmağa çalışmışdır. Tez bir zamanda qəliz və mürəkkəb yaradıcılıq problemlərini həll edən, yüksək peşəkarlığa yiyələnən rəssam, bacarıqlı və istedadlı bir sənətkar kimi fasiləsiz fəaliyyəti nəticəsində biri-birindən dəyərli əsərlər yaratmışdı. Hər şeydən öncə, bu əsərlərdə canlı təbii lövhələr, səhnələr, epizodlarla yanaşı, zəngin həyat təcrübəsi toplamış bir rəssamın nəcib hissləri, incə duyğuları və böyük məhəbbəti əks olunmuşdur. Əli Verdiyevin məişətlə bağlı əsərlərinin bədii-estetik və bədii-texniki həllində rəng və cizgi təzadlarına, eləcə də siluet ifadəliliyinə üstünlük verilməsi gözdən qaçmır.

Ümumiyyətlə, Əli Verdiyevin əsərlərinin bədii-estetik və ya bədii-texniki həllində məhz realizm ənənələrinə söykənməsini nəzərə almalı olsaq, o zaman rəssamın yaradıcılığının qədim bədii və milli mənəvi dəyərlərin yeni və özünəməxsus təfsiri olduğunu deyə bilərik. Bilavasitə onun milli mənəvi ənənələrdən yüksək sənətkarlıqla faydalanmasının nəticəsidir ki, rəssamın rənglər və ağ-qara cizgilərlə ifadə olunmuş kompozisiyalarında ənənə və müasirliyin uğurlu nəticəsini müşahidə etmək mümkündür.

Əli Verdiyevin mövzu və janr rəngarəngliyi ilə seçilən qrafik və rəngkarlıq əsərləri duyğulandırıcı zövq qaynağı olmaqla yanaşı, dərin düşüncələrə yol açan əsərlər olduğundan o, çoxdan imzası sərgi ekspozisiyalarında tamaşaçı tərəfindən soraqlanan müəlliflərdəndir.

**Ədəbiyyat:**

1. Əliyev Z., Xəlilov A. Azərbaycan İncəsənəti. 3 cilddə, II-III cild //Bakı: Letterpress, 2011, 200 s.
2. Əsgərova X. XX əsr Azərbaycan boyakarlığının inkişafı // Bakı, 2015. 187 s.
3. Nəcəfov M. Azərbaycan rəngkarlığı bu gün // Bakı, 1985. 36 s.
4. Мочалов Л.В. Образное развитие темы в Советской живописи. // Советская живопись’77. М., Советский художник, 1979, стр.86-98.
5. Мочалов Л.В. Развитие жанров в советской живописи // 1979, Знание, с. 32.

**The genre art in the creativity of Ali Verdiyev**
**Summary**

One of the factors of high artistic merit of Ali Verdiyev's creativity is thematic and genre diversity, reflected in the works created by him.

Despite the fact that in the works of Ali Verdiyev life genre represented less than other genres, works created in this genre, is not considered weak in their artistic nature, and are presented rather in a more interesting and a new form for their audience. Life round paintings created by him is not lost due to the artistic content, because of its ability to maintain freshness in his individual creativity.

The work of Ali Verdiyev also reflected several images of the daily life of Turkish streets and the market.

To the place it would be noted that, due to his ability to successfully select colors, Ali Verdiyev have had created a harmonious combination of different colors.

The transformation of the artist's ordinary everyday life into the main content-semantic subject of his works is, above all, an indicator of his fine observational ability.

**Бытовой жанр в творчестве Али Вердиева**
**Резюме**

Одним из факторов высоких художественных достоинств творчества Али Вердиева, являются тематическое и жанровое разнообразие, отражённые в созданных им произведениях.

Несмотря на то, что в творчестве Али Вердиева бытовой жанр представлен меньше других жанров, произведения, созданные в этом жанре, не считаются слабыми по своему художественному характеру, а скорее представлены в более интересной и новой форме для своей аудитории. Созданные им полотна повседневного быта не потеряли художественного содержания вследствие этой его способности сохранять свежесть в индивидуальном творчестве.

В творчестве Али Вердиева также нашли своё отражение несколько изображений повседневной жизни турецких улиц и рынка.

К месту было бы отметить, что благодаря умению удачно подбирать цвета, Али Вердиев создавал гармоничное сочетание разных цветов.

Превращение обычной бытовой жизни художника в основную содержательно-смысловую тематику его произведений – это, прежде всего, показатель его тонкой наблюдательной способности.

**Rəyçi: dos.A.N.Aslanova**

## JURNALIN İÇİNDƏKİLƏR

**FƏLSƏFƏ PHILOSOPHY ФИЛОСОФИЯ**



**DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ**



**ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES ЛИТЕРАТУРОВЕДЕНИЕ**



**TARİX HISTORY ИСТОРИЯ**

**BEYNƏLXALQ MÜNASIBƏTLƏR INTERNATIONAL RELATIONS**
**МЕЖДУНАРОДНЫЕ ОТНОШЕНИЯ**



**SOSİOLOGİYA SOSİOLOGY СОЦИОЛОГИЯ**



**PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА**



**TƏDRİSİN METODİKASI**
**THE METHODOLOGY OF TEACHING**
**МЕТОДИКА ПРЕПОДОВАНИЯ**

**SƏNƏTŞÜNASLIQ ART CRITICISM ИСКУСТВОВЕДЕНИЕ**